# Müsəlmanlardan şəriətə müxalif olan cahillər üçün ALƏMLƏRİN RƏBBİNİN RƏHMƏTİNİN GENİŞLİYİ dəlilləri, keçmiş və sonrakılardan olan cümhur imamların ittifaqını zikr etməklə dünya və axirətdə əqidə və əməllər üçün üzrün ümumi olmasının bəyanı, məsələdə müxalif olub qarşı çıxanın cahilliyini, yalan və hiyləsini bəyan etməklə onun şübhələrinə rəddiyyə


Müəllif: **Şeyx Seyyid İbn Səduddin Əl-Ğabəşi**

Təsdiq Etmiş Və Nəşrinə İzn Vermişdir: **İmam Abdul Aziz İbn Bəz**

Tərcümə Etdi: **Tural Yusubov**

**Məkkə Ummul-Qura Universitetinin Əqidə Fakultəsinin Tələbəsi**

بسم الله الرحمن الرحيم

إنَّ الحمدَ لله ، نحمدُه ونستعينُه ونستغفرُه، ونعوذُ بالله مِنْ شرورِ أنفسنا ، ومِنْ سيِّئاتِ أعمالنا ، مَن يهده اللهُ فلا مُضلَّ لهُ ، ومَن يُضلل فلا هاديَ لهُ ، وأشهدُ أنْ لا إله إلاَّ اللهُ وحدهُ لا شريكَ لهُ ، وأشهدُ أنَّ محمَّداً عبدُه ورسولُه.

﴿ يا أيُّها الَّذينَ آمنُوا اتَّقُوا اللهَ حقَّ تُقاتِهِ ولاَ تَمُوتُنَّ إلاَّ وأنتُم مُسلِمونَ ﴾ سورة آل عمران : الآية ، ١٠٢.

﴿ يا أيُّها النَّاسُ اتَّقُوا ربَّكُمُ الَّذي خلَقَكُم مِّن نَفْسٍ واحدةٍ وخَلَقَ منْها زوجَها وبثَّ منهُما رجالاً كثيراً ونساءً واتَّقُوا اللهَ الَّذي تَساءلُونَ بهِ والأرْحامَ إنَّ اللهَ كانَ عليكُم رقيباً ﴾ سورة النساء : الآية ، ١.

﴿ يا أيُّها الَّذينَ آمنُوا اتَّقُوا اللهَ وقُولُوا قولاً سديداً ، يُصلحْ لكُمْ أعْمالَكُمْ ويَغفِرْ لكُمْ ذُنُوبكُم ومَن يُطعِ اللهَ ورَسُولَهُ فقَدْ فازَ فوزاً عظِيماً ﴾ سورة الأحزاب : الآية ، ٧١.

أما بعد : فإنَّ أصْدَقَ الحديث كلامُ الله ، وخيرَ الهَدي هَديُ محمَّد – صلَّىٰ الله عليه وعلىٰ آله وسلَّم – وشرَّ الأُمور مُحْدَثاتها وكلَّ مُحْدَثةٍ بدعةٌ ، وكلَّ بدعةٍ ضلالةٌ ، وكلَّ ضلالةٍ في النَّار (*).

(*) هذه الخطبة ؛ تسمَّىٰ : «خطبة الحاجة» وهي تُشرع بين يدي كلِّ حاجة ، والتي كان رسول الله ﷺ يعلِّمها أُصحابه ؛ أن يقولوها بين يدي كلامهم ، في أمور دينهم سواء كان ؛ خطبة نكاح ، أو جمعة أو محاضرة ، أو غير ذلك ، وهي في : «سنن ابن ماجه» و «سنن الترمذي» و «سنن أبي داود» و «سنن النسائي» ، وورد ذكر طرف من هذه الخطبة في : «صحيح مسلم».

## Abdul Aziz İbn Abdullah İbn Bəzdən hörmətli Qardaş Seyyid İbn Səd əd-Din əl-Ğabəşiyə

Əssələmu aleykum va rahmətullahi va bərakətuh. Sizin bizə göndərdiyiniz bu iki risaləyə - "Vəsilənin mənasının bəyanında uca faydalar və qəbirpərəstlərin şübhələrinə rəddiyyə" və "Aləmlərin Rəbbinin rəhmətinin genişliyi" adlı risalələrinizə cavab olaraq: Sizə bildirirəm ki, biz artıq bu iki risaləni oxuduq və gördük ki, bu risalələr aşağıdakı kimidir:

1- Birinci risalə: Siz "Vəsilənin mənasının bəyanında uca faydalar və qəbirpərəstlərin şübhələrinə rəddiyyə" risaləsində təvəssülə, istiğasəyə və qəbirləri ziyarət etmək üçün səfərə çıxmağa aid məsələləri açıqlamış, bu əməli edənlərin şübhələrinə Quran, Sünnə və Sələflərin sözlərindən olan açıq-aydın dəlillərlə rədd vermisiniz.

2- İkinci risalə: "Aləmlərin Rəbbinin rəhmətinin genişliyi" risaləsində isə siz, dini işlərin hər hansı birində müxaliflik edən və bu müxalifliyindən cahil olan kəs barəsində bəhs etmisiniz, belə ki, o kəs günah qazanırmı, yoxsa cahilliyinə görə üzrlü bilinir? Və buna da Quran, Sünnə və ümmətin imamlarının sözləri ilə, Şeyxül-İslam İbn Teymiyyə, tələbəsi İbn Qeyyim və həmçinin Şeyxül-İslam Muhəmməd İbn Abdul Vahhab və onun övladları, nəvələri və tələbələrinin sözləri ilə aydınlıq gətirməklə yanaşı, burada müxaliflərə rədd verərək, onların cahilliyini və insanlara məsələni başqa formada göstərməklə hiylələrini bəyan etmisiniz.

Əvvəldə keçənlərdən aydın olur ki, bu risalələrin hər ikisi öz mövzusunda faydalıdır və bunların çap olunmasına heç bir maneə yoxdur. Bu risalələrin hər ikisi də çox mülayim bir üslubla yazılmışdır. Allahdan istəyirəm ki, Allahın pak dininə ixlaslı xidmətinizdə sizin əməyinizə bərəkət versin. Və Allahdan istəyirəm ki, müsəlmanları və onların əmir sahiblərini Allahın kitabı və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) Sünnəsi

üzərində qorusun və onları buna əməl etməyə müvəffəq etsin. Həqiqətən Allah duaları qəbul edəndir, eşidəndir.

Əssələmu aleykum va rahmətullahi va bərakətuh.

***Elmi bəhslər, fətva və dəvət idarəsinin rəisi***
***Abdul Aziz İbn Abdullah İbn Bəz***
***Hicri 1403/5/8***

# Ön Söz

Həqiqətən həmd yalnız Allaha layiqdir, Ona həmd edir, Ondan kömək və bağışlanma diləyirik. Nəfslərimizin və pis əməllərimizin şərindən Allaha sığınırıq. Allahın hidayət etdiyini azdıran və azdırdığını hidayət edən olmaz. Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir. Ona və ailəsinə Allahın xeyir-bərəkəti və salamı olsun.

Artıq, firqələrin ixtilaf etdikləri iman və əhkam məsələlərində suallar artmışdır. İnsanlar isə xüsusən bu dövrdə ortaya çıxarılan və qarışdırılan bu məsələlərin bəzilərində qənaətbəxş cavablar tələb edir. Artıq iman məsələlərində, həmçinin şəriətə müxalif olan cahilin hökmü və şəriətin bəzisini tərk edənin hökmü məsələlərində insanların rəylərini, fikirlərini ortaya qoyan, bəyan edən risalələr yayılmışdır. Bundan öncə də əzm etmişdim ki, elmlə məşhur olan və sələfi salehin yoluna tabe olan imamlardan gələn sabit nəqlləri cəm etmək və bu nəqllərdə gələn üsul və qaydalardakı bəzi kəslərə qaranlıq qalan məqamlara açıqlıq gətirməklə, Əhli Sünnə imamlarının əqidə məsələlərində ittifaq etdiklərini – *Allaha həmd olsun* – bəyan etməklə bir kitab yazım. İxtilaflar isə yalnız və yalnız bidət əhli tərəfindən, yaxud imamların kəlamlarında və elmi qaydalarda cahil olanlar tərəfindən meydana gəlmişdir.

Əlimin altında bir çox vəsaitlərin olmasına baxmayaraq, bu kitabı yazmağı təxirə saldım və bu da bir çox səbəblərə görə oldu: Bunlardan vaxtın azlığı, həqiqətən bu kimi kitabı yazmaq tərtibə ehtiyac duyur ki, hətta kitab kamil bir şəkildə çıxsın və bu vaxt isə işlərin və dərslərin çoxluğuna görə indiyə qədər əldə olunmayıb.

İkinci səbəb isə, bu günlərdə bu mövzuda fasid və xarab yazıların çoxalmasını, kimin ağlına nə rəy gəldi yazıb-yaymasını və bunun da hərc-mərcliyə, elmə olan hörmətsizliyə və elmdə donu

altında xətaların yayılmasına aparıb çıxarmasını görərək (yazmaqdan) tərəddüd etməyim oldu.

Sonra isə, az vaxt ərzində tələsik olaraq, heç bir tərtibat və fəsillərə ayırmadan, ətrafında suallar artan bir məsələ barəsində bu müxtəsər kitabı yazmağı məsləhət bildim, bu məsələ də **şəriətdən cahil olduğu halda bu ümmətdən olan şirk edən kəsin hökmü məsələsindən ibarətdir.**

Beləliklə Allahdan kömək istəyərək deyirik:

Söz sahibləri şəriətə müxalifliyindən cahil olduğu halda şəri məsələlərdən hər hansı birində şəriətə müxalif olan kəsin günah qazanması və ya cahilliyə görə üzrlü bilinməsi barədə ixtilaf etmişlər.

Mötəzilələr və onlara müvafiq olanlar dini - hətta cahil olsa belə -şəriətə müxalif olan kəsin təkfir olunduğu etiqadi (üsuli) məsələlərə və müxalifin cahilliyə görə üzrlü bilindiyi əməli (furu, şaxə, törəmə) məsələlərə bölmüşlər. Bunlardan başqa bəzi fuqahalar da deyirlər ki, cahillik əqidədə yox, əməldə üzrlüdür. Başqaları isə deyir ki, cahillik əməl ilə ad və sifətlərdə üzrlü, əqidədə isə üzrlü deyildir. Həmçinin məsələdə digər firqələrə məxsus başqa sözlər də mövcuddur.

**Amma Əhli Sünnə vəl-Cəməa və Sələfi Salehin yoluna tabe olan məşhur imamlar - Allah onlardan razı olsun - artıq ittifaq etmişdirlər ki, kimin İslamı şəhadət kəliməsi ilə sabit olmuş, yaxud iki müsəlman valideyndən dünyaya gəlmiş, yaxud həddi buluğa çatana qədər müsəlman bir vəlinin himayəsi altında olmuş olarsa, hansı məsələdə olursa olsun, şəriətə müxalif olarsa, İslam hökmü ondan getməz, yalnız o əməldən başqa ki, əməl sahibinə şəriət küfr hökmünü vermiş və həmin əməl sahibinin özü də, bu məsələdə şəriət hökmünü bilir, bu əməl istisnadır. Amma o ki qaldı kimsə cahilliklə şəriətə müxalif olarsa, o kəs günah daşımır, əksinə istər bu müxaliflik əməli (furu, törəmə) məsələdə, istərsə də əqidə (üsuli) məsələsində olsun, o,**

**cahilliyinə görə üzrlü bilinər.** İndi isə sənə bu məsələdə imamların sözlərini ərz edirəm:

İmam Əbu Muhəmməd İbn Həzm[1] "əl-Fisal" kitabının 1-ci cild 16-cı səhifəsində "Təkfir olunanlar və olunmayanlar" başlığı altında deyir: "İnsanlar bu mövzuda ixtilaf etmişdirlər. Bir dəstə deyir ki, kim onlara etiqad və ya fətva məsələlərindən hər hansı bir şeydə müxalif olarsa o, kafirdir. Başqa bir dəstə isə öz ağıllarına və zənlərinə görə deyir ki, o kəs bu məsələlərin bəzisinə görə kafir, digərinə görə isə fasiqdir. Başqa bir dəstə isə deyir ki, kim onlara etiqad məsələlərində müxalif olarsa kafir, əhkamlarda və ibadət məsələlərində müxalif olarsa nə kafir, nə də fasiqdir, lakin o, üzrlü olan müctəhiddir və əgər xəta edibsə niyyətinə görə savab qazanır.

Başqa bir dəstə bunu ibadət məsələlərində özlərinə müxalif olana aid edərək deyir ki, etiqad məsələlərində əgər müxaliflik Allahın sifətləri mövzusunda olarsa həmin kəs kafir, yox əgər bundan başqa şeylərdə olarsa fasiqdir. Başqa bir dəstə isə deyir: **Müsəlman etiqad, yaxud da fətva məsələlərində dediyi hər hansı bir sözə görə nə təkfir olunmur, nə də fasiqliyinə hökm verilmir. Belə ki, bunlardan hər hansı bir şeydə ictihad edən hər bir kəs, ictihad edib haqq gördüyü şeylə ibadət edərsə, o kəs bütün hallarda əcr sahibidir. Əgər haqqa isabət edərsə iki, xəta edərsə bir əcr qazanır. Və bu da İbn Əbi Leylə, Əbu Hənifə, əş-Şəfii, Sufyan əs-Sövri və Davud İbn Əlinin sözləridir. Bu söz bu məsələdə sözünü bildiyimiz bütün səhabələrin sözüdür. Allah onlardan razı olsun. Onlardan bu məsələdə əslən heç bir ixtilaf da bilmirik**, yalnız onlardan hər hansı bir namazı hətta vaxtı çıxana qədər qəsdən tərk edənin, yaxud zəkatı, yaxud həcci, yaxud ramazan orucunu tərk edənin, yaxud da içki içənin təkfirindəki zikr etdiyimiz ixtilaflardan başqa ... "

---

[1] İmam Əbu Muhəmməd Əli İbn Əhməd İbn Səid İbn Həzm əl-Əndəlusi (hicri 456-ci ildə vəfat etmişdir)

İmam İbn Həzm "əl-Fisal" kitabı 17-ci səhifəyə qədər danışır və orada deyir: "**Hansı məsələdə olursa olsun, haqqa müxalif olan kəsə nə qədərki hüccət qaldırılmayıb o, kafir olmaz.** Yalnız təkfirinə Quran və Sünnədən dəlilin gəldiyi kəs istisnadır və bu kəsdə dayanılır. O, hüccət qaldırılmış kimidir. Misal olaraq, peyğəmbərin (sallAllahu aleyhi və səlləm) xəbəri gedib çatmış uzaqlarda yaşayan zənci onun bərəsində araşdırmazsa, kafirdir.

İmam İbn Həzm "əl-Fisal" kitabı 18-ci səhifədə deyir: "Əgər kimsə, Allah filan insanın özüdür, yaxud Allah məxluqatından birinin cisminə qarışır, yaxud Muhəmməddən (sallAllahu aleyhi və səlləm) sonra İsa Məsihdən (aleyhissələm) başqa bir peyğəmbər gələcək deyərsə, bu məsələlərdə hər bir kəsə hüccət çatdığına görə bu kəsin təkfirində heç bir kəs ixtilaf etməz. **Əgər bu şeyləri etiqad edən və bunun da əksi (haqq-tər) heç vaxt ona çatmayan bir şəxs olmuş olarsa, onda o şəxsə hüccət çatana qədər onun təkfiri vacib olmaz.**[2]"

24-cü səhifədə deyir: "Doğrudur ki, İslamda olmayan, İslamın əmri özünə çatmış hər bir kəs kafirdir. İslam əhlindən kimsə qəsdən müxaliflik etmədən, təvil edərək xəta edərsə və özünə də hüccət qalxmamış, haqq da ona bəyan olmamış olarsa, onda o kəs, haqqı axtardığına və haqqı qəsd etdiyinə görə üzrlü bilinər, tam bir əcr qazanar[3], xətası isə bağışlanmış olar. Bu isə Allah təalənin bu sözünə görədir:

وَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ فِيمَا أَخْطَأْتُم بِهِ وَلَٰكِن مَّا تَعَمَّدَتْ قُلُوبُكُمْ

---

[2] Təkfir hökmünü bütün müsəlmanlara məlum olan şeylər üzərində ittifaq olduğunu bildirdi və sonra isə baxmayaraq ki, bu şeylərdə cahilliyi fərziyyə etmək uzaqdır, lakin dedi ki, əgər bunda da cahillik olmuş olarsa təkfir olunmaz.

[3] Lakin şeyxülislam İbn Teymiyyə deyir ki, əgər bu xəta cahilliklə şirk əməllərindən hər hansı birində baş verərsə, cəzanın o insandan qaldırılması mənasında üzrlü bilinir, lakin etdiyinə görə savab qazanmır, çünki şirk heç vaxt şəriətdən olmayıb. İrəlidə bunun bəyanı gələcəkdir.

***Səhvən etdiyiniz əməllərdə sizə heç bir günah yoxdur, lakin qəlblərinizin qəsdən etdiyindən başqa*[4]**.

Və əgər haqqa isabət edərsə ona iki əcr vardır, bunun biri haqqa isabət etdiyinə, digəri isə haqqı tələb etdiyinə görədir. Amma əgər ona hüccət qalxarsa və haqq ona bəyan olarsa, lakin bundan sonra Allah və rəsulundan üz döndərmədən, sadəcə haqqa qarşı inadkarlıq edərsə, onda o, haram bir əməl üzərində israrlı olduğu üçün, Allaha qarşı cürətinə görə fasiq olur. Lakin əgər Allah və rəsulundan üz döndərərək haqqa qarşı inadkarlıq edərsə, onda o kəs qanı və malı halal olan kafirdir, mürtəddir. Bu əhkamlarda əvvəldə bəyan etdiyimiz şeylər üzrə şəriətdən olan etiqadi məsələlərdəki xəta ilə fətvalarda olan xəta arasında heç bir fərq yoxdur."

24-25-ci səhifələrdə deyir: "**Doğrudur ki, hər hansı bir şəxs nə qədər ki, peyğəmbərin** (sallAllahu aleyhi və səlləm) **əmri ona çatmayıb, təkfir olunmaz, əgər çatar və iman gətirməzsə, bu halda kafir olar.** Əgər ona iman gətirər, sonra da dində, etiqadda və ya fətvalarda Allahın onun qədərinə yazmış olduğu hər hansı bir şeyi etiqad edərsə, yaxud  Allahın onun qədərinə yazmış olduğu hər hansı bir əməli edərsə və bu kəsə də etdiyi etiqadda, yaxud dediyi sözdə, yaxud da etdiyi əməldə peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) əks hökm çatmamışdırsa, ona hökm çatana qədər əslən ona heç bir şey yoxdur. Əgər hökm ona çatar və onun özündə də bu hökm səhih sayılarsa və sonra isə bu şeydə haqq ona olduğu kimi aydın olmaz, ictihad edərək haqqa müxalif olarsa, belə halda o, xəta etmiş sayılar, üzrlüdür və bir əcrlə əcrlənir. Necə ki, peyğəmbər (sallAllahu aleyhi və səlləm) deyir: ***"Hakim ictihad edər və haqqa isabət edərsə ona iki, xəta edərsə bir əcr vardır"*[5]**

---

[4] Əhzəb surəsi 5.

[5] İmam Buxari (7352) və İmam Müslim (1716) rəvayət etmişlər.

Etiqad edən, yaxud söz deyən və yaxud da, əməl edən hər bir kəs, həmin şeydə hakim (hökm verən) sayılır. Və əgər həmin şeydə elmlə, haqqa qarşı inadkarlıq edərək müxaliflik edərsə və bununla da yanaşı, etdiyi bu müxalif əməlin əksini (yəni, haqqı – tərc.) etiqad edərsə, bu halda o, mömindir, fasiqdir.[6] Əgər sözü və qəlbi ilə inadkarlıq edərək müxalif olarsa, bu halda o, müşrikdir, kafirdir və bu istər etiqadda, istərsə də fətvalarda olsun, fərq etməz. Bu da gətirdiyimiz naslara görə belədir. Bu İshaq İbn Rahaveyhin və başqalarının görüşüdür, biz də bunu deyirik. Yardım Allahdandır." (Kəlamın sonu).

**Bu nəqllə artıq sənə bəyan oldu ki, hər kim peyğəmbərə (sallAllahu aleyhi və səlləm) iman gətirər, sonra da hər hansısa bir işdə inadkarlığı və müxalifliyi qəsd etmədən haqqa müxalif olarsa və bu da onun haqdan cahilliyinə, həmçinin şəri hökmün ona çatmadığına, yaxud da şəriətə müxalif olan elmin ona çatmasına və bu cahil olan kəsin də bunu şəriət zənn etməsinə görə baş verərsə, bu şəxs, bu müxalifliyə görə günah qazanmaz, lakin cahilliyinə görə günah qazanar.** Və haqq ona bəyan olunmalı və səhih elm ona çatdırılmalıdır. Bu isə istər etiqadlarda, istərsə də əməllərdə - dinin əsli və ya fəri məsələlərində olsun, eynidir. Bunu da artıq sən İmam Əbu Muhəmməd İbn Həzmin bütün bu sözlərindən və Sələf imamlarının cümhurundan etdiyi nəqllərindən gördün. Lakin bu hökmə müxalif olanlar da vardır. Və bu da necə ki, bu məsələlərdə üsulla furunun arasında fərq qoyan Mötəzilələrdə və onlara müvafiq olan bidətçilərdə mövcuddur.

[6] Lakin şirki məsələlərdən hər hansı birində etdiyi (şirk) əməlin əksini (haqqı) etiqad edərək əməli ilə müxaliflik edərsə və ona hüccət qalxar və haqqı etiqad etməklə yanaşı inadkarlıq edərsə, bu halda o kəs təkfir olunur. Çünki bizə qalan yalnız zahiridir. Bu halda o, artıq şirk etmiş, ondan da cahillik üzrü qalxmış və ona heç bir üzr qalmamışdır. Şirki məsələlərdə inadkarlıq etmək şirk, asilik və fasiqlik məsələlərində inadkarlıq etmək isə fasiqlikdir.

Bunlara da şeyxülislam İbn Teymiyyə Məcmuu Fətəvanın 23-cü cildinin 346-347-ci səhifələrində və Maturidiyyə məsələlərində cavab verir, həmçinin "Ğayətul-Əməniy"[7] kitabının sahibi həmin kitabın 1-ci cildinin 23-cü səhifəsində şeyxülislam İbn Teymiyyənin belə dediyini nəql edir:

"**Amma o ki qaldı dini növlərə bölərək, bir növü üsul və digərini furu adlandırmağın heç bir əsli yoxdur və bu bölgü nə səhabələrdən, nə onlara xeyir əməllərdə tabe olanlardan** (yəni təbeinlərdən-tərc)**, nə də ki, İslam imamlarından varid olmamışdır. Bu yalnız Mötəzilələrdən və onların mislində olan bidət əhlindən götürülmüş bir bölgüdür, fuqahalardan da kim bunu öz kitablarında zikr etmişdirsə, hamısı bunu onlardan götürmüşlər. Və bu naqis bir bölgüdür.** Məsələləri bu iki növə bölən kəsə deyilir: Elə isə, xəta edənin təkfir olunduğu bu üsul məsələlərinin tərifi və həmçinin bununla furu məsələlərinin arasındakı fərq nədən ibarətdir? Əgər desə ki, üsul məsələləri etiqad məsələri, furu məsələləri isə əməl məsələləridir, onda ona deyilir: İnsanlar Muhəmməd (sallAllahu aleyhi və səlləm) Rəbbini görüb-görməməsində, Osmanın yoxsa Əlinin əfzəlliyində, Quranın bir çox mənalarında və bəzi hədislərin səhihliyində ixtilaf etmişlər. Bunlar da hamısı elmi etiqadi məsələlər olub, ittifaqla onda heç bir küfr olmayan bir məsələdir. Namazın[8], zəkatın, orucun və həccin

[7] "Ğayətu əl-Əməniy fi ər-raddi alə ən-Nəbhəniy" – müəllif Əbu əl-Məaliy Məhmud Şukriy əl-Əlusi (hicri 1342-ci ildə vəfat edib-tərc). Müəllif bu kitabda bidət əhlindən olan Yusuf İbn İsməil İbn Həsən ən-Nəbhəni adlı (hicri 1350-ci ildə ölüb) birinin "Şəvahidu əl-həqqi fi əl-istəğasəti bi seyyidi əl-xalq" kitabına rəddiyyə vermişdir. Bu rəddiyyədə ən önəmli məsələlər təvəssül, Allahdan başqasından yardım istəmək və buna bağlı məsələlər, qəbirləri ziyarət üçün səfərə çıxmaq, ölülərə dua etmək kimi məsələlərdən ibarətdir və həmçinin şeyxülislam İbn Teymiyyəni zalım iftiraçıların ona atdıqları böhtanlardan müdafiə etmişdir (tərc).

[7] Əlbəttə, hətta namazın vacibliyini iqrar edən olsa belə, tənbəllik səbəbi ilə namazı tərk edənin təkfirində ixtilaf ediblər. Şeyxülislamın ittifaq zikr etməyi isə yalnız müxalif kəsə ixtilaf olan şeyi göstərmək üçündür.

vacibliyi, fuhuş işlərin, ağlı örtən içkinin haramlığı kimi məsələlər isə əməli məsələlərdir və bunları inkar edən ittifaqla kafir olur. Əgər desə ki, üsul məsələləri qəti bilinən məsələlərdir, onda deyilir: Əməli məsələlərdən bir çoxu vardır ki, qəti bilinən məsələdir və elmi məsələlərdən bir çoxu isə qəti olmayan məsələdir.[9] Və hər hansı bir məsələnin qəti və zənni olması nisbi bir məsələlədir, bəzən hər hansı bir məsələ hər hansı bir insanda açıq-aydın, onun üçün kifayət edən dəlillə sabit olduğuna görə qəti məsələlərdən olar, necə ki, rəsulullahdan (sallAllahu aleyhi və səlləm) bir nas eşidib və muradı bununla yəqinləşən şəxs kimi. Başqa bir insanda isə məsələ dəlilin ona çatmamasına və ya onda sabit olmamasına, yaxud da dəlilin elmdən nəyə dəlalət etdiyini bilmədiyinə görə nəinki qəti, heç zənni də olmaya bilər". Kəlamın sonu.

Bundan qabaq isə bəyan etmişdir ki, səhabələr haqqa müxalif olan kəsi hüccət qalxmamış təkfir etməzdirlər. 346-cı səhifədə demişdir: "Onlar məsələləri iki hissəyə - inkar edənin təkfir olunduğu üsula və inkar edənin təkfir olunmadığı furuya bölməmişlər".

Belə ki, insan bu dində böyüyür , yaxud dinə sonradan daxil olur və etiqad da edir ki, bu din haqdır, lakin labüddür ki, o insana bəzi şəriət məsələləri qaranlıq qalsın və cahillikdən dolayı dində müxaliflik etsin. Bu halda bu kəs yalnız ona elm çatdıqdan sonra təkfir olunur. Bu məsələlər isə insandan insana və zamandan zamana asılı olaraq müxtəlif olur, həmçinin pis elm əhlinin və cahilliyin hökm sürdüyü hallarda şəriətdən bir çox mühüm məsələlər gizli qalır. Artıq, uydurma hədislərə, əsası olmayan

[9] Qəti məsələ isbatı Quran, yaxud da mütəvatir Sünnə ilə - yəni bir çox yollarla rəvayət olunan hədislərlə bilinən məsələlərdir. Zənni məsələ isə əhəd - yəni tək yolla rəvayət olunan xəbərlərlə bilinən məsələlərdir. Bu təriflər bu bölgünü deyənlərdədir. Bununla şeyxülislam qəsd edir ki, bir çox əməli məsələlər vardır ki, o mütəvatir və bir çox etiqadi məsələlər vardır ki, o tək (əhəd) yolla sabit olmuşdur.

xəbərlərə, yaxud da, nasları batilcəsinə təvil etmə səbəbinə görə şəriətə müxalif etiqad və əməllər yayılmaqdadır. Cahil insanlar da bunu din zənn edərək, şeyxlərindən, elm və fətva əhlindən qəbul edir, bəzən isə bu məsələlər bəzi şirki əməllərdən olur – necə ki, təvəssül adlandırdıqları istiğasə və nəzir kimi. Və şəkk yoxdur ki, insanlardan çoxu səhih şəri elmdən cahilləşir, şeyxlərindən səhih olmayan elmi qəbul edirlər və buna görə də üzrlü bilinirlər.

**Amma o ki, qaldı fuqahanın dindən bilinməsi zəruri olan şeylərdə müxalif olan kəsin təkfirinə hökm verməsinə, bu məsələdə də müəyyən bir hədd və tərif yoxdur, bu məsələ də müxtəlifdir. Və bəzi imamların şəhərlərdə və ya uzaq vadilərdə yaşayanı misal çəkmələri müəyyən bir dəlillə yox, yalnız araşdırma ilə deyilmiş bir misaldır. Və həqiqətən, bir şey hər hansı bir diyarda məlum, digərində isə məlum olmaya bilər, bir əsrdə zahir, açıq-aydın bilinən, digərində isə gizli, qapalı və bilinməyən ola bilər.**

Şeyxülislam 13-cü cild 118-ci səhifədə deyir: "Həmçinin, dindən hər hansı bir şeyin zəruri olaraq bilinməsi məsələsi də nisbi bir məsələdir. Dində yeni olan şəxs, uzaq bir yerdə yaşayan şəxs, bəzən bunu bütövlüklə bilmir, o ki qaldı onun zəruri olan şeylərdən olduğunu bilsin. Alimlərin bir çoxu zəruri olaraq bilirlər ki, peyğəmbər (sallAllahu aleyhi və salləm) səhv səcdəsi etmiş, diyəni - adam öldürənin ata tərəfdən olan qohumlarının verməsinə hökm vermişdir. Həmçinin hökm vermişdir ki, uşaq yatağa məxsusdur, bundan başqa xas insanların zəruri olaraq bildiyi və insanların çoxunun isə qəti olaraq bilmədiyi məsələlər vardır."

Risalənin gedişi əsnasında bu məsələyə dair səhabələrdən misallar keçəcək və inşə Allah onlara diqqət çəkəcəyik.

Və sənin üçün burada, bu tələm-tələsik yazdığımız risaləmizdə Allah təalənin yardımı ilə bu məsələdə imamlardan bacardığımız nəqlləri edəcək və bəyan edəcəyik ki, onlar cahili, hətta ona hüccət qalxana qədər əqidə və əməldə üzrlü görərdilər.

# Təkfir Üçün Hüccət Qaldırmağın Şərt olması

## Şeyxülislam İbn Teymiyyə

Məcmuu Fətəva 20-ci cilddə bəzən insanın haqq olduğunu zənn etdiyi batil dəlilə əsaslanaraq, xəta üzrə bəzi ibadətləri etməsini zikr etdikdən və etdiyi bu xəta əməl şəriətin gətirdiyi əməllər cinsindən olduqda (misal olaraq oruc kimi), qəsdinə görə savab qazanmasını təhqiq etdikdən sonra 32-33-cü səhifələrdə deyir: "Şirk kimi cinsi şəriətdə gəlməyən əməllər isə belə deyil, bu əməllərə görə cəzalandırmasa belə, insan buna görə savab da qazanmır. Bu kimi əməllərdə Allah təalə əməl sahibini ancaq risalənin ona çatmasından sonra cəzalandırır. Necə ki, Allah təalə deyir:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

*"Biz rəsul göndərməmiş əzab verən deyilik"*[10] .

Lakin o kəs cəzalandırılmasa belə, savab da qazanmır. Əksinə, necə ki, Allah təalə buyurur:

وَقَدِمْنَا إِلَىٰ مَا عَمِلُوا مِنْ عَمَلٍ فَجَعَلْنَاهُ هَبَاءً مَنْثُورًا

***"Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik"*[11].**

İbn Mübərak deyir: "O əməllər Allahdan başqası üçün edilmiş əməllərdir" və Mucəhid deyir: "O qəbul olunmayan əməllərdir". Allah təalə buyurur:

مَثَلُ الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ أَعْمَالُهُمْ كَرَمَادٍ اشْتَدَّتْ بِهِ الرِّيحُ فِي يَوْمٍ عَاصِفٍ

***Rəbbini inkar edənlərin məsəli – onların əməlləri, qasırğalı bir gündə küləyin şiddətlə sovurduğu külə bənzəyir.***[12]

Bu kəslərin əməlləri batildir və onlara heç bir savab yoxdur.

Rəsul (sallAllahu aleyhi və səlləm) onlara o batil əməlləri nəhy etdikdə, onlar da bundan əl çəkmədikdə cəzalandırıldılar. Bu batil

---

[10] İsra surəsi 15.

[11] Furqan surəsi 23.

[12] İbrahim surəsi 18. (Ayənin tamamı: لَا يَقْدِرُونَ مِمَّا كَسَبُوا عَلَىٰ شَيْءٍ ذَٰلِكَ هُوَ الضَّلَالُ الْبَعِيدُ (Onlar gördükləri işlərə görə savab qazanmazlar. Dərin azğınlıq da elə budur) – tərc.)

əməllərə görə əzabın gəlmə şərti rəsulun təbliği, əməllərin batilliyi isə əməlin özünə görədir, çünki bu əməl əmr olunmamış bir əməldir. Əmr olunmamış hər bir ibadət isə labüddür ki, qadağan olunsun. Sonra da bu batil əməlin qadağan olunduğunu bilərək onu edərsə, o kəs əzaba haqlı olar, yox əgər etməzsə, haqlı olmaz. Və əgər bu batil əməl şəriətdə gələn əməllər cinsindən olar və etdiyi əməlin əmr olunmuş əməl olduğunu etiqad edərsə, bu halda əməl sahibi savab qazanır. Yox, əgər əməl şirk cinsindən olarsa, bu cinsdə əmr olunmuş heç bir əməl yoxdur. Lakin bəzi insanlar bu cinsin bəzi növlərində elə zənn edirlər ki, o əməl əmr olunmuş bir ibadətdir.[13]

---

[13] Bu da, bəzi səhih nasları fasid təvillər səbəbi ilə Allah və rəsulunun (sallAllahu aleyhi və səlləm) muradına uyğun olmayan tərzdə başa düşmək və ya bəzi alimlərin səhihləşdirdikləri, əslində isə səhih olmayan hədislərə əməl etmək yolu ilə baş verir. Və burada sənin üçün hər iki növə aid heç bir şərh vermədən misallar çəkəcəyik ki, işin həqiqi mahiyyətini və bəzi avam insanlara, həmçinin də elmdən nəyəsə nisbət olunanlara bu əməllərin necə başqa cür çatdırdığının şahidi olasan:

**يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَابْتَغُوا إِلَيْهِ الْوَسِيلَةَ**

***Ey iman gətirənlər! Allahdan qorxun, Ona (yaxınlaşmaq üçün) vasitə axtarın (Maidə 35).***

Görürsən ki, bəzi təfsir kitablarında bu ayə ilə qəbirlərdən təvəssül etməyə dəlil gətirilir. Təfsirçi əl-Əlusi özünün “Ruhu əl-Məani” adlı təfsir kitabında deyir: "Bəzi insanlar bu ayə ilə salehlərdən şiddət anında kömək istəməyin (istiğasə etməyin) məşru olduğuna dəlil gətirir və saleh insanları Allahla qullar arasında vasitə edir, Allaha onları and verərək deyirlər: Ey Allahım, biz sənə filan bəndəni and veririk ki, bizə filan-filan şeyləri verəsən. İddia edirlər ki, bu ayədə keçən vəsilə axtarmaq elə budur və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) də belə dediyini rəvayət edirlər: "İşləriniz tərs gəldikdə, çıxış yolu tapmadıqda sizə qəbir əhlini gərək bilirəm" (hədis uydurmadır). Bunlar hamısı haqdan olduqca çox uzaqdır." Kəlamın sonu. Və həmçinin Allah təalənin bu sözü ki,

**وَلَوْ أَنَّهُمْ إِذْ ظَلَمُوا أَنْفُسَهُمْ جَاءُوكَ فَاسْتَغْفَرُوا اللَّهَ وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُوا اللَّهَ تَوَّابًا رَحِيمًا**

***Onlar (münafiqlər) özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanmaq diləsəydilər və Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın tövbələri qəbul edən, Rəhmli olduğunu bilərdilər. (ən-Nisə 64)***

Qurtubi deyir ki, Əbu Saleh Əlidən rəvayət edir ki, o deyir: Peyğəmbəri (sallAllahu aleyhi və səlləm) dəfn etdikdən üç gün sonra bir bədəvi gəldi və özünü Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) qəbrinin üstünə ataraq başına torpaq tökdü və dedi: Ey Allahın Rəsulu! Sənin sözünü eşitdik, Allahdan və səndən bunu əzbərlədik ki, Allah sənə bu ayəni nazil etmişdir "Onlar özlərinə zülm etdikləri zaman...". Artıq mən öz nəfsimə zülm etdim və sənin yanına gəldim, mənim üçün bağışlanma dilə. Və qəbirdən bir səs gəldi: Artıq sən

bağışlandın." (Beyhəqi " Şuabul-İmən" kitabında pis bir sənədlə rəvayət etmişdir, belə ki, hədisin raviləri yalançı, məchul və tərk olunmuş ravilərdən ibarətdir). İbn Kəsir təfsirində Əbu Mənsur əs-Sabbağdan oxşar hekəyəti nəql edir ki, o (yəni Əbu Mənsur-tərc), öz "Şəmil" kitabında Utbədən rəvayət edir ki, Utbə deyir: "Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) qəbrinin yanında oturmuşduq və bir bədəvi gələrək dedi: Əssələmu aleykə, ey Allahın Elçisi! Eşitmişəm ki, Allah təalə deyir ki: "Onlar özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib......" Artıq budur, sənin yanına günahlarımın bağışlanmasını diləyərək və Səni Allaha şəfaətçi tutaraq gəlmişəm. Sonra bədəvi çıxıb getdi, məni yuxu apardı və yuxuda Peyğəmbəri (sallAllahu aleyhi və səlləm) gördüm ki, deyir: "Ey Utbə! Bədəviyə çat və ona de ki, artıq Allah təalə onu bağışlamışdır." Kəlamın sonu.
Bəzi təfsir yazanlar, bunlardan biri də Şihəb Cəffəci Beydavinin təfsirinə yazdığı haşiyəsində Kəhf surəsinin 21-ci ayəsi ilə -

**قَالَ الَّذِينَ غَلَبُوا عَلَىٰ أَمْرِهِمْ لَنَتَّخِذَنَّ عَلَيْهِم مَّسْجِدًا**

***Üstün gələnlər isə: "Onların (məzarı) üstündə mütləq bir məscid tikəcəyik!"– dedilər"-***
bu ayə ilə salehlərin qəbirlərinin üzərində məscid tikməyi, namaz qılmağı və bununla da Allaha yaxınlaşmağın icazəli olduğunu deyirlər.
Səhih hədislərdən, həmçinin buna misal səhabələrin quraqlıq vaxtı Abbasla təvəssül etmələri hədisi və Osman İbn Huneyfin Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) kora ""Ey Allahım! Rəhmət Peyğəmbəri olan Muhəmməd Peyğəmbərinlə Səndən istəyir və sənə üz tuturam. Ey Muhəmməd! Sənin vasitənlə Rəbbimə üz tuturam ki, mənim bu ehtiyacımı ödəyəsən. Ey Allahım! Onu mənim üçün şəfaətçi et" və onun gözləri qaytarıldı" duasını öyrətməsi hədisidir. Tirmizi hədisin həsən səhih ğarib olduğunu demiş, Tabarani və başqaları səhihləşdirmiş, Hakim isə Buxari və Muslimin şərtlərinə uyğun olaraq səhih olduğunu demiş və Zəhəbi də onunla razılaşmışdır. Beyhəqi bu hədisə əlavə etmişdir ki, Osman İbn Huneyf Osmanın (radıyAllahu anhu) xilafəti zamanında bir kişiyə Osmanın (radıyAllahu anhu) yanında ehtiyacı ödənilsin deyə bu duanı öyrətmişdir və onun ehtiyacı ödənildi. Bu rəvayəti Tabarani zikr etmiş və səhihləşdirmiş, şeyxülislam İbn Teymiyyə isə bunun zəif olduğunu bildirmişdir. Beyhəqi "Dələil" kitabında Ömərin (radıyAllahu anhu) xəzinədarı Malikə çatan isnadla etdiyi rəvayətdə deyir: " Ömərin (radıyAllahu anhu) zamanında insanlara quraqlıq üz verir və bir kişi də yuxusunda Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) qəbrinə gedir. Peyğəmbər (sallAllahu aleyhi və səlləm) ona deyir: "Get Ömərin yanına, məndən ona salam de və xəbər ver ki, onlara yağış gələcək. Və ona de ki, işlərində tədbirli olsun, lazımı tədarükləri görsün". Ömər ağlayır və deyir: Ey Rəbbim! Aciz olduğum şeylərə gücüm çatmır." İbn Həcər bunu İbn Əbi Şeybəyə nisbət edərək səhihləşdirir və ondan başqası da bunu səhihləşdirmişdir. Hakim Ömərdən Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) çatan isnadla rəvayət edir ki, Adəm (aleyhissələm) tövbəsində demişdir: "Ey Rəbbim! Muhəmmədin haqqına səndən istəyirəm ki, məni bağışlayasan". Hakim səhihləşdirmiş, lakin Zəhəbi demişdir ki, uydurmadır və İbn Munzir, İbn Covzi və Əcuridə bu rəvayətə oxşarlar rəvayətlər vardır. İbn Macə "Sunən"-də Əbu Səid əl-Xudridən Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) çatan isnadla rəvayət etmişdir: "Ey Allahım! Səndən istəyənlərin Sənin üzərində olan haqqı ilə Səndən istəyirəm"... İraqi, Əbul-Həsən əl-Məqdisi və İbn Həcər həsənləşdirmişlər.

İbn Məsuddan Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) çatan isnadla (mərfu) gəlmişdir ki, o (sallAllahu aleyhi və səlləm) deyir: "Həyatım sizin üçün daha xeyirlidir, siz danışırsınız və sizə xəbər verilir və ölümüm sizin üçün daha xeyirlidir, əməlləriniz mənə ərz olunur və mən orada xeyir bir şey gördükdə Allaha həmd edir, şər nə isə gördükdə isə Allahdan sizin üçün bağışlanma diləyirəm." Bəzzar rəvayət etmiş və İraqi isnadının yaxşı olduğunu demiş, Suyuti və başqaları isə səhihləşdirmişdir.
Salehlərin ölümdən sonrakı həyatlarında da bunun bənzəri vardır: İbn Qudəmə "Məarif" kitabında etdiyi rəvayətdə Abdullah İbn Həram, Talhə İbn Ubeydullah və Amr İbn Cumuh Uhudda basdırıldıqları yerdən üç il sonra başqa bir yerə dəyişdirildikdə insanlar gördülər ki, onların halında heç bir dəyişiklik baş verməmişdir. Bəğavinin Əbu Zubeyrə çatan isnadlı rəvayətində Əbu Zubeyr deyir ki, Cabirin belə dediyini eşitdim: Muaviyə öz işçisinə məktub yazdı kı, Uhuda bulaq çəkdirsin, işçisi də ona cavab yazaraq bildirdi ki, ora bulaq, yalnız şəhidlərin qəbirlərinin üzərindən keçə bilər. Muaviyə də yazdı ki, yerinə yetirsin. Əbu Zubeyr deyir ki, Cabir dedi: Gördüm ki, insanları qəbirlərindən çıxartdılar, sanki onlar yuxuda idilər. Hətta Həmzənin ayağına batan oxun yerindən qan axırdı." Hafiz İbn Racəb deyir: "Peyğəmbərlərdən başqa uzun müddətdən sonra bədənləri təravətli və kəfənləri üzərilərində olan bir çox insanlara şahid olunmuşdur...". Və məşhur alimlər haqqında olan hekayələrdən: Xatib öz Tarixində Hənbəli imamlarından biri olan Xalləldən etdiyi rəvayətdə deyir: "Bir işin olmasını istədikdə Musə İbn Cəfər əl-Kazımın qəbrinə gedərək onunla təvəssül edərdim və dərhal Allah təalə istədiyim şeyi asanlaşdırardı". Xalləl Hənbəlilərin imamlarından biri olub. Xatib İmam Şafiidən rəvayət edir ki, Şafii deyir: "Mən hər gün Əbu Hənifənin və qardaşımın qəbri ilə təbərrük edirəm. Bir ehtiyacımın ödənilməsini istədikdə iki rükət namaz qılar, onun qəbrinə gedər və qəbrin yanında Allahdan ehtiyacımı istəyərdim. Çox keçmədən istədiyim yerinə yetərdi". Həfiz Əbu Bəkr İbn Muqri "Musnədi İsfəhən" kitabında deyir: "Mən, Tabarani və Əbu Şeyx Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) şəhərində idik. Orucun vaxtı bitdi, biz də yemək olmadığından orucu davam etdirdik və işa namazının vaxtı girdikdə qəbrin yanına gəlib dedim: Ey Allahın elçisi, aclıqdır! Tabarani mənə dedi: Otur, ya ruzi gələcək, ya ölüm. Mən və Əbu Şeyx qalxdıq, bu anda qapıya bir Ələvi gəldi, qapını açdıq, onun yanında içində çox şey olan iki zənbilli iki oğlan var idi. Dedi: "Ey camaat! Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) şikayət etmişdiniz və mən də onu gördüm, sizlərə bir şeylər gətirməyimi mənə əmr etdi". Bunu Səxavi "Qavlul Bədii" kitabında zikr etmişdir, bundan başqaları isə nə çoxdur. Fətvalarda zikr olunanlardan: Allamə Şihəb Ramli şiddət anlarında sıravi insanların "Ey Şeyx filankəs!" dedikləri barədə soruşulduqda cavab verdi ki, peyğəmbərlərdən, rəsullardan, övliyalardan, alimlərdən və salehlərdən istiğasə (şiddət anında yardım istəmək) icazəlidir. Hənəfi Şeyx Abdul Həyy Şərnəbləli fətvasında deyir: "Peyğəmbərlər və övliyalarla təvəssül etmək icazəlidir. Belə ki, hər bir müsəlmanın ağam Əhmədin və başqa övliyaların Allahın istəyi və qüdrəti ilə xeyirli ehtiyacları və işləri yerinə yetirməyə malik olmalarına etiqad etməsində heç bir şəkk-şübhə yoxdur" və məzhəblərdə bundan başqa nə çox şeylər vardır.
Qastaləni "Mavəhib" kitabında deyir: "Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) qəbrini ziyarət edən hər bir zəvvara lazımdır ki, Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) istəməyi, ona zəlilliyi, ondan yardım diləməyi, şəfaət istəməyi və onunla təvəssül etməyi

artırsın". İbn Həcc "Mədxal" kitabında "Bidətin və şəri ibadətin bəyanı kitabı"nda deyir: "Bunlar ümumi olaraq ziyarətin sifətləridir, əgər ziyarət olunan meyit bərəkəti umulan bir kəsdirsə, Allaha onunla təvəssül olunur." Və sonra deyir: "Əgər kimin bir ehtiyacı olarsa, onların qəbirlərinə getsin, onlarla təvəssül etsin, həqiqətən onlar Allahla məxluqatın arasında vasitədirlər...". Ğazəli "İhya" kitabında "Səfərin ədəbləri" bölümündə deyir: "İkinci qism bundan ibarətdir ki, ya cihad, ya da həcc kimi ibadət məqsədi ilə səfərə çıxmaq. Sonra deyir: Bu səfərə ümumi olaraq peyğəmbərlərin, səhabələrin, tabiinlərin, başqa alimlərin və övliyaların qəbirlərini ziyarət etmək daxildir. Və sağlığında özünü görməklə təbərrük olunan hər bir kəs, ölümündən sonra da onu ziyarət etməklə təbərrük olunur. Və bu məqsədlə də ona tərəf səfərə çıxmaq da icazəlidir. Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) *"Üç məsciddən başqasına səfərə çıxmayın"* hədisinin (Səhihdir. İmam Məlik, Əhməd və Sünən sahibləri rəvayət etmişlər) buna heç bir maneəçiliyi yoxdur. Çünki nəhy məscidlərə aiddir, qəbirlər kimi başqa şeylərə aid deyildir. Peyğəmbərlərin, övliyaların və alimlərin dərəcələrində böyük bir təfavüt olsa belə, qəbirlərinin ziyarətindəki fəzilətin əslində heç bir fərq yoxdur". Şafilərin Məkkədəki müftisi Əhməd Zeyni Dəhlən 2-ci cild 246-247-ci səhifələrdə deyir: "Təvəssül, şəfaət və istiğasə hamısı bir mənadadır. Möminlərin qəlbində bunun, Allahın sevdiyi kəslərin zikri ilə təbərrük etməkdən başqa bir mənası yoxdur. Sabit olmuşdur ki, onlar istər diri, istərsə də ölü olsunlar, Allah təalə onların səbəbi ilə qullarına rəhm edir. Həqiqətdə isə bir şeyin olmasına təsir edən və var edən yalnız Allahdır. Bu seçilmiş kəsləri zikr etmək isə adi bir səbəbdir, təsiri olmayan adi bir qazanc kimi. Və Peyğəmbərlərin öz qəbirlərində sağ olmaları Əhli Sünnədə çox saylı dəlillərlə sabitdir". Bundan başqa olan naslara və nəqllərə bir çox rədlər və təfsirlər vardır. Həmçinin Dəhlən deyir: "Bu məsələdə sözü yalnız ona görə uzatdım ki, bu məsələdə şübhədə olan kəslər üçün məsələ son dərəcə açıq-aydın olsun. Çünki təvəssülü inkar edən bir çoxları vardır ki, insanları öz batil əqidələrinə sürükləmək üçün onlara şübhələr atırlar. Ola bilsin ki, Allah təalənin onların bu şühbələrini qəbul etməkdən qoruduğu kəs bu nasların üzərində dursun və o şübhələrə tərəf boylanıb baxmasın, onlara öz batillərində hüccət qaldırsın. Sənə cümhura və haqq üzrə olan o qara (böyük) topluma sarılmağı nəsihət edirəm, yoxsa Allaha və Onun Rəsuluna (sallAllahu aleyhi və səlləm) qarşı çıxar, möminlərdən başqasının yoluna tabe olarsan". Kəlamın sonu.

- Şəkk yoxdur ki, bu şübhələr bu cür şeyxlərin tabeçilərinin qəlblərində güclənir və onlar zənn edirlər ki, onların etdikləri bu ibadətlər bidət yox, əksinə şəriətdəndir və dəlillər və həmçinin alimlərin sözləri də bunu göstərir. Bu şübhələri isə yalnız səhih elmə nail olub, səhihi batildən ayırd edə bilən, səhih təfsiri fasid yozumdan seçə bilən kəs rədd edə bilər. Qarşısında bu naslar, bu nəqllər olan və bununla da yanaşı şəri səbəbdən, həmçinin müstəhəb vəsilədən tutunduğunu zənn edən kəs necə də üzrlü olmaya bilər?!
- Amma o ki qaldı bəşər qanunlarının hökmünə: halal, haram və ibadət məsələlərində şəriətə tabe olan insanlardan çoxu görürsən ki, sonra məhkəməyə müraciət etmə məsələlərində bunun ibadət məsələlərindən olmadığını zənn edərək öz ağlının, yaxud onu əhatə edən nizamın tələbatlarına uyğun olaraq onunla müamilə edir və bu məsələdə olan əmir-qadağalar heç onun ağlına belə gəlmir. Bəzən ola bilsin insan zənn edir ki, din insanlara onların dünya işlərində öz məsləhələrinə uyğun olaraq hərəkət etməyi halal

Beləsi ictihad edən sayılmır, çünki ictihad edən labüddür ki, şəri dəlilə əsaslansın, bunda isə heç bir şəri dəlil yoxdur. Lakin bəzən bunu özü kimi birisinin ictihadı ilə edir, bu isə bu əməli edən şeyx və alimlərə olan təqlididir. Belə əməli edənlər bu əməlin fayda verdiyinə və ya eşitdikləri yalan hədisə əsaslanıblar. Bu kəslərə nəhylə hüccət qalxmadıqca əzab verilməz. Amma o ki qaldı savaba, ola bilsin ki, bunlar öz cinslərindən olanlardan daha üstün olduqlarına görə bunların savabı olsun. Allaha yaxınlaşmaq

---

saymışdır, dinə isə yalnız şüarları yerinə yetirməklə iltizam olunurlar. Bu isə bu kəslərin şəriətdə bu məsələdə varid olan nasları tədəbbür etmək üçün özlərinə vaxt ayırmamaları və elmə, fətvaya üz tutanların səhih bəyandan susmaları, danışdıqda da görürsən ki, zəif rəyləri gətirmələri, yaxud səhihləri də düzgün yerinə qoymamaları səbəbinə görədir. Misal olaraq təfsir kitablarında mövcud olan İbn Abbasın

وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ فَأُولَٰئِكَ هُمُ الْكَافِرُونَ

*"Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir" (Maidə 44)* ayəsinin təfsirində dediyi "Küfr olmayan küfr", "Sizin fikirləşdiyiniz küfr deyil" və Tavusun "Millətdən çixaran küfr deyil" və İbn Tavusun "Allaha, mələklərinə, kitablarına və rəsullarına küfr edən kimi deyil" və Bəra İbn Azibin Muslimdə olan rəvayəti "Bu əhli kitab barəsindədir" və həmçinin İbn Kəsirin "Bu söz İbn Abbasın, Əbu Muclizin, İkrimənin və başqalarınındır və həmçinin Tabari də bunu seçmişdir" deməsi, Qurtubidə gəlir ki,

وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ فَأُولَئِكَ هُمُ الْكَافِرُونَ

*"Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir"* və الظَّالِمُونَ (zalımlardır) və الْفَاسِقُونَ (fasiqlərdir) (Maidə 44,45,47) - ayələri hamısı kafirlər barəsində nazil olmuşdur.

Bu əvvəldə keçdiyi kimi Səhih Muslimdə Bəra İbn Azibin hədisində sabit olmuşdur və bütün bunlara görə müsəlman hətta böyük günah etsə belə kafir olmur... Sonra məsələdə olan başqa rəyləri zikr edir və sonra deyir ki, doğru olan birincidir (yəni, bizim zikr etdiyimiz)... Bütün bunların hamısını doğru yerinə qoymamaq səbəbilə baş verir.

- Məqsəd şəri əhkamlardan insanların cahil olan hallarını və həmçinin bu haqqa ərz olunan şübhələri doğru olaraq bəyan etməkdir, o şübhələr ki, bunda müxalifi təkfir etməkdən qabaq hüccət və dəlilləri bəyan etmək lazımdır (bu şübhələrə rədd etməyin isə öz yeri vardır). Artıq müəllif bu şübhələri öz "Vəsilənin mənasının bəyanında uca faydalar və qəbirpərəstələrin şübhələrinə rəddiyyə" adlı risaləsində batil etmişdir.
- Lakin bu iki sinifdən olmayan üçüncü bir sinfə də diqqət yetirmək lazımdır ki, o da şəriətdən tamamilə üz döndərən, onu mütləq olaraq nə öyrənməyən, nə də əməl etməyən, halal və haramı öyrənməyə və şəriətin əmr etdikləri, şüarları barəsində və onu əda etmək haqqında sual verməyə maraq göstərməyən, sanki boş-boşuna yaradıldığını zənn edəndir. Bunun öz hökmü vardır, yeri gəldikdə ondan da danışacağıq.

savabına gəldikdə isə bu cür əməllərlə savab olmur". Kəlamın sonu.

Bu açıq-aydın bir nəqldir ki, şirk sahibi yalnız və yalnız hüccət qalxdıqdan sonra kafir olur. Və həmçinin bildirir ki, əgər hüccət qalxmayıbsa, ona əzab da verilməz.

Və həmçinin Məcmuu Fətəvada 1-ci cild 112-ci səhifədə şəri istiğasə ilə şirki istiğasəni zikr etdikdən sonra təkfir etmək məsələsində deyir: "Rəsuldan onun öz məqamına layiq olan bir şeyi istəmək mənasında olan istiğasədə heç bir müsəlman mübahisə etməz (yəni, həyatında ikən ondan nəyisə istəmək). Kim bunda mübahisə edərsə, ya kafir - əgər inkar edirsə, ya da azğın xətakardır. Amma o ki, qaldı rəsulullahın (sallAllahu aleyhi və səlləm) inkar etdiyi mənada olan istiğasəyə, bu da inkarı vacib olan şeylərdəndir. Və kim yalnız Allaha layiq olan şeyləri Allahdan başqası üçün isbat edərsə və ona tərk edənin kafir olacağı hüccəti qalxmışdırsa, o kafirdir." Kəlamın sonu.

Bu isə hər hansı əməlin məşru olduğunu zənn edərək şirk edən, əslən də bu ümmətdən olan cahilin yalnız açıq-aydın hüccət qalxdıqdan sonra təkfir olunmasında uca, Günəş kimi parlayan bir nəqldir.

Bu kəlamı şeyxülislamın başqa məsələlərdə yox, məhz gizli olan (xafiy) məsələlərdə üzr görməsinə yozmalarına gəldikdə isə, ola bilsin ki, etdiyimiz bu nəqli kifayət qədər fikirləşdikdən sonra, bu yozumun batil olması sənə aydın olsun. Lakin şeyxülislam Məcmuu Fətəvanın 4-cü cildində kəlam əhlinin azğınlarından, fəlsəfəçilərdən və ateistlərdən, onların elm və şəriəti bilmələrini iddia etmələri ilə yanaşı haqqa müxalif olmalarından, küfrə və batilə çağırmaqlarından danışdıqdan sonra 54-cü səhifədə deyir: "Bu əgər gizli olan (xafiy) məsələlərdə olarsa, bu halda deyilir ki, o, bu məsələdə azmış xətakardır, ona sahibinin kafir olacağı hüccət qalxmamışdır. Lakin bu şey onlardan elə bir tayfada baş verir ki, bu şeylərin İslam dininin zahiri məsələlərindən olmasını adi

müsəlmanlar da, müsəlmanlardan olan xas insanlar da bilirlər. Əksinə, yəhudi və nəsranilər də bilirlər ki, Muhəmməd (sallAllahu aleyhi və səlləm) bununla göndərilmiş və buna qarşı çıxan kəs də küfr edir. Misal olaraq tək Allaha ibadət etməyi və Ona heç bir şeyi şərik qoşmamağı əmr etməsi, həmçinin Allahdan başqa olaraq mələklərə, peyğəmbərlərə, Günəşə, Aya, ulduzlara, bütlərə və başqa şeylərə olan ibadətləri qadağan etməsi kimi əməlləri misal çəkmək olar. Həqiqətən bunlar İslamın ən açıq-aydın, zahir olan şüarlarıdır. Və həmçinin beş vaxt namazı əmr etməsi, onu vacib etməsi, onun şanını uca tutması və həmçinin yəhudi, nəsrani, saibi, müşrik və məcusilərlə düşmənçilik etməsi, fahiş əməlləri, ribanı, sərxoş edici içkini, qumarı və başqa şeyləri haram etməsi də bunların mislindəndir". Kəlamın sonu.

Şeyxülislamın bu sözü kəlam əhlindən olan xas bir tayfaya aiddir ki, bunlar da elmi iddia etmələri ilə yanaşı zahiri bilinən şeylərdə dindən sıyrılıb çıxmışlar. Şeyxülislam həmin səhifədə (54) əvvəldə verdiyimiz nəqldən dərhal sonra deyir: "Sonra onların bir çox başçıları sonradan tövbə edərək İslama qayıtsalar belə, əvvəldə bu işlərə düşərək İslamdan çıxmışdırlar. Rəvayət olunur ki, Cəhm İbn Safvan namazı qırx gün vacibliyini görməyərək tərk etmişdir". 55-ci səhifədə deyir: "Bundan daha da betəri budur ki, onlardan bəziləri vardır ki, müşriklərin dininə və İslamdan dönməyə aid kitablar yazmışlar. Necə ki, Razi ulduzlara və bütlərə ibadət etmək barədə kitab yazmış, bunun gözəlliyinə, bunun faydalılığına dair dəlillər gətirmiş və buna rəğbətləndirmişdir. Bu da müsəlmanların ittifaqı ilə dindən dönmək sayılır, hətta bəzən sonradan tövbə edib İslama qayıtsa belə ". Kəlamın sonu.

Bu da Sumənilərlə[14] münaqişə etdiyi zaman dindən bütövlüklə çıxmağı icazəli görmüş, namazı qırx gün tərk etmiş və öz batil məzhəbini qurmuşdur. Və burada məqsəd bundan ibarətdir ki, Şeyxülislam üzrü yalnız gizli məsələlərdə məhdudlaşdırmamışdır, lakin onun bu sözü müəyyən bir tayfa haqqındadır. Və artıq əvvəldə Şeyxülislamdan nəql etdik ki, şəri elmdən zəruri sayılan məsələlər nisbi bir məsələdir, şəxsdən şəxsə və həmçinin də zamandan asılı olaraq müxtəlif olur və dəyişir.

## Elmi (Etiqadi) Və Əməli Məsələlər Üçün Üzrün Ümumiliyi

Burada sənin üçün Şeyxülislamdan - onun məzhəbində elmi və əməli məsələlərdə üzrün ümumi olmasına dair - nəqlləri gətirməyə davam edəcəyik.

Məcmuu Fətəva 3-cü cild 229-cu səhifədə deyir: "Mənimlə olanlar daima mənim barəmdə biliblər ki, mən müəyyən bir şəxsi təkfirə, fasiqliyə və asiliyə nisbət etməkdə insanların ən şiddətli nəhy edəniyəm. Yalnız o haldan başqa ki, o şəxs barəsində artıq risali hüccətin – o hüccət ki, ona qarşı çıxan ya kafir, ya fasiq, ya da asi olur – qalxması bilinmişdir. Həmçinin mən iqrar edirəm ki, Allah təalə bu ümmətin xətasını bağışlamışdır və bu xəta da ümumi olaraq xəbəri, həmçinin də əməli məsələləri əhatə edir". [15]

---

[14] السمنية - Sumənilər Hindistanda olan ölümdən sonra dirilişi inkar edən, bütlərə ibadət edən bir firqədir. Həmçinin etiqadlarından: ölümdən sonra ruh birindən digərinə keçir, elm xəbəri yolla (vəhy yolu ilə)yox, hissi yolla öyrənilir. (əs-Sihəh. - tərc.)

[15] Dəvətinin bəzi düşmənləri bu sözü təhrif edərək bununla şeyx Muhəmməd İbn Abdul Vahhaba qarşı müəyyən şəxsi heç vaxt təkfir etməməyə dair dəlil gətirmişlər. Bundan da məqsədləri müəyyən şəxsə, hətta hüccət qalxmış olsa belə təkfir nisbət etməməkdir. Şeyx Muhəmməd İbn Abdul Vahhab da onlara qarşı şeyxülislam İbn Teymiyyədən əvvəldə gətirdiyimiz iki nəqllə rədd etmiş və demişdir: "Şeyxülislamdan bu məsələdə hər bir yerdə gördüyümüz sözü bundan ibarətdir ki, o, müəyyəni təkfir etməməyi zikr etdikdə, həmən an bu müşkülü aradan qaldıran bu sözü buna əlavə edir – müəyyən şəxsin təkfirində dayanmaqdan murad ona hüccət çatmasından əvvəlki vaxtdır. Və ona hüccət çatarsa,

Şeyxülislam bəyan etdi ki, cahil, etiqadi məsələlər sayılan xəbəri məsələlərdə və həmçinin də, əməli məsələlərdə də üzrlüdür. Belə ki, əgər şəriətə müxalif olan əməl uydurarsa, o, cahilliyinə görə üzrlü sayılır. Bu məsələdə bundan qabaq zikr etdiyimiz üzrə təfsilat vardır. Belə ki, əgər bu əməl oruc və ya namaz kimi şəriətdə əsli olmuş olarsa, lakin əməldə bidət olarsa, əməl sahibi cahil olduğuna görə bəzən savab da qazana bilər. Çünki oruc və namaz əsli şəriətdə olan ibadətlərdir. Amma bu əməl qəbir sahiblərindən kömək istəmək və onlarla təvəssül etmək kimi şirk cinsindən olmuş olarsa, əməl sahibi əvvəldə zikr etdiyimiz kimi, cahil olduğuna və bu əməlin ona bəzədilmiş olduğuna görə üzrlü bilinir, tənbeh və ya cəza verilmir, lakin o kəs bu əmələ görə savab da qazanmır. Nəzir və başqa Allaha yaxınlaşdıran əməllər kimi, çünki şirkdən olan heç bir şey heç vaxt şəriətdən sayılmır, əksinə ən şiddətli bir şəkildə qadağan olunur.

---

barəsində hüccət qaldırılan məsələnin tələb etdiyi hökmlə ona ya təkfir, ya fasiq, ya da asiliklə hökm verilir". Şeyx İbn Abdul Vahhab aydınlıq gətirdi ki, şeyxülislam İbn Teymiyyənin müəyyəni təkfir etməmək sözü, yalnız hüccət çatmasından əvvələ aiddir, heç də mütləq şəkildə deyildir. Sonra deyir: "Sonra İbn Teymiyyə bildirdi ki, onun sözü zahiri məsələlərdən başqasına aiddir" və sonra bizim əvvəldə gətirdiyimiz şeyxülislamın kəlam əhli barədə dediyi sözünü gətirir. Artıq sənə aydınlaşdırdım ki, şeyxülislam bununla məsələni məhdudlaşdırmaq istəməyib, əksinə onun sözü müəyyən bir tayfaya aid idi. Və həmçinin sənə əvvəldə nəql etdiyimiz kimi, şeyxülislam hətta şirki əməllərdə də üzrün olmasını açıqlamışdır və bildirdi ki, bir şeyin zahir olub-olmaması alimlə avam arasında və sünnə alimlərinin yayıldığı bir yerlə azdırıcı alimlərin öndə olduğu bir yer arasında dəyişir. Sonra şeyx Muhəmməd İbn Abdul Vahhab deyir: "Etiqad etdiyimiz, Allaha bununla ibadət etdiyimiz və Allahdan bunun üzərində bizi sabit saxlamağını dilədiyimiz budur ki, bu məsələdə - yəni hüccət çatdıqdan sonra müsəlmanın Allaha şərik qoşması və ya bunu tövhid əhlindən üstün tutması, yaxud bunda özünün haqq üzərində olmasını iddia etməsi, yaxud da bundan başqa Allah və rəsulunun, eləcə də, ümmətin alimlərinin bəyan etdiyi açıq-aşkar zahir olan küfr olan işlər - o və ya ondan daha böyüklər səhv etsələr belə mən, o kəsin təkfirində Allah və rəsulundan bizə gələnə iman gətirmişəm, kim səhv etsə belə". Kəlamın sonu. (deyildiyi kimi seyx İbn Abdul Vahhab burada müəyyən şəxsdən təkfiri ümumən inkar edənlərə qarşı bu rədləri verir və bildirir ki, hətta müəyyən şəxs də təkfir olunur, lakin hüccətdən sonra-tərc).

Məcmuu Fətəva 3-cü cild 345-346-cı səhifələrdə deyir: "Burada işin həqiqi mahiyyəti bundan ibarətdir ki, söz bəzən küfr olur və bu halda təkfir **ümumi olaraq** söz sahibinin təkfirinə nisbət olunur və deyilir ki, **kim belə deyərsə o, kafirdir. Lakin sözü deyən müəyyən şəxsə tərk edənin kafir olacağı hüccət qaldırılana qədər kafir hökmü verilməz.** Bu da hədə naslarında olduğu kimidir... Və sonra deyir: Beləcə də, o sözlər ki, onu deyən kəs küfr edir, bəzən ola bilsin ki, insana haqqı bilməyi vacib edən dəlillər çatmamış olur və bəzən də ona bu dəlilər çatmış, lakin o kəsdə bu dəlillər sabit olmamış olur və **bəzən də dəlilləri fəhm etməmiş olur** (başa düşməmiş olur) və bəzən də ona elə bir şübhələr ərz olunmuş olur ki, Allah təalə bu kəsi bu şübhələrə görə üzrlü bilir. Fərq etməz, istər nəzəri (etiqadi xəbəri-tərc) məsələlərdə olsun, istərsə də əməli məsələlərdə olsun, möminlərdən kim haqqı tələb etmək üçün ictihad edər və xəta edərsə, kim olur olsun, Allah təalə onun xətasını bağışlayar. <u>Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) səhabələri və İslam imamlarının cümhuru da bunun üzərində olmuşdur.</u> Onlar məsələləri inkar edənin küfr edəcəyi əqidəyə (üsula) və inkar edənin küfr etməyəcəyi əmələ (furuya) bölməmişdirlər". Kəlamın sonu.

## <u>Təkfir Məsələlərində Ümumi İlə Müəyyən Arasında Fərq Qoymaq</u>

Məcmuu Fətəva 28-ci cild 500-501-ci səhifələrdə bəzi azğın, həddi aşmış firqələri pisləyərək deyir: "Onların təkfiri və Cəhənnəmdə əbədi qalmaları barəsində alimlərdən iki məşhur rəy vardır, bu ikisi də İmam Əhmməddən rəvayət olunmuşdur və bu iki rəy xavariclər, hərurilər, rafizilər və bunlara bənzərlər barəsindədir.

Səhih budur ki, onların peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyinə müxalif olduğu bilindiyi sözləri küfrdür. Və

həmçinin də onların kafirlərin müsəlmanlara etdikləri işlərin cinsindən olan əməlləri də küfrdür. Bunun da dəlillərini bir çox yerdə artıq zikr etmişəm. **Lakin onlardan müəyyən bir kəsin təkfiri və onun Cəhənnəmdə əbədi qalacağına hökm vermək təkfirin şərtlərinin sabit olmasına və maneələrin aradan qalxmasına bağlıdır. Biz danışdıqda vəd, vəid, təkfir və təfsiq[16] barəsində sözü ümumi deyirik və müəyyən bir şəxsin bu ümumiliyə girməyinə hökm vermirik, ta ki, onun barəsində heç bir etirazla qarşılaşmayan tələblər olana qədər.** Artıq bu qayda barəsində "Təkfir qaydası"-nda geniş danışmışam.[17] Buna görə də

---

[16] Vəd yəni – Cənnəti vəd edən naslar, vaid– Cəhənnəmlə hədələyən naslar, təfsiq insanın fasiqliyinə hökm vermək (tərc.)

[17] Yəni deyilir ki, kim belə deyərsə, o kafir və kim belə edərsə, o müşrikdir. Misal üçün deyilir ki, kim Allahın səmada olmasını inkar edərsə, o kafir, kim qəbirdə olanlardan kömək istəyərsə, onlara nəzir edərsə, müşrikdir. Bütün bunlar ümumi olan sözlərdir. Amma o ki qaldı insanlardan olan müəyyən bir şəxs bu sözü deyər və ya bu əməli edərsə, onun üzərinə hüccət qaldırmaq üçün təkfirin şərtləri cəm olmayınca, yaxud bu əməli elmlə haqq üzrə və ya düşmənçiliklə etməsi bilinməyincə, onun barəsində kafir hökmü verilməz. Bu da təkfirdə ümumi ilə müəyyənin arasında olan fərqdir**. Amma o ki qaldı şeyx Muhəmməd İbn Abdul Vahhab və onun bəzi övladları şeyxülislamdan müəyyən şəxsi təkfir etməsinə dair etdikləri nəqllərə gəlincə isə, bütün bunlar şeyxülislamdan zikr etdiyimiz bu qaydanın üzərində cərəyan edir və ya hüccətin o şəxs barəsində sabit olmasından sonraya, yaxud haqdan xəbərdar olduqları və haqqa düşmənçilik etdikləri bilinənlərə aid edilir.** Əvvəldə şeyxülislamdan açıq-aydın dindən çıxan və qəbirlərə, ulduzlara ibadətə çağıranlar barəsində kəlamını gətirdiyimiz kimi. Həmçinin, Şeyx İbn Abdul Vahhab yazdığı kitablarda müəyyən şəxsin yalnız hüccət qalxdıqdan sonra təkfirini zikr etmişdir. Bu baxımdan Şeyx Suleyman İbn Səhmən şeyxi müdafiə edərək deyir:

Muhəmmədin dini üçün düşmənçilik etdi,
Küfrlə batilini yayanı da təkfir etdi.
Onlara bundan öncə hüccət çatmışdır,
Üzərilərinə kifayət qədər dəlillər qalxmışdır.

Və şeyxülislamdan hüccət qaldırılana qədər ümumi hökmlə müəyyənə verilən hökm arasında fərq qoymaq barəsində naslar çoxdur. 3-cü cild 230-cu səhifədə deyir: "Mən onlara bəyan edirdim ki, sələflərdən və imamlardan nəql olunmuş "Kim belə deyərsə o, kafirdir" kimi ümumi deyilmiş sözlər də, həmçinin haqdır. **Lakin ümumi ilə müəyyənin arasında fərq qoymaq vacibdir**". 7-ci cild 619-cu səhifədə deyir: "Və bu məsələdə həqiqi mahiyyət bundan ibarətdir ki, söz bəzən küfr olur - necə ki, Cəhmilərin dedikləri "Allah danışmır", "Allah Axirətdə görülməyəcək" kimi sözləri - lakin bəzi insanlara bu sözlərin küfr olması

***"Mən öldükdə məni yandırın və dənizə atın. Allaha and olsun ki, əgər Allah məni diriltməyə qüdrəti çatarsa, mənə elə bir əzab verəcək ki, aləmlərdən heç kimə belə bir əzab verməyib"***[18] deyən kəsin Allahın qüdrətinə və onu qaytarmağına şəkk etməyi ilə yanaşı peyğəmbər (sallAllahu aleyhi və səlləm) onun küfrünə hökm vermədi.[19] Və buna görə də alimlər haramlardan hər hansı

---

bəlli olmur. Belə olduqda ümumi deyilir ki, bunu deyən kafirdir. Necə ki, Sələflər demişdirlər ki, "Kim desə ki, Quran məxluqdur, o kafirdir", "Kim desə ki, Allah Axirətdə görülməyəcək, o kafirdir" və müəyyən şəxs isə ona hüccət qalxmayana qədər təkfir olunmaz, necə ki, əvvəldə keçdiyi kimi namazın və zəkatın vacibliyini inkar edənin misalı kimi...". Sonra isə Allahın əzabından qaçmaq üçün özünün yandırılmağını övladlarına əmr edənin qissəsini gətirir. 23-cü cild 348-ci səhifədə övladlarına "məni yandırın" deyərək əmr edənin qissəsini gətirdikdən sonra deyir: **"Burada məqsəd bundan ibarətdir ki, imamların məzhəbi ümumi ilə müəyyənin arasında fərq qoymaq üzrə bina olunmuşdur. Buna görə də bəziləri məsələdə ixtilaf rəvayət etmiş, lakin imamların sözlərinin həqiqətini, özəyini başa düşməmişlər".** Necə ki, bəziləri şeyxülislamdan və başqalarından bu məsələdə sözlər nəql etmiş, lakin onların məzhəblərinin həqiqətini anlamamışlar. Beləliklə də, əvvəldə bəzi bəyan etdiyimiz ziddiyyətləri gətirmişlər. Sonra şeyxülislam deyir ki, İmam Əhməd Cəhmilərin təkfirində sözü ümumi demiş, lakin bəyan etdiyimiz kimi, onların fərdlərini təkfir etməmişdir. şeyxülislam deyir: "Həmçinin Hafs "Quran məxluqdur" dedikdə, İmam Şafii ona "Sən Allaha küfr etdin" deyərək, ona bildirdi ki, bu söz küfr sözdür və mücərrəd olaraq buna görə Hafsın dindən çıxdığına hökm vermədi, çünki ona kafir olacağı hüccət bəyan olmamışdır. Əgər onun mürtəd olduğunu etiqad etsəydi onun qətlinə səy edərdi (qazilərin və hakimlərin yanında, çünki o, sözü eşidilən imam idi) və İmam Şafii öz kitablarında hava əhlinin şəhadətinin və onların arxalarında qılınan namazın qəbulunu açıq-aydın bildirmişdir". Kəlamın sonu.

İmam Şafiinin bu sözü ümumi deməsi onun müəyyənə hökm verməsini göstərmir. Çünki bu sözünün üzərində heç bir hökm tərtib etmədi, əksinə, o, hava əhlinin arxasında namaz qılmağı icazəli görürdü. Bu söz yalnız küfr əməllərə qarşı imamdan öz məzhəbinin həqiqətini müxalifə bəyan etmək yerində olan bir söz idi ki, bu əməllərdən çəkinsinlər. Bu kimi yerlərdə bu cür danışmaq, yəni küfrü təyin etmək caizdir, əksinə bəzi hallarda müxalif kəsdən küfr zənn edərək hər hansı bir şey üçün ictihad edərək təkfirlə sözü ona aid edilməsi baş verir və ictihad edən bunda təvil etdiyinə görə günah qazanmır. Necə ki, Ömər (radıyAllahu anhu) səhabə Hatib (radıyAllahu anhu) Qureyş əhlinə məktub göndərdikdə dedi: "İzn ver onun boynunu vurum, o münafiqdir". Bu məsələ isə başqa bir məsələdir, ona sadəcə işarə etmək istədim, bunun geniş açıqlama yeri isə bura deyildir.

[18] Buxari, Muslim.

[19] İbn Teymiyyə və həmçinin də Əbu Muhəmməd İbn Həzm cahilə yalnız hüccətdən sonra əzab veriləcəyinə dair bu hədislə çox dəlil gətiriblər. Alimlərin bu hədisə bir çox təfsirləri

bir şeyi halallaşdıran kəsi İslamda yeni olduğuna və ya uzaq yerlərdə böyüdüyünə görə təkfir etmirlər. Həqiqətən, küfr hökmü yalnız risalə və şəriət çatdıqdan sonra verilir. Bəzən bu kimi

---

vardır, bunlardan da İbn Teymiyyədən, İbn Həzmdən və başqalarından zikr etdiyimiz təfsirdir ki, bunda da deyirlər ki, o, Allahın qüdrətindən elmsiz idi, lakin ona əzab vermədi, əksinə cahilliyinə görə üzrlü bildi. Və beləcə də Allah təalə onun başqa günahlarını da bağışladı. Başqaları isə hədisin zahirinə müxalif olan başqa yozumlar vermiş, onları da bu yozumlara aparan, sənə zikr etdiyim kimi, yalnız bu fuqahanın üsulların çoxunu kəlam əhlindən götürmələri olmuşdur. O kəlam əhli ki, Allahın sifətləri məsələsində, bu məsələni öyrənməkdə, bilməkdə, hüccətin nədən ibarət olmasında, bu məsələdə və ya bu məsələnin bəzisində cahil olanın hökmündə ixtilaf etmişdirlər. İbn Həzm bu hədisin zahirinə xilaf olanlara qarşı çox sərt davranmışdır. Lakin lazımdır ki, bu təfsirlərdən ən doğru olanına əməl olunsun və bunu da bilmək hədisin özünə, onun gedişatından qəsd olunan şeylərə və hədisdəki kəlimələrin dəlalət etdiyi mənalara qayıtmaqla mümkündür. Doğru təfsir də bu şeylərdən hansına müvafiq olarsa, odur. Amma o ki qaldı hədisdəki "Allah məni qaytarmağa qadir olarsa, mənə elə bir əzab verər ki," sözünün “əzabla mənə əzab verər” və ya “əzabla məni öldürər” mənasında olduğunu deyənlərə gəldikdə isə, belə olduqda məna "Allah məni əzabla öldürsə mənə əzab verər" kimi olur ki, bu halda isə məna düz gəlmir . Və həm də onun öz övladlarına onu yandırmalarını və külünü səpmələrini əmr etməsinin də bir mənası olmur. Və həmçinin deyənlər ki, o, bununla öz nəfsini cəzalandırmış və ya bu əvvəlki bəzi şəriətlərdə günahlara kəffarə idi, bütün bunlar bu mənaları verənlər üçün haradan sabit olmuşdur? Əgər belə idisə, onda onun özünü yandırılmasını əmr etməsi kifayət edərdi. Öz övladlarına onun külünün küləkli bir gündə quruya və dənizə səpmələrini əmr etməsi və bütün bunları da qüdrət ləfzi ilə yanaşı işlətməsinin mənası yalnız və yalnız bu şeylərin onu Allahın əzabından xilas etməsini zənn etməsi mənasındadır. Hədisə verilən başqa bir yozum isə budur ki, bu şəxs də dəvə sahibi kimi dəhşət və heyrət içində idi. Və həmçinin bu məna da düz gəlmir. Çünki dəvə sahibi o sözü yalnız şiddətli sevinc səbəbilə, xəta olaraq dilinin çaşması, dilinin dolaşması səbəbi ilə demişdir. Belə hallarda dil dolaşır və çaşır. O biri isə, öz ailəsinə elə bir tərtib olunmuş əmrlər etmişdir ki, bu, əmr etdiyi şeylərin özünü qurtaracağını etiqad etməsini göstərirdi. Heyrət isə bu etiqaddan doğmur. **Sonra hədisin cərəyanı və qüdrət ləfzinin külün dağıdılması və səpilməsinin əmr olunması ilə yanaşı bir yerdə işlədilməsi, bunların hamısı göstərir ki, hədisdə qəsd olunan, cahilin də daxil olduğu Allah təalənin məğfirətinin genişliyinin bəyanıdır,** hətta bu, Allahın sifətlərindən hər hansı bir sifətdə olsa belə. Və beləliklə də birinci gətirdiyimiz mənanın doğru olmasında heç bir əngəl qalmır. Allah daha doğrusunu bilir. Və burada fərqi yoxdur, istər cahillik sifət məsələlərində olsun, istərsə də qeyrisində. Murad budur ki, Allah təalə cahili yalnız hüccət çatdıqdan sonra cəzalandırır. Bu məsələdə bunun kimi olan dəlillər zənni dəlillər sayılır, lakin irəlidə başqa dəlillər toplusu üzərində danışdıqda bu məsələdə bu qaydanı (dəlillərin nə vaxt zənni və nə vaxt qəti olmasını - tərc.) sənin üçün aydınlaşdıracağıq.

insanlardan çoxuna özünün rəyinə müxalif olan naslar çatmamış olur və rəsulun bununla göndərilmiş olduğunu da bilmir. Belə olduqda ümumi deyilir ki, bu söz küfrdür və o kəs ki, ona tərk edənin təkfir olunacağı hüccət qalxmışdır, o kafir olur, bundan başqası isə yox. Allah daha doğru bilir". Kəlamın sonu.

3-cü cild 231-ci səhifədə deyir: "Təkfir hədə cinsindəndir. Ola bilsin ki, söz peyğəmbərin (sallAllahu aleyhi və səlləm) dediyini yalan saymaq olsun, lakin bəzən insan İslamda yeni olduğuna və ya (alimlərdən) uzaqda yaşadığına görə bunun mislində olan insanlar, hətta ona hüccət qaldırılanadək etdiyi inkara görə təkfir olunmaz. **Bəzən də, insan həmin dəlilləri eşitməmiş olar və ya eşidib**, lakin onda bunlar sabit olmamış və ya bu dəlillərə, hətta xətakar olsa belə təvili vacib edən bir etirazla qarşı çıxa bilər. Buxari və Muslimdə olan o kişinin hədisini daim xatırlayıram:***"Mən öldükdə məni yandırın, sonra külümü dağıdın və dənizə səpələyin. Allaha and olsun ki, əgər Allah təalə məni diriltməyə qüdrəti çatarsa, mənə elə bir əzab verər ki, aləmlərdən heç bir kimsəyə belə bir əzab verməyib. Və onlar da bunu etdilər, Allah təalə ona dedi: "Bunu etməyə səni nə vadar etdi?" Dedi ki, Səndən qorxmağım. Allah da onu bağışladı".*** Bu insan Allahın qüdrətində və külü səpildikdən sonra onu dirildə biləcəyində şəkk etmişdir. Əksinə etiqad edirdi ki, o qaytarılmayacaq, dirildilməyəcəkdir. Bu isə müsəlmanların ittifaqı ilə küfrdür. Lakin o cahil idi, bunu bilmirdi və eyni anda da mömin olaraq Allahın onu cəzalandırmasından qorxurdu, buna görə də Allah onu bağışladı. İctihad əhlindən olan təvilçilər, yozum verənlər və peyğəməbərə (sallAllahu aleyhi və səlləm) tabe olmağa həris olanlar bağışlanmağa bu kişidən daha layiqdirlər". Kəlamın sonu.

22-ci cild 41-42-ci səhifələrdə mükəlləf insana Allah və rəsulu tərəfindən gələn xitab çatmazdan öncə hökmün ona sabit olub-olmaması haqqında olan ixtilafı zikr etdikdən və sonra da hökmün yalnız xitab çatdıqdan sonra sabit olmasını isbat etdikdən sonra

deyir: "Hökm Allah təalənin bu sözünə görə yalnız dəlil çatdıqdan sonra sabit olur:

وأُوحِيَ إِلَيَّ هَٰذَا الْقُرْآنُ لِأُنْذِرَكُمْ بِهِ وَمَنْ بَلَغَ

***Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim.***[20]

Həmçinin:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

***Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik!***[21]

Həmçinin

لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

***Daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.***[22].

Quranda bu kimi ayələr çox saydadır. Allah təalə bəyan edir ki, heç bir kəsə hətta peyğəmbərin gətirdiyi ona çatmamış azab verməz.[23] Və kim əgər Muhəmmədin (sallAllahu aleyhi və səlləm)

---

[20]Ənam surəsi 19.

[21] Isra surəsi 15.

[22] Nisə surəsi 165.

[23] Özünə rəsul gəlməyən kəsin məsələsi isə - hansı ki, bunlar fətra əhli sayılırlar (yəni peyğəmbərlər arasındakı boşluq dövr əhli - tərc.) - bizim danışdığımız bu məsələdən, yəni müsəlmanlardan olan cahillərin məsələsindən deyildir. Bəziləri artıq, müsəlmanların cahillərinin məsələsini fətra əhli məsələsində daraldıblar ki, bununla müsəlmanların cahilləri üçün üzr görməməyə keçid etsinlər. Halbuki bunda da, haqq və düzgünlük budur ki, o kəslərə ki, rəsul gəlməyib və şəriət onlara çatmayıb, həmin kəslərə də əzab verilməz. Burada təfsilata varmaq risaləmizi öz məqsədindən uzatsa da, bəzi nəqllərə diqqət yetirməyə heç bir maneə yoxdur. İbn Teymiyyə Məcmuu Fətəva 2-ci cild, 78-ci səhifədə fəlsəfəçilərdən, həmçinin onların öz ağılları ilə etdikləri təsəvvür və zənlərdən danışarkən deyir: "Onlardan heç biri buna Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi şəri nasları əlavə etmir. Ya buna risalənin ziddini əlavə edir, ya da, heç bir şey əlavə etmir. Əgər buna rəsulun gətirdiyinin əksini əlavə edərsə, onda o, risaləni yalanlayır ki, bu da mürəkkəb küfrdür. Yox əgər heç bir şey əlavə etməzsə, onda bəsit küfrdə qalır (yəni, ya haqqı etiqad etmir ki, bu bəsit küfrdür, ya da, haqqı etiqad etməməklə yanaşı onun əksini etiqad edir ki, bu da mürəkkəb küfrdür). Fərq etməz, istər şübhədə olsun, istər üz döndərməkdə (erad), istərsə də, qəflətdə. Kafirin halı bundan ibarətdir ki, o, risaləni ya təsəvvür edir, ya da təsəvvür etmir. Əgər onu təsəvvür etmirsə, onda o qəflətdədir və ona iman gətirməyib. Necə ki, Allah təalə deyir:

وَلَا تُطِعْ مَنْ أَغْفَلْنَا قَلْبَهُ عَنْ ذِكْرِنَا وَاتَّبَعَ هَوَاهُ وَكَانَ أَمْرُهُ فُرُطًا

***Qəlbini Bizi anmaqdan qafil etdiyimiz, nəfsinin istəklərinə uyan və işləri səmərəsiz olan bir kimsəyə itaət etmə! (Kəhf 28)***

Həmçinin deyir:

فَانْتَقَمْنَا مِنْهُمْ فَأَغْرَقْنَاهُمْ فِي الْيَمِّ بِأَنَّهُمْ كَذَّبُوا بِآيَاتِنَا وَكَانُوا عَنْهَا غَافِلِينَ

***Biz də ayələrimizi yalan hesab edib onlardan qafil olduqları üçün (Firon əhlindən) intiqam alaraq onları dənizdə batırdıq. (Əraf 136).***

Lakin sırf, tam olan qəflət yalnız risalə çatmayan bir kəsdə olur və sahibinə əzab verilən küfr isə yalnız risalə çatdıqdan sonra olur.

"İmam Şinqiti "Ədvaul bəyan" kitabında 2-ci cild 201-202-ci səhifələrdə deyir: Quran ayələri çoxluqla açıq-aydın bir şəkildə bildirir ki, Allah təalə heç bir kəsə rəsullar göndərməklə hüccət qaldırmamış əzab verməz. Bu da Allah təalənin Öz kovni ayətləri ilə - yerləri və göyləri yaratması ilə və qəribə, ecazkar məxluqlar var etməsi ilə, həmçinin insanda fitrət sabit etməsi ilə kifayətlənməməsini göstərir. Buna da dəlil Allah təalənin bu sözüdür:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

***Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik! (İsra 15).***

Allah təalə burada (peyğəmbər göndərməmiş) deyir, ağıllar və fitrət yaratmamış əzab vermərik demir. Və həmçinin buyurur:

رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

***Biz peyğəmbərləri (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. (Nisə 165).***

Allah təalə açıq-aydın bildirdi ki, insanların üzərinə hüccətin qalxması və onların üzrünün kəsilməsi, onları ağıl və fitrət üzrə yaratması ilə deyil, rəsulların göndərilməsi ilə olmuşdur. Ayədə keçən və rəsulların da onu aradan qaldırmaq üçün göndərildikləri - "**bəhanə**"-ni (əgər rəsullar göndərilməsəydi, insanların gətirəcəkləri bəhanə) Allah təalə Tahə surəsində bu cür bəyan etmişdir:

وَلَوْ أَنَّا أَهْلَكْنَاهُمْ بِعَذَابٍ مِنْ قَبْلِهِ لَقَالُوا رَبَّنَا لَوْلَا أَرْسَلْتَ إِلَيْنَا رَسُولًا فَنَتَّبِعَ آيَاتِكَ مِنْ قَبْلِ أَنْ نَذِلَّ وَنَخْزَىٰ

***Əgər Biz onları bundan əvvəl (Muhəmməd Peyğəmbər və Quran gəlməzdən öncə) əzabla məhv etsəydik, deyərdilər: "Ey Rəbbimiz! Nə üçün bizə bir peyğəmbər göndərmədin ki, biz də zəlil və rüsvay olmazdan əvvəl Sənin ayələrinə tabe olaq?" (Tahə 134)***

və həmçinin buna Qasas surəsində də işarə edir:

وَلَوْلَا أَنْ تُصِيبَهُمْ مُصِيبَةٌ بِمَا قَدَّمَتْ أَيْدِيهِمْ فَيَقُولُوا رَبَّنَا لَوْلَا أَرْسَلْتَ إِلَيْنَا رَسُولًا فَنَتَّبِعَ آيَاتِكَ وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ

***Özlərinin etdikləri əməllərə görə onlara bir müsibət üz verdikdə: "Ey Rəbbimiz! Nə üçün bizə bir peyğəmbər göndərmədin ki, biz də Sənin ayələrinə tabe olub möminlərdən olaq?"– deməsəydilər, (səni peyğəmbər göndərməzdik). (Qasas 47).***

Allah təalə açıq-aydın bildirir ki, Cəhənnəm əhlinin hamısının üzrü dünyada ikən rəsulların göndərilməsi ilə kəsilmişdir. Onlara kovni dəlilləri ərz etməklə kifayətlənməmişdir. Necə ki, bu ayələrdə buyurur:

كُلَّمَا أُلْقِيَ فِيهَا فَوْجٌ سَأَلَهُمْ خَزَنَتُهَا أَلَمْ يَأْتِكُمْ نَذِيرٌقَالُوا بَلَىٰ قَدْ جَاءَنَا نَذِيرٌ فَكَذَّبْنَا وَقُلْنَا مَا نَزَّلَ اللَّهُ مِنْ شَيْءٍ إِنْ أَنْتُمْ إِلَّا فِي ضَلَالٍ كَبِيرٍ

***Hər dəfə bir dəstə oraya atılarkən (Cəhənnəmin) gözətçiləri onlardan soruşacaqlar: "Məgər sizə xəbərdarlıq edən (bir peyğəmbər) gəlməmişdi?" Onlar deyəcəklər: "Əlbəttə, bizə***

***qorxudan (bir peyğəmbər) gəlmişdi. Amma biz (onu) yalançı sayıb: “Allah heç bir şey nazil etməyib, siz də ancaq böyük bir azğınlıq içindəsiniz”– demişdik. (Mülk 8-9)*** və həmçinin
**وَسِيقَ الَّذِينَ كَفَرُوا إِلَىٰ جَهَنَّمَ زُمَرًا حَتَّىٰ إِذَا جَاءُوهَا فُتِحَتْ أَبْوَابُهَا وَقَالَ لَهُمْ خَزَنَتُهَا أَلَمْ يَأْتِكُمْ رُسُلٌ مِنْكُمْ يَتْلُونَ عَلَيْكُمْ آيَاتِ رَبِّكُمْ وَيُنْذِرُونَكُمْ لِقَاءَ يَوْمِكُمْ هَٰذَا قَالُوا بَلَىٰ وَلَٰكِنْ حَقَّتْ كَلِمَةُ الْعَذَابِ عَلَى الْكَافِرِينَ**

***Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcəklər. Nəhayət, ora çatdıqda onun qapıları açıq olacaq və onun gözətçiləri onlara deyəcəklər: “Məgər öz içərinizdən Rəbbinizin ayələrini sizə oxuyan və sizi bu gününüzə qovuşacağınızla xəbərdar edən elçilər gəlməmişdi?” Onlar: “Əlbəttə, (gəlmişdi!)” deyəcəklər. Lakin əzab Sözü kafirlər barəsində gerçəkləşdi (Zumər 71).***

Məlumdur ki, **كُلَّمَا أُلْقِيَ فِيهَا** (Hər dəfə bir dəstə oraya atılarkən) sözündəki **كُلَّمَا** (Hər dəfə) sözü və **وَسِيقَ الَّذِينَ كَفَرُوا** (kafir olan kəslər (cəhənnəmə) sürüklənəcəklər) sözündəki **الَّذِينَ** (o kəslər ki) sözü ümumilik bildirir, çünki aid olduğu hər bir şeyi əhatə edir". Kəlamın sonu.

Həmçinin İbn Qeyyim "Ruh kitabı"nda on səkkizinci məsələdə
**وَإِذْ أَخَذَ رَبُّكَ مِنْ بَنِي آدَمَ مِنْ ظُهُورِهِمْ ذُرِّيَّتَهُمْ** ***(Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış) (Əraf 172)*** ayəsinin təfsirində birinci qövlü zikr etdikdə ruhların cəsədlərdən öncə və ya sonra yaranması haqqında danışaraq hər iki tərəfi və onların dəlillərini zikr edir, sonra ruhun cəsəddən öncə yaranmasına dəlalət edən əsərlərə və buna dəlalət edən səhih əsərlərin olmamasına işarə edir. Və ikinci tərəfin (yəni, cəsədin ruhdan öncə yaranmasını deyənlərin - tərc.) dilindən deyir:

"Zikr olunan əsərlər yalnız keçmiş üzrün isbatına dəlalət edir və bəzisi isə göstərir ki, Allah təalə onların oxşarında, mislindəkiləri çıxartdı və xoşbəxtlərlə bədbəxtləri ayırdı. Amma o ki, qaldı Allahın onlara xitab etməyi, onlardan cavab tələb etməyi və onların da Allahın rububiyyətini iqrar etmələri, həmçinin öz əleyhlərinə olaraq Onun uluhiyyətinə şəhadət etmələri - bunu sələfdən kimsə deyibsə də, sadəcə ayədən başa düşdüyü fəhmə əsasən deyib, ayə isə buna dəlalət etmir, əksinə olaraq bunun əksinə dəlalət edir". Kəlamın sonu.

Sonra zikr edir ki, ayədə dörd məqam vardır:

**(Birinci məqam)** Allah təalə onların oxşarında, mislindəkiləri çıxartdı və xoşbəxtlərlə bədbəxtləri və afiyətdə olanlarla müsibətdə olanları seçdi. Və sonra deyir: "Birinci məqama aid olan əsərlər Peyğəmbərdən və səhabələrdən açıq aydındır".

**(İkinci məqam)** bundan ibarətdir ki, Allah təalə həmin vaxt onların üzərinə hüccət qaldırmış və onları Öz rububiyyətinə şahid tutmuş və mələkləri də onların üzərinə şahid etmişdir. İbn Qeyyim deyir: "Amma ikinci məqama gəldikdə isə, təfsirçilər ayədən bu ikinci məqamı götürmüş və zənn etmişlər ki, ayənin təfsiri elə budur. Bu da əsər əhlindən olan təfsirçilərin cümhurunun rəyidir. Sonra bu rəyi deyənlərdən biri olan Curcənidən nəql edir ki, bu fəsildə hasil olan fayda bundan ibarətdir ki, Allah subhənəhu və təalə həddi buluğa çatmış və çatmamış hər bir nəfs verilmiş kəsə onlardan aldığı misaqla, əhdlə hüccəti isbat etmişdir. Onlardan həddi buluğa çatana öz nəfsində və aləmlərdə qoyduğu kovni ayətlərlə, dəlillərlə və onlara göndərilmiş müjdələyən və qorxudan rəsullarla, həmçinin xəbərləri onlara misal olaraq nəql olunmuş moizələrlə onlara olan hüccətini artırmışdır. Bundan savayı, Allah təalə onlardan hər bir kəsdən yalnız hüccətdən ona lazım, vacib olan qədər, hər bir kəsə vermiş olduğu qüdrət və dəlillər qədəri ilə itaət tələb edir. Həmçinin əmr və qadağalara yetişmiş həddi buluğa çatmış insanlarda amilin nədən ibarət olmasını bəyan etmişdir..." Kəlamın sonu.

(Bəyan etdi ki, Allah təalə göndərdiyi ayətlər və rəsullarla hüccəti artırmışdır, quldan tələb olunan itaətlər də hüccətdən ona çatan qədərindədir. Lakin bu təfsirə görə birinci misaq (əhd) kifayətdirmi? Artıq sən İmam Şinqitinin verdiyi açıqlama ilə bu məsələdə haqqı bildin). Sonra Curcəni özünə müxalif olanlardan danışaraq (İkinci məqamda) deyir:
**وَإِذْ أَخَذَ رَبُّكَ** ***(Bir zaman Rəbbin (misaq) almışdır) (Əraf, 172)*** ayəsinin mənası budur ki, onları atalarının bellərindən çıxarmış, eləcə də, onlara göstərdiyi ayətlər və dəlillərlə onları Öz rububiyyətinə şahid tutmuş və onlar da buna şahid olmuşlar, həmçinin də özlərinin əleyhinə şahid tutulmuşlar. Və sonra bu ikinci rəyin sahiblərinin dəlillərindən zikr edərək deyir: " **وَإِذْ أَخَذَ رَبُّكَ** (Bir zaman Rəbbin (misaq) almışdır) (Əraf, 172) – ayəsinin yozumu bu olacaq ki, **وَإِذْ يأخذ رَبُّك** Rəbbin (misaq) alır və həmçinin **وَأَشْهَدَهُمْ عَلَىٰ أَنْفُسِهِمْ** (onları özlərinin əleyhinə şahid tutmuşdur) sözünün yozumu **وَيشهدهُمْ عَلَىٰ أَنْفُسِهِمْ** onları özlərinin əleyhinə şahid tutur (yəni ayədə zikr olunan fellər keçmiş zamana dəlalət edir, verilən yozum isə indiki zamanda cərəyan edir-tərc.) – yəni onları özlərinin əleyhinə onlara verdiyi ağıllarla şahid tutur, o ağılla ki, onunla fəhm edirlər və o ağılla da savab və əzab vacib olur. Hər bir kəs ki, doğular və həddi buluğa çatar, xeyiri və zərəri əql edər, hədəni, müjdəni, savabı və əzabı fəhm edər, başa düşər, sanki Allah təalə ona vermiş olduğu ağılla və ona göstərdiyi kovni ayət və dəlillərlə ondan tövhiddə misaq (əhd) almış olar". Kəlamın sonu.
Curcəninin danışdığı bu sözlər İbn Qeyyimin sözü yox, özünə müxalif olanlardan etdiyi bir nəqldir, necə ki, imamların sözlərini başa düşməyən bəzi kəslər bunu İbn Qeyyimin adından nəql etmişlər. **Misaq məsələsində mənbələrdən nəql edənlərin çoxu və bu mənbələrin sahibləri deyirlər ki, bu misaq öz-özlüyündə kifayət deyildir, insanların onun əsasında hesab olunacaqları hüccət məhz rəsullardır.** Necə ki, bunu da inşə Allah risaləni oxuduqda görəcəksən.)
İbn Qeyyim Curcəninin sözünə müxalif olan ikinci rəyi tərcih edərək deyir: "Əraf surəsi Məkkə surəsi olduğu üçün orada Allahın rububiyyətini, təkliyini və şirkin batilliyini iqrar edən bütün mükəlləflər üçün əhdü-peyman, misaq və ümumi bir şahid tutulma zikr olunmuşdur. Və bu elə bir misaqdır ki, onunla insanlara hüccət qalxır, onunla üzr kəsilir, onunla əzab halal olur və ona müxalif olmaqla həlak haqlı olur. Belə olduqda isə labüddür ki, insanlar o misaqı xatırlasınlar, onu tanısınlar və bilsinlər. Bu misaq Allahın insanları Öz rububiyyətini – onların Rəbbi və Xaliqi olmasını və insanların da Onun məxluqatı olmalarını iqrar etmək üzrə yaratdığı fitrətdir. Sonra onların fitrətlərində və ağıllarında olanları onlara xatırladan, Allahın onların üzərində olan haqqını, əmr və qadağalarını, Cənnət və Cəhənnəmini onlara öyrədən, tanıtdıran rəsullar göndərib. Ayənin öz nəzmi məhz buna bir neçə yöndən dəlalət edir". Sonra İbn Qeyyim bu bir neçə yöndən olan dəlalətləri sadalamağa başlayır. Və işarə etdiyimiz bu kəs isə bu kəlamı kəsib çıxarmış və rəsulların göndərilməsi məsələsini silərək zikr etməmişdir. Az sonra sən açıq aydın bir şəkildə onun yalançı olduğunu görəcəksən. Çünki o, özünün xeyrinə zənn etdiyi şeyi – amma bu heç də belə deyildir – seçib gətirir və kimdən ki, nəql edir, onun məzhəbini haqq olduğu halda tərk edir.
Ayənin təfsirinə İbn Qeyyimin dediyi bir çox tərəfdən olan dəlalətlərdən - İbn Qeyyimin öz görüşü də məhz budur – beşincisi: Allah subhənəhu və təalə xəbər verir ki, bu şahid tutmadakı hikmət insanlara hüccət qaldırmaqdır ki, Qiyamət günü deməsinlər ki, biz

bundan qafil qalmışdıq. Onların üzərinə hüccət isə yalnız rəsullarla və üzərində yaradıldıqları fitrətləriylə qalxmışdır. Necə ki, Allah təalə deyir:

رسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

***Biz peyğəmbərləri (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. (Nisə 165).*** Və həmçinin bu dəlalətlərdən: (Səkkizinci) Allah təalə onlardan xəbər verərək deyir:

أَفَتُهْلِكُنَا بِمَا فَعَلَ الْمُبْطِلُونَ

***"Məgər bizi batilə uyanların (haqq yoldan sapanların) törətdikləri əməllərə görəmi məhv edəcəksən?"***, yəni əgər onlara inkarlarına və şirklərinə görə əzab vermiş olsaydı, onlar belə deyərdilər. Allah təalə isə onları yalnız rəsullarına qarşı çıxdıqlarına və onları yalan saydıqlarına görə həlak etmişdir. Əgər onları üzərilərinə rəsullarla hüccət qaldırmadan, şirk əməllərində atalarına təqlid etdiklərinə görə həlak etsəydi, onda onları batil əhlinin etdiyi əməllərə görə həlak etmiş olardı və ya onları üzərində olduqları əməllərinin batilliyini bilmədikləri halda, ondan qafil olduqları halda həlak etmiş olardı. Artıq Allah təalə xəbər vermişdir ki, O, məmləkətlərin əhalisini, onlar qafil ola-ola (özlərinə peyğəmbər gəlmədiyi üçün dini vəzifələrini bilməyib icra etmədikləri halda) zülmlə məhv etməyi özünə rəva bilməz! Onları yalnız üzərilərindən üzr qaldırdıqdan və xəbərdar etdikdən sonra həlak edər". Kəlamın sonu. (İbn Qeyyimin "Ruh" kitabından).

İbn Kəsir ayəyə İbn Qeyyimin seçdiyi rəyi tərcih edib, xitam verərək deyir: "Deyirlər: "Bundan (yəni misaqdan, əhddən) murad budur ki, bu misaq, insanların şahid tutulmasını şirk məsələsində onların əleyhinə hüccət etmiş olsaydı - necə ki, bəziləri belə deyirlər - onda bu misaqın insana qarşı hüccət olması üçün hər bir kəsin onu xatırlaması lazım olardı (və məlumdur ki, biz elə bir kəs tanımırıq ki, o, yaradılışdan qabaq olan bu şahid tutulmanı xatırlasın. Xəbər səhih olduqda isə biz onu Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) yolu ilə təsdiq edirik və belə olduqda da hüccət ona qayıdır). Əgər deyilsə ki, Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) bunu xəbər verməyi öz-özlüyündə hüccətin olması üçün kifayətdir, onda cavab bu olar ki, müşriklərdən yalan sayanlar da rəsulların gətirdiyi bu və digər bütün hər bir şeyi yalanlamışlar. Onların rəsulları yalanlamaları onların üzərinə başqa bir müstəqil hüccət qoyur ki, bu da göstərir ki, bu hüccət, tövhidi iqrar üzrə yaradılmış fitrətdir". Kəlamın sonu.

Lakin وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا ***(Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik!) (İsra 15)*** ayəsi ilə bu fitrət əzab verməyi, əzabın gəlməsini tələb etmir.

İbn Kəsir bu ayənin təfsirində deyir: "Allah təalə Öz adilliyindən xəbər verir ki, O, heç bir kəsə ona rəsul göndərməklə hüccət qaldırmamış əzab verməz. Necə ki, Allah təalə deyir:

قَالُوا بَلَىٰ كُلَّمَا أُلْقِيَ فِيهَا فَوْجٌ سَأَلَهُمْ خَزَنَتُهَا أَلَمْ يَأْتِكُمْ نَذِيرٌ

***Hər hansı bir tayfa ora (Cəhənnəmə) atıldıqca onun gözətçiləri onlardan (məzəmmətlə): "Məgər sizə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəlməmişdimi?" – deyə soruşacaqlar. Onlar deyəcəklər: "Əlbəttə".*** Kəlamın sonu.

Həmçinin İbn Kəsir bu ayə haqqında deyir: لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ ***(insanların elçilərdən sonra Allaha qarşı bir bəhanəsi olmasın),*** yəni Allah təalə kitablar endirmiş, rəsulları da müjdə və qorxu ilə göndərmiş, Özünün sevdiyi və razı qaldığı şeylərlə

Allahın rəsulu olduğunu bilər və ona (sallAllahu aleyhi və səlləm) iman gətirərsə və onun (sallAllahu aleyhi və səlləm) gətirdiklərindən bir çox şeylərdən elmsiz olarsa, ona çatmayan şeylərə görə Allah onu cəzalandırmaz. Və əgər Allah təalə imanı tərkə görə yalnız və yalnız hüccət çatdıqdan sonra əzab verirsə, onda imanın bəzi hissəsinə görə hüccətdən sonra əzab verməsi daha layiq, daha münasib və daha məqsədə uyğundur. Bu isə rəsulullahın (sallAllahu aleyhi və səlləm) bu cür misallarda ondan yayılmış olan məşhur Sünnəsidir, yoludur..." Kəlamın sonu. Və bir çox misalları zikr edir. Şeyxülİsləm Məcmuu Fətəvanın 7-ci cild 237-ci səhifəsində imanın artmasından danışdıqda deyir:

"Səkkizinci: İnsan bəzən bir çox işləri yalan sayır və inkar edir. Bilmir ki, peyğəmbər (sallAllahu aleyhi və səlləm) bunu xəbər vermiş və ya əmr etmişdir. Əgər bunu bilmiş olsaydı, onda bunu

---

xoşlamadığı və istəmədiyi şeyləri bəyan etmişdir ki, heç bir üzrxahlıq edənə üzr yeri qalmasın. Necə ki, deyir:

**وَلَوْ أَنَّا أَهْلَكْنَاهُمْ بِعَذَابٍ مِنْ قَبْلِهِ لَقَالُوا رَبَّنَا لَوْلَا أَرْسَلْتَ إِلَيْنَا رَسُولًا**

***Əgər Biz onları bundan əvvəl (Muhəmməd peyğəmbər və Quran gəlməzdən öncə) əzabla məhv etsəydik, deyərdilər: "Ey Rəbbimiz! Nə üçün bizə bir peyğəmbər göndərmədin. (Tahə 134),***

Həmçinin:

**وَلَوْلَا أَنْ تُصِيبَهُمْ مُصِيبَةٌ بِمَا قَدَّمَتْ أَيْدِيهِمْ فَيَقُولُوا رَبَّنَا لَوْلَا أَرْسَلْتَ إِلَيْنَا رَسُولً**

***Öz əlləri ilə etdikləri əməlləri (qazandıqları günahları) üzündən onlara bir müsibət üz verincə: "Ey Rəbbimiz! Barı, bizə bir peyğəmbər göndərəydin!" – deməsəydilər. (Qasas 47).***

Buxari və Muslimdə gələn İbn Məsudun hədisində rəsulullah (sallAllahu aleyhi və səlləm) deyir: "***Allahdan daha qısqanc birisi yoxdur, buna görə də açıq-aşkar və gizli olan fahiş əməlləri haram etmişdir. Tərifi Allahdan çox sevən birisi yoxdur, buna görə də Öz nəfsini tərif etmişdir. Üzrü Allahdan daha çox sevən birisi yoxdur, buna görə də müjdələyən və qorxudan peyğəmbərlər göndərmişdir.***" Kəlamın sonu.

Həmçinin Bəğavi **أَفَتُهْلِكُنَا بِمَا فَعَلَ الْمُبْطِلُونَ** ***(Məgər bizi batilə uyanların (haqq yoldan sapanların) törətdikləri əməllərə görə məhv edəcəksən?")*** ayəsinin təfsirində deyir: "Mümkün deyil ki, Allah təalə tövhid üzrə alınmış misaqı qullarına xatırlatdıqdan sonra, onlar, bu kimi sözlərlə höcətləşsinlər, bəhanələr gətirsinlər." Kəlamın sonu.

**İmam Bəğavi onların hüccətinin kəsilməyini bu misaqın onların yadına salınmasından və onlara bunun xatırlanmasından sonra olduğunu bildirdi və Allah təalə bu misaqı bizə, rəsullar göndərməklə yada salmışdır. Allah daha doğrusunu bilir.**

nə yalan sayar və nə də inkar edərdi. Əksinə, onun qəlbi qəti olaraq bilir ki, peyğəmbər (sallAllahu aleyhi və sələm) yalnız doğrunu xəbər vermiş və yalnız haqqı əmr etmişdir. Sonra ayə və ya hədis eşidir, yaxud bunu tədəbbür edir və ya mənası ona təfsir olunur, yaxud da hər hansı bir yolla bu məsələ ona bəyan olur və beləliklə də bu kəs, yalan saydığı bu işi təsdiq edir və inkar etdiyi bu işi öyrənir. Bu da yeni bir təsdiq və yeni bir iman olur ki, bununla da onun imanı artır. Bundan qabaq o, kafir yox, əksinə cahil idi."

Və deyir: "İnsanlardan çoxu, hətta elm və ibadət əhlindən bir çoxu özləri də bilmədən qəlbləri ilə peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi əməllərə müxalif olan bir çox işlərdə təfsilata gedir və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi əməli bildikdə, ona qayıdırlar. Həmçinin, dində xəta olaraq söz və ya əməllə bidət edən, özü də peyğəmbərə (sallAllahu aleyhi və səlləm) iman gətirmiş və sonra da dediyi sözün bidət olduğunu bildikdə haqqa iman gətirib, ondan (yəni haqdan-tərc) vaz keçməyən hər bir kəs də bu qəbildəndir. Qəsdi peyğəmbərə (sallAllahu aleyhi və səlləm) tabeçilik olan hər bir bidətçi də həmçinin, bu qəbildəndir." Kəlamın sonu.

Sən şeyxülislamın sözünün əhatəliyinə və ümumiliyinə bax! Allah bizi də, səni də doğruya müvəffəq etsin.

## İmam Əbu Muhəmməd İbn Həzm

**Bəzi əməllərin qəlbin inkarı olmadan da küfr olmasının bəyanı və bu məsələnin cahilliyin üzrlü olma məsələsi ilə heç bir əlaqəsi yoxdur və bu iki məsələ arasında da heç bir ziddiyyət yoxdur.**

Əvvəldə keçənlərdə İmam İbn Həzmin sözünü və onun İslam əhlində cahillik səbəbi ilə baş verən hər bir xətanın - istər etiqadda, istər fətvada, istərsə də əməldə olsun - üzrlü olmasında cümhurun məzhəbini doğru görməsini sənə nəql etmişdik. Və adını çəkmədən

işarə etdiyimiz imamlardan nəql etməyi bacarmayan bu kəs, İbn Həzmin bəzi əməllərdə baş verən təvil və yozumda üzr gördüyünü iddia edir. Və deyir "Və ya qədərlə Allahın yazmış olduğu əməli edir" və sonra deyir ki, İbn Həzm təkidlə bildirir ki, bəzi kəslər vardır ki, özləridə bilmədən kafir olur. Lakin İbn Həzmin sözünün mənası heç də bu deyildir. Əksinə, bu nəql edən heç özü məsələni başa düşməyib, necə ki, özü bunu deyir. İndi biz sənə İbn Həzmin sözünü nəql edəcəyik. İbn Həzmin dediyi söz Cəhmilərlə və onlara müvafiq olan Əşarilərlə münaqişə zamanı dediyi bir sözdür. Onlarla "küfr əməlləri edən kəs etdiyi əməl özü-özlüyündə küfr olmasına görə yox, imanın onun qəlbindən çıxmasına görə kafir olması məsələsində" münaqişəsi zamanı dediyi sözdür (Cəhmilərə görə iman təsdiqdən ibarətdir, yəni insan küfr etdikdə, o kəs cuhud edən, inkar edən sayıldığına görə kafir olur, onlara görə təzim və qorxu kimi qəlbi əməllər imandan deyilir).

3-cü cild 159-160-cı səhifələrdə onlara rədd edir (Muhəmməd Sụbeyh mətbəəsi)".

**إِنَّ الَّذِينَ ارْتَدُّوا عَلَىٰ أَدْبَارِهِمْ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدَى الشَّيْطَانُ سَوَّلَ لَهُمْ وَأَمْلَىٰ لَهُمْ ذَٰلِكَ بِأَنَّهُمْ قَالُوا لِلَّذِينَ كَرِهُوا مَا نَزَّلَ اللَّهُ سَنُطِيعُكُمْ فِي بَعْضِ الْأَمْرِ وَاللَّهُ يَعْلَمُ إِسْرَارَهُمْ فَكَيْفَ إِذَا تَوَفَّتْهُمُ الْمَلَائِكَةُ يَضْرِبُونَ وُجُوهَهُمْ وَأَدْبَارَهُمْ ذَٰلِكَ بِأَنَّهُمُ اتَّبَعُوا مَا أَسْخَطَ اللَّهَ وَكَرِهُوا رِضْوَانَهُ فَأَحْبَطَ أَعْمَالَهُمْ**

***Doğru yol özlərinə bəlli olduqdan sonra (dindən) dönənlərə Şeytan (bu dönüklüyü) xoş göstərdi və onları tovlayıb yoldan azdırdı (və ya: bu dönüklüyün müqabilində Allah onları zəlalətə saldı). Bu ona görədir ki, onlar Allahın nazil etdiyinə nifrət edənlərə: "Biz bəzi işlərdə sizə itaət edəcəyik!"– dedilər. Allah onların (qəlblərinin) sirlərini bilir. Bəs mələklər onların üzlərinə və arxalarına vura-vura canlarını alanda (halları) necə olacaq? Bu ona görədir ki, onlar Allahın qəzəbinə səbəb olan şeyə uydular və***

***Onun razı qaldığı şeyə nifrət etdilər. Buna görə də (Allah) onların əməllərini boşa çıxartdı.***[24]

Allah təalə onlar haqqı bildikdən və hidayət yolu onlara bəyan olduqdan sonra, məhz kafirlərə dedikləri sözlərə görə onları mürtəd, kafir etdi. (Bu məsələdə cahillik yoxdur, lakin qəlbi əməlin fasidliyi vardır). Allah təalə bizlərə onların (qəlblərinin) sirlərini bildiyini xəbər verdi və onların (qəlblərinin) sirlərinin cuhud (inkar) və ya təsdiq olduğunu demədi. Əksinə, məlumdur ki, onların sirləri, qəlblərində olan şey təsdiqdən ibarətdir, çünki artıq onlara hidayət bəyan olmuşdur və kimə də əgər bir şey bəyan olmuşsa, qəti olaraq mümkün deyil ki, qəlbi ilə əslən inkar etsin. Və Allah təalə xəbər verir ki, onların əməllərini Allahın qəzəbinə səbəb olan şeylərə tabe olduqlarına və Onun razı qaldığı şeyə nifrət etdikləri görə puç etmişdir. Allah təalə deyir:

**يا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَرْفَعُوا أَصْوَاتَكُمْ فَوْقَ صَوْتِ النَّبِيِّ وَلَا تَجْهَرُوا لَهُ بِالْقَوْلِ كَجَهْرِ بَعْضِكُمْ لِبَعْضٍ أَنْ تَحْبَطَ أَعْمَالُكُمْ وَأَنْتُمْ لَا تَشْعُرُونَ**

***Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın və bir-birinizlə ucadan danışdığınız kimi onunla ucadan danışmayın! Yoxsa, özünüz də bilmədən, əməlləriniz puç olar.*** [25]

Bu əzəmətli bir dəlil və möminlər üçün olan bir xitabdır ki, onların imanları bütövlüklə batil olar və əməlləri də əslən onlardan heç bir cuhud (inkar) baş vermədən, səslərini peyğəmbərin səsindən yüksəyə qaldırdıqlarına görə puç olar. Əgər onlardan cuhud (inkar) baş vermiş olsaydı, onlar bunu mütləq hiss etməli idilər. Amma Allah təalə xəbər verir ki, bu baş verir və onlar isə bunu hiss etmirlər. Məlumdur ki, bədən əməllərinin bəziləri sahibinin imanını bütünlüklə batil edən, puç edən küfr olur və bəziləri də vardır ki, küfr olmur, lakin bütün bunların hamısı

---

[24] Muhəmməd surəsi 25-28.

[25] Hucurat surəsi 2.

Allahın verdiyi hökm üzrədir və buna heç bir başqa əməllər əlavə oluna bilməz." Kəlamın sonu.

Aydın oldu ki, وَأَنْتُمْ لَا تَشْعُرُونَ *(Özünüz də hiss etmədən)*, yəni onunla danışmaqda olan cuhudu (inkarı) hiss etməzlər, əgər onlardan cuhud (inkar) baş versəydi onlar bunu mütləq hiss etməli idilər. İmamın (İbn Həzmin) muradı budur ki, əməllərdən eləsi vardır ki, qəlbdə cuhud (inkar) baş vermədən də, yəni qəlbin təsdiqi itmədən də küfr və ya əməli batil edən olur. Bu əməllər şəriətə müxalif əməllərdir və əməl sahibi bundan cahil olduqda onun kafir olmasını gərəkdirmir. Və bu əməllər də müxtəlifdir, əgər əməl, cahilliyin olub-olmaması ona təsir etməyən əməllərdəndirsə, onda əməl özü-özlüyündə küfr olur. Necə ki,

**وَلَئِنْ سَأَلْتَهُمْ لَيَقُولُنَّ إِنَّمَا كُنَّا نَخُوضُ وَنَلْعَبُ قُلْ أَبِاللَّهِ وَآيَاتِهِ وَرَسُولِهِ كُنْتُمْ تَسْتَهْزِئُونَ لَا تَعْتَذِرُوا قَدْ كَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ**

***(Ya Rəsulum!) Onlardan (Təbuk döyüşünə gedərkən səni lağa qoyan münafiqlərdən nə üçün belə etdiklərini) soruşsan: "Biz ancaq söhbət edib zarafatlaşırdıq (əylənirdik)" - deyə cavab verərlər. De: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz?! Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz".*** [26]

Allahla, Onun ayələri ilə və rəsulu ilə istehza etmək dindən çıxaran küfrdür. Və əgər bunu edən kəs desə ki, mən bunun hökmünü bilmirdim, onun dediyinə məhəl qoyulmaz, çünki bu əməl Allahı aşağılamaqdır. Allah və rəsulunu təzim etmək, ucaltmaq isə heç bir elmə ehtiyac duymur. Belə olduqda isə bu şey, qəlbi əməlin xarablığını göstərir, qəlbi əməllər əsli imanda şərtdir və insan da bununla küfr edir. Cəhmilər deyirlər ki, bu halda o, haqqı yalan saydı və ya haqqa cuhud (inkar) etdi, çünki iman onlara görə yalnız qəlbin sözü olan təsdiqdən ibarətdir. (Şeyxülislam İbn Teymiyyə "İman" və "əs-Sarimul-Məslul"

---

[26] Tövbə surəsi 65-66.

kitablarında onlara rəddiyyələr vermişdir). Amma kimsə səsini peyğəmbərin (sallAllahu aleyhi və səlləm) səsindən yüksəyə qaldırarsa, o, buna görə kafir olmur. Buxari rəvayət etmişdir ki, bu ayə Əbu Bəkr və Ömər barəsində nazil olmuşdur. Allah təalənin **أَنْ تَحْبَطَ أَعْمَالُكُمْ وَأَنْتُمْ لَا تَشْعُرُونَ** ***(Yoxsa, özünüz də bilmədən, əməlləriniz puç olar)*** [27] ayəsi insan özü bilmədiyi halda kafir olmasını vacib etmir. **(Necə ki, kafir yalnız imanı küfrdən üstün tutaraq onu özü üçün seçdikdə mömin olduğu kimi və həmçinin də, mömin nə qədər ki, küfrü qəsd etməyib və onu özü üçün seçməyib, o da kafir olmaz və bu məsələ icma ilə belədir).** Kəlamın sonu [28].

Sonra İbn Həzmin kəlamını nəql etdikdən sonra mənə aydın oldu ki, bu işarə etdiyimiz kəs yalançı və hiyləgərdir. İş təkcə İbn Həzmin sözünün mənasının ona qaranlıq qalması ilə bitmir, çünki İbn Həzmin Hucurat surəsində dediklərini nəql edib, ondan qabaq Muhəmməd surəsində danışdıqlarını tərk etməsi onun muradını açıqlayır.

Əbu Muhəmməd İbn Həzm öz "əl-Əhkam" kitabında 66-67-ci səhifələrdə deyir:

"Əgər bir şəxs, kiminsə peyğəmbərin (sallAllahu aleyhi və səlləm) vəfatından sonra onun (sallAllahu aleyhi və səlləm) ölümünədək halal olan şeyi haramlaşdırmağa və ya haram olan şeyi halallaşdırmağa, yaxud peyğəmbərin həyatında şəriətdən olmayan bir şeyi şəriətdən saymağa haqqı çatdığını etiqad edərsə, o kəs qanı və malı halal olan kafir və müşrikdir. Heç bir fərq olmadan onun hökmü mürtəd hökmüdür. Artıq bəziləri bunun mislində olan şeyləri: Uşaq anasını satmağın qadağan olmasında, içkinin halal olmasında və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) zamanında oxunan Quranın yeddi qiraətindən altısını ləğv etmək kimi şeylərdə zənn etmişlər. **Bu etiqadları batil etmək üzrə**

---

[27] Hucurat surəsi 2.

[28] Qurtubi Hucurat surəsinin təfsiri.

**kimə hüccət qalxmayıbsa, o, cahilliyinə görə üzrlüdür.** Və kimə hüccət qalxarsa və həmin işdə öz tutduğu yolda israr edərək davam edərsə, o şəxs, dediyimiz kimi qanı və malı halal olan kafir və müşrikdir." Deyir: "Və dediyimiz kimi, hüccətdən sonra kafir və ya fasiq sayılan əməl sahibi olan hər bir kəs, hüccət qalxmadığı müddətcə üzrlü əcr sahibidir, hətta xəta etsə belə. **Hüccət qaldırmağın sifəti isə bundan ibarətdir ki, hüccət ona çatmalı və o kəsdə hüccətə qarşı gələcək, müqavimət göstərəcək heç bir şey qalmamalıdır.** Müvəffəqiyyət Allahdandır." Kəlamın sonu.

"əl-Fisal" kitabında 4-cü cild 18-ci səhifədə deyir:

"Bir insan desə ki, Allah filan insanın özüdür, yaxud Allah məxluqatından birinin cisminə qarışır, yaxud Muhəmməddən (sallAllahu aleyhi və səlləm) sonra İsa Məsihdən (aleyhissələm) başqa bir peyğəmbər var, bu məsələlərdə hər bir kəsə hüccət çatdığına görə bu kəsin təkfirində heç bir kəs ixtilaf etmir. **Əgər bu şeyləri etiqad edən və bunun da əksi (haqq) heç vaxt ona çatmayan bir şəxs ölmuş olarsa, onda o şəxsə hüccət çatana qədər onun təkfiri vacib olmaz.**" Əvvəldə də bunu zikr etmişdik[29]. İbn Həzm burada uzaq olan bir fərziyyə gətirmişdir ki, əgər belə bir etiqadla yaşayan insan olmuş olarsa və ona da bu etiqadın əksi (haqq) çatmazsa, mümkün deyildir ki, hüccətdən qabaq o insan təkfir olunsun. Belə olduğu təqdirdə, necə deyilə bilər ki, İbn Həzm müəyyən məsələlərdə üzr görmüşdür?!

Onun bütün sözləri ümumiliyə dəlalət edir, əksinə ən təhlükəli olan bir məsələni zikr etmişdir, hansı ki, bu da Allahın məxluqatına qarışması məsələsidir. Və bu məsələnin də üzərində dinin başqa şəri məsələləri və başqa ibadət məsələləri tərtib olunur.

Əbu Muhəmməd İbn Həzm 4-cü cild, 21-22-ci səhifələrdə özünə müxalif olanlara rəddiyyə verərək deyir:

[29] Üçüncü haşiyəyə bax.

"Onlar həmçinin deyirlər: Əgər ictihad əhli xəta etdikdə onları üzrlü bilirsinizsə, elə isə yəhudi, nəsrani, məcusi və başqa dində olanları da üzrlü bilin, çünki bunlar da ictihad əhli və xeyiri qəsd edənlərdir. Allahdan müvəffəqiyyət diləyərək bizim bunlara verəcəyimiz cavab budur ki, **biz üzrlü bildiyimiz kəsləri öz rəylərimizlə və təkfir etdiyimiz kəsləri də öz zənlərimizlə təkfir etməmişik.** Bu yolu, bu məsləyi (üzr və təkfiri) Allah Özündən başqa heç bir kəsə verməmişdir, həmçinin Cənnət və Cəhənnəmə də istədiyini daxil edən, heç kəs yox, məhz Allahdır. Biz yalnız Allah təalənin imandan adlandırdığını, imandan saydığı şeyi imandan sayırıq. Bütün bunların hamısı, Allah rəsulunun (sallAllahu aleyhi və səlləm) dili ilə İslamdan başqa bütün din əhlinin küfrünə, kafir olmasına hökm verilmişdir – o İslam ki, onun əhli peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi dindən başqa bütün dinlərdən uzaqdır və biz də bunda dayanırıq. Yer əhlindən heç bir kəs – demirik ki, müsəlmanlardan, əksinə bütün dinlərdən – iki nəfər biri digəri ilə Allah rəsulunun (sallAllahu aleyhi və səlləm) İslamdan başqa bütün din əhlinin kafir olmasına hökm verməsində ixtilaf etməz – o İslam ki, onun əhli məhz peyğəmbərin (sallAllahu aleyhi və səlləm) onlara gətirdiyi dindən başqa bütün dinlərdən uzaqdır və biz də bunda dayanırıq. **Və həmçinin iki nəfər biri digəri ilə ixtilaf etməz ki, peyğəmbər (sallAllahu aleyhi və səlləm) özünə tabe olan hər bir kəsə və onun gətirdiyi hər bir şeyi təsdiq edənə və bu dindən başqa bütün dinlərdən uzaq olana iman adı ilə hökm vermişdir.** Və biz də bunda dayanır və buna heç bir şey əlavə etmirik. Bir kəs üçün İslam hasil olduqdan sonra, onun barəsində İslamdan çıxmasına dair söz olarsa və həmçinin də onun İslamdan çıxarılmasında icma olmazsa, belə halda yəqin olaraq əldə etdiyi bilinən İslamdan onu çıxarmaq icazəli deyildir.

Bu dediyimizə dəlili Allah təalə Öz kitabında nazil etmişdir:

**وَمَنْ يَبْتَغِ غَيْرَ الْإِسْلَامِ دِينًا فَلَنْ يُقْبَلَ مِنْهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ**

*Kim İslamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!*[30]

وَيُرِيدُونَ أَنْ يُفَرِّقُوا بَيْنَ اللَّهِ وَرُسُلِهِ وَيَقُولُونَ نُؤْمِنُ بِبَعْضٍ وَنَكْفُرُ بِبَعْضٍ وَيُرِيدُونَ أَنْ يَتَّخِذُوا بَيْنَ ذَلِكَ سَبِيلًا أُولَئِكَ هُمُ الْكَافِرُونَ حَقًّا

*Allahı Onun elçilərindən ayırmaq istəyib: "Biz (o elçilərin) bəzisinə inanır, bəzilərinə isə inanmırıq!"– deyənlər və bunun arasında bir yol tutmaq istəyənlər bütün bunlar, həqiqətən, kafirdirlər.*[31]

Allah təalə həmçinin buyurur:

قُلْ أَبِاللَّهِ وَآيَاتِهِ وَرَسُولِهِ كُنْتُمْ تَسْتَهْزِئُونَ لَا تَعْتَذِرُوا قَدْ كَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ

*De: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz?! Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz".* [32]

Bütün bunlar hamısı dəlillə kafirdir.

Bizdə peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi icma ilə bilinən hər hansı bir şeyi inkar edən hər bir kəsin icma ilə kafir olduğu sabit olmuşdur. Və nasla səhih olaraq bilinir ki, Allahla istehza edən, mələklərdən hər hansı bir mələklə və ya peyğəmbərlərdən hər hansı bir peyğəmbərlə, yaxud Quran ayələrindən hər hansı bir ayə ilə və ya dinin fərzlərindən biri ilə - və bunlar hamısı Allahın ayətləri sayılır – **istehza edən hər bir kəs, ona hüccət çatdıqdan sonra kafirdir.** Və kim də Muhəmməd peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) sonra başqa bir peyğəmbər olduğunu deyərsə və ya peyğəmbərin (sallAllahu aleyhi və səlləm) hər hansı bir şeyi **deməsi o kəsdə səhih olaraq bilinərsə və sonra da onu inkar edərsə,** o kəs kafirdir, çünki həmin kəs peyğəmbəri özü ilə mübahisə etdiyi şey arasında hakim təyin etməmişdir". Kəlamın sonu.

---

[30] Əli İmran surəsi 85.

[31] Nisə surəsi 150-151.

[32] Tövbə 65-66.

İslamdan başqa hər hansı bir din tutan kəs kafirdir. Və kim də peyğəmbərlərdən bəzisinə iman gətirib, bəzisini isə peyğəmbərliyini bildikdən sonra inkar edərsə və həmçinin kim Allah təalə və ya Onun ayələri və ya rəsulu ilə istehza edərsə, o kəs kafirdir. Bu isə inad və istehza küfründəndir ki, bunun da cahillik məsələsinə aidiyyatı yoxdur. Həmçinin, peyğəmbərin (sallAllahu aleyhi və səlləm) hər hansı bir şeyi demiş olduğu kimdəsə səhih olaraq bilinər və onu inkar edərsə, o kəs yalan sayma (təkzib) və inkar (cuhud) küfrü ilə kafir olar. Lakin insan dinin haqq olmasını etiqad edər və peyğəmbəri də (sallAllahu aleyhi və səlləm) təsdiq edərsə, lakin şəriətin bəzisindən cahil olar və ya özündə olan şübhəyə və yaxud pis alimlərin ona işi dəyişdirərək başqa cür göstərməsi səbəbi ilə şəriətdən olmayan müəyyən bir şeyi şəriətdən zənn edərsə, həmin şəxs, müxalifliyə görə ona hüccət qaldırılmayanadək, onun üçün yəqin olaraq sabit olandan (yəni, İslamdan -tərc.) çıxmaz.

İmam İbn Həzm "əl-Əhkəm" kitabı 1-ci cild, 133-cü səhifədə deyir: "Qazi Əbu Yusuf Sələfi Salehi söyən kəsin şəhadətinin qəbulundan soruşulduqda doğru demişdir ki, "Əgər mən bilsəm ki, bir kişi öz qonşusunu söyüb, onun şahidliyini qəbul etmərəm. Elə isə ümmətin ən fəzilətlilərini söyən kəs necə olar?" Yalnız cahilliyə görə olarsa, belə ki, onların fəzilətləri və onları söyməyin qadağan olması barəsində ona hüccət çatmamış olarsa, onları söyməyi və bu söyüşdən daha böyük şeylər əslən onun İslamına ləkə gətirmir. Lakin onun hökmü budur ki, elmlənməli və bildirilməlidir, əgər bunun üzrində davam edərsə fasiq, yox əgər bunda Allaha və rəsuluna inad edərsə, onda kafir və müşrikdir. **Əgər insan xəta edərək elmsizliklə Quranı dəyişdirər və ya qiblədən başqa yerə namaz qılarsa, ona hüccət qaldırılmayanadək, İslam əhlindən olan heç bir kəs onun dininin pozulmasını deməmişdir.**" Kəlamın sonu.

Və "əl-Fisal" kitabında 4-cü cild, 24-25-ci səhifələrdə bu mövzuda sözünə xitam verərək deyir: "Həqiqətdir ki, heç bir kəs peyğəmbərin (sallAllahu aleyhi və salləm) sözü ona çatmayana qədər təkfir olunmaz..." kitabın əvvəl səhifələrində nəql etdiyimiz sözünün sonuna qədər. [33]

## "Əl-Qasimi" Qazi Əbu Bəkr İbn Əl-Arabidən Nəql Edir Və Onu Təsdiqləyir

5-ci cild, 1307-1308-ci səhifələrdə deyir:

"Hədislərdə gələn "kim belə edərsə küfr edər" və ya "kim belə edərsə şirk edər" sözlərinin mənası – bundan Allaha sığınırıq – üzərində mürtədlik əhkamları cərəyan edən dindən çıxaran böyük küfr və ya böyük şirk anlamında deyildir. İmam Buxari öz "Səhih" kitabında deyir: "Qadının öz ərinə küfr etməsi və küfr olmayan küfr" fəsli. Qazi Əbu Bəkr Ibn əl-Arabi bunun şərhində deyir: Buxarinin bu fəslin adını belə adlandırmaqdan istəyi bunu bəyan etməkdir ki, itaətlər iman adlandığı kimi, həmçinin asiliklər də küfr adlanır. Lakin asiliklərə küfr adı verilsə də, bununla dindən çıxaran küfr qəsd olunmur. **Və bu ümmətdən olan cahil və xəta edən hər bir kəs, <u>əməl sahibinin kafir və ya müşrik olacağı küfr və şirk əməl edərsə</u>, tərk edənin kafir olacağı hüccət ona açıq-aydın bəyan olana qədər və İslam dinindən hər bir müsəlmanın baxmadan və fikirləşmədən bildiyi, qəti icma ilə bilinən şeyləri inkar etməyənə qədər müşrik və ya kafir olmaz və həmən kəs, cahilliyə və xətasına görə üzrlü bilinər** ". Kəlamın sonu.

Və əvvəldə işarə etdiyimiz bu məchul şəxs, İbn əl-Arabinin bu sözünün əvvəlini tutaraq iddia etmişdir ki, onun sözü kiçik şirkə aiddir. Həqiqətdə isə o, İbn əl-Arabinin sözünü başa düşməmişdir, çünki İbn əl-Arabi iki məsələni (yəni kiçik və böyük şirki-tərc) bir

---

[33] Altıncı haşiyəyə qayıt.

zikr etmiş və ikinci məsələnin üzərinə birincini dəlil gətirmişdir. Onun "əməl sahibinin kafir və ya müşrik olacağı küfr və şirk əməl edərsə" sözü göstərir ki, o, böyük küfrü qəsd etmişdir. Çünki kiçik küfr sahibi kafir və müşrik yox, fasiqdir. Həmçinin "tərk edənin kafir olacağı hüccət ona açıq aydın bəyan olana qədər" sözü də bunu göstərir ki, o, böyük küfrü qəsd edir, kiçik şirkə düşmüş müxalif kəs isə, heç hüccətdən sonra da kafir olmaz, yalnız onun müxalifliyi Allaha inadkarlıq etmək olarsa, bu istisnadır.

Və həmçinin Qazi İbn əl-Arabinin bəzi üsullarda Əhli Sünnəyə müxaliflik edən, bu ümmətdən sayılan bidət əhlinin üzrlü olması barəsində Şeyxülislamdan və İbn Qeyyimdən nəql etməsi də, şeyxülislamın və İbn Qeyyimin üzrü yalnız bu məsələlərdə görmələrini göstərmir. Artıq kitabımızın əvvəlində şeyxülislamdan sənin üçün nəqllər gətirdik, qayıt onlara bax. (Bu məchul şəxs öz kitabında qoyduğu əsasa etibarən iddia edir ki, şeyxülislam üsulların bəzilərini qəsd etmiş, bəzilərini isə qəsd etməmişdir. Və sənə əlavə bir elm olaraq bildiririk ki, bu məchul şəxsin dinin əsaslarında, üsullarında üzrün olmamasına dair bəzi alimlərdən etdiyi bütün nəqllərin – və bu bəzi alimlər də demişlər ki, bu ümumidir və ya məşhur bir rəydir – hamısı rububiyyət və sifət məsələlərinə aid olub, mötəzilə və kəlam əhlinin məzhəbindəndir, bunun barəsində artıq danışmışıq. Və beləliklə, Mötəzilə və kəlam əhli demişlər ki, "Əgər insan Allahın sifətlərindən hər hansı bir sifətdə cahilliyini aradan qaldırmaq üzrə bütün cəhdini sərf edər və cahilliyi aradan qalxmazsa, bununla o, günahkar, üzrsüz kafir olar." Bu da batil bir fikirdir və bu haqda kitabın əvvəlində artıq danışmışıq. Bunlar ibadət tövhidi ilə maraqlanmamış, ona tərəf boylanıb baxmamış və onların bütün himmələri rububiyyət tövhidi olmuşdur. Və bununla da yanaşı bu məsələdə də xəta etmiş və çirkin bir zəlalət gətirmiş, sonra ümməti təkfir etməyi buna əlavə

etmişlər. [34] İmamlardan nəql etməyi bacarmayan bu kəs isə, imamların kəlamlarını kəsərək, bunları öz mənasından başqa bir mənaya yozmaqla mötəzilə və kəlam əhlinin qaydalarını Əhli

[34] Bildirirəm ki, Mötəzilələr və digər bütün kəlam əhli tövhid kəliməsi olan lə iləhə illəllah şəhadətini doğru-düzgün başa düşməmişlər. Belə ki, onlar bu şəhadət kəliməsini "Allahdan başqa ibadətə haqlı olan məbud yoxdur" kimi yox, "Allahdan başqa yaratmağa qadir olan yoxdur" kimi anlamışlar. Bu isə dinin əsli və İslamın əsası olan şəhadət kəliməsini doğru anlamamaq və sonra da bunun tələblərinə uyğun doğru-düzgün ibadət eməmək deməkdir. Çünki tövhid kəliməsinin dəlalətini uluhiyyə, yəni ibadət tövhidindən çıxararaq, rububiyyət tövhidə aparmışlar və müəllifin də dediyi kimi bütün təkfir əhkamlarını da bunun üzərində qurmuşlar. Lakin bununla yanaşı ümmətdən heç kəs Mötəzilələri təkfir edərək ümmətdən çıxarmamışdır, baxmayaraq ki, onların da xətası lə iləhə illəllah şəhadətinin üzərindədir.
Və həmçinin diqqətə çatdırmaq yerinə düşərdi ki, Mötəzilələr də Xavariclər kimi "Vaidiyyə" firqələrindəndir, yəni bunlar hədə naslarını götürərək böyük günah əhlini etdikləri asiliklərə görə İslam dairəsindən çıxarmışlar. Çünki bunlara görə iman bir şeydən ibarətdir və hissələrə bölünmür, bir hissəsi getdikdə hamısı gedir. Və bunlar, bu ümmətdən olan böyük günah əhlinə qiyamət günü ediləcək şəfaətlərin hasil olacacığını əslən görmürlər, bu şəfaətləri inkar edirlər. Mötəzilələrlə Xavariclərin iman mövzusunda fərqi bundan ibarətdir ki, Mötəzilələrə görə böyük gönah əhli dünyada nə kafir, nə mömindir, əksinə o, iki mənzil arasında bir mənzildədir, axirətdə isə kafirdir. Xavariclərə görə isə o, dünyada da, axirətdə də kafirdir. Bütün bunlar da onların Quran və sünnədən uzaq düşmələri və bunu Sələfin fəhmi ilə başa düşməmələri və həmçinin də yalnız hədə naslarını götürüb, bununla kifayətlənmələri və vəd naslarına tərəf boylanıb baxmamaları səbəbi ilə olmuşdur. Əhli Sünnə isə firqələrin ixtilaf etdikləri məsələlərdə Qurana və sünnəyə tabe olduqlarına və bunu Sələfin fəhmi ilə başa düşdüklərinə görə Allah onları haqqa yönəltmiş və demişlər ki, böyük günah əhli mömindir, lakin imanı zəifdir və bu ümmətdən iman üzrə ölən hər bir şəxs qiyamət günü ediləcək şəfaətə nail olacaqdır. Mütəvatir yollarla rəvayət edilmiş səhih şəfaət hədislərinə iman gətirmək Sələfi Əhli Sünnənin təməl dayaqlarından sayılan üsullardandır, buna müxalif olanlar isə, artıq bidət əhli sayılmışlar. Buna görə də bütün sünnə, üsulus-sünnə, iman, tövhid adı altında yazılmış bütün əvvəlki kitablarda bu mövzuya ayrıca fəsil ayrılmışdır. Bunun barədə geniş danışmağın yeri isə bura deyildir, sədəcə diqqət yetirmək yerinə düşür ki, bu firqələrin iman mövzusunda azması və bunu Sələfin başa düşdüyü kimi anlamaması bu məsələnin üzərində bina olunan bütün məsələlərdə - iman, küfr və təkfir məsələlərində də özünü çox pis formada göstərmişdir. Bu barədə ayrıca risalə artıq tərcümə olunmuşdur, Allah təalənin yardımı ilə tezliklə dəyərli sələfi qardaşlarımıza təqdim olunacaqdır.
Bütün bu dediklərim isə əlavə bir məlumat kimi qiymətləndirilməli və nəzərə alinmalı, müəllifin dediklərinə əlavə və ya şərh və ya çatışmayan yerləri tamamlamaq olaraq başa düşülməməlidir. Çünki kitab – Allaha həmd olsun – çox gözəl bir tamamlıqda qələmə alınmışdır (tərc).

Sünnənin etiqadı üzərinə daşımaq üçün gəlib onların qaydalarından istifadə edir. İbn Qeyyim üzr gördüyü firqələrdən danışdıqda xavaric, rafizi və cəhmiləri də zikr etmişdir. Rafizilərin əqidələri, onların qəbirpərəstlərin ilki olmaları və qəbirlərin təzimin edilməsinin də onlardan götürülməsi, həmçinin də, imamlar barəsində olan etiqadları hamıya məlumdur (Bu barədə şeyxülislamın "Minhəcu əs-Sunnə" kitabına bax). **Doğru olan, cahilin üzrü məsələsində məsələlər arasında fərq qoyulmamasıdır, necə ki, bu da Əhli Sünnənin cümhurunun rəyi, dediyi sözüdür. Həmd və tərif hamısı Allahadır.**

## İmam Şövkəni[35] Alləmə Siddiq Həsən Xan[36] Ondan Nəql Edir

Siddiq Həsən Xan "ər-Ravdatu ən-Nədiyyə" kitabı 2-ci cild, 290-292-ci səhifələrdə müsəlmanları təkfir etməkdən, dindən çıxarmaqdan çəkindirmək və təvil edənləri təkfir etməmək məsələsində İmam Şövkənidən nəql edir: "Küfrdə labüddür ki, insanın köksü ona açılmış, qəlbi onunla rahatlıq və nəfsi onda sükunət tapmış olsun. İslam dininə müxalif olmasından cahil olaraq şirki etiqadlardan nəyinsə baş verməsinə **heç bir etibar olunmaz, bunda heç bir ibrət yoxdur** və insandan küfr əməlin İslam dinindən çıxıb başqa küfr dinə düşməyi qəsd etməyərək baş

---

[35] Təfsirçi, muhəddis, fəqih, Yəmənin böyük müctəhid alimlərindən olmuş Muhəmməd İbn Əli İbn Muhəmməd İbn Abdullah əş-Şəvkəni əl-Yəməni, yazdığı məşhur əsərlərdən hədislərin şərhində "Neylu əl-Əvtar" və təfsir elmində "Fəthu əl-Qadir" kitabları və həmçinin usulu fiqhdə, fiqhdə və s. müxtəlif fənlərdə əlyazma və çap olunmuş yüz qırxdan çox böyük və kıçık həcmli əsərlərin müəllifi, hicri 1173-1250-ci illərdə yaşamışdır (tərc).

[36] Muhəmməd Siddiq Xan İbn Həsən İbn Əli İbn Lutfullah əl-Huseyni əl-Buxari əl-Qinnəvci, Əbu ət-Tib, Hind diyarının böyük İslam mucəddidlərindən olmuş, ərəb, fars və hind dillərində müxtəlif fənlərdə: təfsirdə "Fəhtu əl-bəyən fi məqasidi əl-Quran", hədisdə "Avnu əl-Bəri" İmam Buxarinin "Səhih" əsərinin şərhi və həmçinin lüğət, təqlidi tərk etmək, fiqh və s. elmlərdə altmışdan çox kitabın müəllifi, hicri 1248-1307-ci illərdə yaşamışdır (tərc).

verməsinə **heç bir etibar olunmaz, bunda heç bir ibrət yoxdur** və mənasını etiqad etməyərək küfrə dəlalət edən sözü işlətməsinə də **heç bir etibar olunmaz, bunda heç bir ibrət yoxdur**." Sonra da Allahdan başqasına and içənin və başqalarının təkfir olunmasına öz etirazını bildirir.

Və həmçinin burada da imamları başa düşməyən bu kəsə bu iş qaranlıq qalıb və zənn edib ki, İmam Şövkəni yalnız kiçik küfr sayılan asiliklərdən danışır. Həqiqətən də, Şövkəninin sözünü bir də oxusan görərsən ki, məsələ insana qaranlıq qala bilər. Lakin Allaha həmd olsun ki, İmam Şövkəninin bu məsələdəki məzhəbini tanımaqla məsələdə heç bir anlaşılmazlıq qalmır. Belə ki, o, küfrü böyük və kiçiyə bölməmişdir, əməli isə naslarda gəldiyi kimi küfr adlandırmışdır və əməl sahibini də o əməli elm üzrə və köksü ona açılmış halda etdikdə kafir adlandırmışdır, istər nas Əhli Sünnənin böyük, istərsə də kiçik küfr adlandırdığı şeylərdə olsun, necə ki, yuxarıda özü bəyan etdi. Şövkəninin "Neylu əl-Əvtar" kitabında namazı tərk edənin hökmü barəsində etdiyi bəhsinə qayıt və onun bu məzhəbini sənə nəql etdiyimiz kimi orada tapacaqsan. Xülasə olaraq, fayda bundan ibarətdir ki, onun sözü öz məzhəbinə uyğun olaraq, küfrün iki növünü də əhatə edir və bu da onun "Küfrdə labüddür ki, insanın köksü ona açılmış olsun........**heç bir etibar olunmaz, bunda heç bir ibrət yoxdur**" sözündən açıq-aydın bilinir. Bunların da arasını İmam Şövkəni özü cəm etmiş və bu etdiyi cəmlə bilinir ki, əməl sahibinin kafir olması üçün labüddür ki, insanın köksü bu müxalif əmələ açılmış və etdiyi əməli elm üzrə özü seçmiş olsun, amma İslamın yoluna müxalifliyindən cahil olarsa, bu halda kafir olmaz.

Bu işarə etdiyimiz məchul şəxsin sehirbazı və (Allahı, dini, peyğəmbəri-tərc.) söyənin təkfirinə və mürtədliyinə Şövkəninin hökm verməsinə dair ondan etdiyi nəqlə gəlincə isə, bu da zikr etdiyimiz kimi ümumi deyilən sözdür. Bunların küfründə heç bir şəkk-şübhə yoxdur, lakin müəyyən bir şəxsin özünə gəldikdə isə,

bunda zikr etdiyimiz kimi, cahilliyin ehtimal olunub olunmaması kimi təfsilat vardır, misal olaraq söymək.

Və həmçinin, Şövkəni "əd-Dəvau əl-Acil" kitabında da zikr etdiyi kəslərin qismlərini bəyan etdikdən sonra (yəni insanları üç qismə bölür-tərc.) onların üzərinə ümumi olaraq təkfiri itlaq (aid, nisbət) etmişdir. (Birinci qism) belə ki, onlar namazı yaxşı qılmağı bacarmır, namaz qılmırlar və deyir: "Rəiyyətdən olan namazı tərk edənlər kafirdir" və onların oruc tutmadıqlarını zikr edərək deyir: "Və şəkk yoxdur ki, onların orucu tərk etdikləri formada orucu tərk edənlər kafirdir" və zikr etdi ki, onlar riba müamiləsi edir, zülm edirlər və qazi cahildir, insanlara da şəriətdən başqasıyla hökm verir və həmçinin, onlardan elələri də vardır ki, Allahdan başqsından kömək istəyirlər. Və başqa bir qism isə (ikinci qism), imama itaət etmir, hegemonluq edərək imama qarşı çıxır, ölkə əhalisini öldürür və şəriətdən başqasıyla mühakimə edirlər. Bu əməllər sahibinin kafir olmasında şəkk yoxdur, lakin müəyyən şəxsə gəldikdə isə, labüddür ki, onun haqqında təkfirin şərtləri sabit olmuş olsun." Buna görə də onlarla döyüşməyi zikr edəndə deyir ki, "Bunlarla cihad etmək vacibdir ki, hətta İslam hökmlərini qəbul edib, ona boyun əysinlər və öz aralarında pak olan şəriətlə hökm versinlər və düşdükləri bu şeytani tağutları hakim təyin etmək əməlindən çıxsınlar."

Həmçinin deyir ki, “Şəriət qaydalarından və naslarından məlumdur ki, kim öz nəfsini bunlarla döyüşməyə ayırar, Allahdan yardım istəyər və niyyətini Allah üçün edərsə, o kəs, yardım olunan kəslərdən olar və onun üçün gözəl aqibət vardır." Bütün bunların hamısını ikinci qismdə zikr edir və deyir: "Dövlətin əmrlərinə qarşı çıxan və öz ölkələrində hegemonluq edənlər" - məlumdur ki, imama qarşı çıxan, münkər əməllər üzrə cəmləşmiş və hegemonluq edənlərlə şəriətə müxalif olduqları üçün döyüşmək vacibdir. Bunun dəlilləri haqqında danışmağın yeri isə bura deyildir. Zikr olunan bu şeylərdən isə bu kəslərin təkfir olunmaları

gərəkmir. İmam Şafiidən nəql olunduğu kimi "Öldürməklə döyüşmək bir deyildir. Bəzən insanla döyüşmək halal olur, lakin onu öldürmək isə yox". Amma birinci tayfa isə, bunlar dövlətə itaət edən rəiyyətdir, bunların pisliklərini zikr etməklə yanaşı bunlarla döyüşməyi zikr etmir. Sonra isə deyir: "Və ümumiyyətlə əmr sahiblərini rəiyyətin etiqadlarını islah etməyə tərəf aparmaq dedikdə, insanlara zərər və fayda verənin, ruzini azaldan və artıranın Allah olduğunu, qula Allahdan başqasının nə fayda və nə də, zərər verə bilmədiyini isbat etmək, onları batil etiqadlardan çəkindirmək, onlar üçün hər bir kənddə, şəhərdə şəriət elmlərini öyrətmək üçün saleh müəllimlər təyin etmək və onlara namazları vaxtında qılmaqlarını əmr etmələri qəsd olunur". Kəlamın sonu. (Bundan qabaq isə zikr edir ki, qazilərə vacibdir ki, Allahın insanlara vacib etdiyini, yəni zəkatı insanlardan yığsın və müsəlmanların imamına təhvil versin. Əgər müəyyən kəslərin dindən çıxdığına dair hökm vermiş olsaydı, onda imamın sözü bu cür olmazdı və onların mürtəd kimi ölümlərinə hökm verərdi, Allaha həmd olsun ki, bu da açıq-aydındır).

Əksinə İmam Şövkəni "Neylu əl-Əvtar" kitabında "Qohumlara yaxşılıq etmək və ər-arvad haqlarının bəyanı" fəslində Muazın peyğəmbərə (sallAllahu aleyhi və səlləm) səcdə etməsindən danışdıqda deyir: "Bu hədis dəlildir ki, Allahdan başqasına cahillik səbəbi ilə səcdə edən kafir deyildir". Kəlamın sonu.

## **Şeyx Muhəmməd İbn Abdul Vahhab Və Nəcd Diyarının Dəvət Alimləri**

Şeyx Muhəmməd İbn Abdul Vahhab Həməd İbn İdə olan risaləsində (ər-Rasəil əş-Şəxsiyyə, səhifə 25; İmam Muhəmməd İbn Səud çapı) ona deyir: "Mən dörd məsələnin tərifini verdim və üçüncü məsələ də bundan ibarətdir ki, **Tövhidin Allah və rəsulunun dini olduğu bilib və sonra da ona büğz edən, nifrət**

**edən** və insanları ondan qaçıran və bu tövhid dinində rəsulu (sallAllahu aleyhi və səlləm) təsdiqləyənlə mübarizə aparan və həmçinin, şirki tanıyan və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) bu şirki inkar etmək üçün göndərildiyini bilən və bunu iqrar edən, sonra isə şirki tərif edən və onu insanlara gözəl göstərən və şirk əhlinin çoxluq təşkil etdiyi üçün onların xəta etmədiyini iddia edən kəsin təkfiri.** Amma, düşmənlərin mənim barəmdə deməleri ki, guya mən zənlə və ard-arda təkfir edir və ya **üzərinə hüccət qalxmamış cahili təkfir edirəm**, **bu əzəmətli bir böhtandır**. Bununla onlar insanları Allah və rəsulunun dinindən qaçırmaq istəyirlər."

Suveydiyə yazdığı məktubunda deyir (ər-Rasəil əş-Şəxsiyyə, səhifə 38): "**Amma təkfirə gəldikdə isə, mən, rəsulun dinini bilən və bildikdən sonra isə onu söyən, insanlara onu qadağan edən və dinə əməl edən kəslə düşmənçilik edəni təkfir edirəm. Mənim təkfir etdiyim məhz budur**, Allaha həmd olsun ki, ümmətin çoxusu belə deyildir". Kəlamın sonu.

Və həmçinin, Şeyxin etiqadını öyrənmək istəyən şəxsə yazdığı məktubda deyir (ər-Rasəil əş-Şəxsiyyə, səhifə 58): "**Lakin biz, Allahın və rəsulunun dinini bilib, sonra da ona düşmənçilik edən və insanları ondan uzaqlaşdıran və həmçinin, bütlərə və qəbirlərə ibadət etməyin müşriklərin dini olduğunu bildikdən sonra, ona ibadət edən və insanlara da bunu bəzəyən kəsi təkfir edirik.**" Kəlamın sonu. [37]

[37] Bil ki, Şeyxin təkfir etdiyi insanların çoxu bəzi alimlər və onun etiqadını bilib ona müvafiq olan və haqqı bilib, sonra da ona qarşı çevrilən və avam insanları da ona qarşı təhrik edən dindarlar idi. Bu kəslərdən də biri ibadət əhlindən olan (yəni Şeyx) Əhməd İbn İbrahimə yazdığı risaləsində dəfələrlə təkrarlayır: "Lakin bu müəyyən kəslər tövhidi bildikdən sonramı onu tərk edir və insanları da ondan çəkindirdilər, yoxsa onunla fərəhlənib və onu sevdilərmi?" ... və sonra deyir "Zubeyrin və Kavazın qübbəsində ibadət edənlər öz dinlərindən tövbə edib tövhidəmi tabe oldular, yoxsa öz dinlərindəmi qaldılar"... sonra Şeyx aydınlıq gətirir ki, bunlar Şeyxin yolunu iqrar, təsdiq etdikdən sonra ona düşmənçilik etdilər

Həməd Tuveyciriyə olan məktubunda şeyx deyir: "**Biz, uluhiyyətdə Allaha şərik qoşan kəsi, yalnız şirkin batilliyi üzrə hüccəti ona bəyan etdikdən sonra təkfir edirik**." Kəlamın sonu. (ər-Rasəil əş-Şəxsiyyə, səhifə 60)

Şərifə olan risaləsində şeyx deyir: "**Əgər biz Abdul Qadirin və Əhməd əl-Bədəvinin qəbri üzərində olan bütlərə ibadət edənləri və bunların mislində olanları onların cahillikləri və onlara başa salanın olmaması səbəbi ilə təkfir etmiriksə**, onda Allaha şərik qoşmayan kəsi bizə hicrət etmədiyinə görə, küfr etmədikdə və döyüşmədikdə necə təkfir edə bilərik. **Subhəhəllah, bu əzəmətli, böyük bir böhtandır.**" Kəlamın sonu. (Bunu da "Siyənutu əl-İnsən" kitabının müəllifi 449-cu səhifədə və həmçinin Məsud ən-Nədəvi

---

və deyir "Sizdən başqaları cahilliyə görə üzrlüdürlər desək də, siz elmli olduğunuzu açıq aşkar bildirirsiniz. Allah daha yaxşı bilir." Kəlamın sonu.

Və həmçinin, Əhməd İbn Abdul Kərimə göndərdiyi məktubunda deyir: "Sən məsələyə hökm verdikdə və bildikdə ki, sənin yanında olanların əksəriyyəti Quran ayələrini, keçmiş və sonradan gəlmiş olan elm əhlinin sözlərini eşitmiş və onu iqrar etmiş və "Mən şahidlik edirəm ki, haqq olan məhz budur və biz bunu İbn Abdul Vahhabdan qabaq bilirdik" demişlər və sonra da haqq olduğuna şahidlik etdikləri şeyi açıq aşkar söyərək, şirki və şirk əhlini insanlara gözəl göstərdiyini açıq aşkar bildirirlər..." kəlamın sonu. (Risalənin 217-218-ci səhifələri). Həmçinin, Suleyman İbn Suheymə göndərdiyi məktubunda deyir: "Sizlər iqrar edirsiniz ki, haqq, məhz bizdən sizə gələn şeylərdir və sən də buna gecə-gündüz şahidlik edirsən, sonra bu şəhadətlə yanaşı – bu da Allahın dinidir – sən və sənin atan gecə-gündüz bu dinə düşmənçilikdə əlinizdən gələni edirsiniz" və həmçinin ona deyir: "Sən deyirsən ki, tövhidi bilirəm və iqrar edirsən ki, kim salehləri vasitə tutarsa o, kafirdir. İnsanlar isə sənin əleyhinə şahidlik edirlər ki, sən mövlüd mərasimlərinə gedir və onlar üçün oxuyur, onlarla orada iştirak edirsən və onlar da zəlil halda öz şeyxlərinə dua edir, onlardan kömək və yardım diləyirlər".

Və həmçinin Şeyx, Dəriyyə diyarının dindarlarına göndərdiyi məktubunda deyir: "Mən, bu vaxta qədər mənə müxalif olan hər bir kəsdən dəlil tələb edirəm. Onlara dəlillərini gətir, yaz və ya zikr elə deyildikdə, aradan çıxır və acizliyi bəyan olur. Lakin gecə və gündüz çalışırlar ki, cahilləri Allahın yolundan azdırsınlar və bu yolu onlara əyri göstərsinlər." Kəlamın sonu. Şeyx bildirdi ki, Ərəb yarımadasının hər bir tərəfinə artıq hüccət qaldırmış, insanların da çoxu onun hüccətinə qarşı müqavimət göstərə bilməmiş və bununla da yanaşı ona müxalif olmuşlar.

şeyx haqqında olan öz kitabında 479-cu səhifədə, "Ravdatu əl-Əfkər" kitabından nəql etmişdir. "

Və həmçinin "əl-Hədiyyətu əs-Səniyyə" kitabının müəllifi şeyxin bu sözünü nəql edir: "**Bu şirk edənlərə və saleh övliyalara ibadət edən bunların mislində olanlara, əgər risali hüccət qalxmış olarsa, onda onların müşrik olmalarına hökm verər və onları kafir görərik**" Kəlamın sonu.

Şeyx Muhəmməd öz "Kəşfu əş-Şubuhət" kitabında – şəhadət əhlini şirk etdiklərinə görə təkfir etməsini inkar edənlərə verdiyi cavab əsnasında – deyir: "Və həmçinin buna olan dəlillərdən, Allah təalənin İsrail övladlarının müsəlman olmaları, elmli və saleh olmaları ilə yanaşı Musaya **اجْعَلْ لَنَا إِلَٰهًا كَمَا لَهُمْ آلِهَةٌ** (Onların ilahları olduğu kimi, bizim üçün də bir ilah düzəlt)[38] deməlॉrini xəbər verməsidir. Və həmçinin səhabələrdən olan bir qism insanların *"Bizim üçün silahlarımızı asmağa bir şey et"* (Zətu ənvat hədisi) deməələri və peyğəmbərin də (sallAllahu aleyhi və səlləm) and içməyi ki, *"Bu israil övladlarının* **اجْعَلْ لَنَا إِلَٰهًا** (bizim üçün də bir ilah düzəlt) *dəmələrinə oxşayır*[39]. Lakin müşriklərdə şübhə vardır, bu

---

[38] Əraf surəsi, 138.

[39] İmam Əhməd və Tirmizinin Əbu Vaqid əl-Leysidən rəvayət etdiyi hədisdə Əbu Vaqid əl-Leysi deyir: Peyğəmbərlə (sallAllahu aleyhi və səlləm) bərabər Huneyn döyüşünə çıxdıq. Biz küfrdən yenicə çıxmış, İslamda yeni olan kəslər idik, müşriklərin də sidr ağacları vardı, onun yanında ibadətə qapılır və ondan silahlarını asırdılar. Bu ağaca "zətu ənvat" deyirdilər. Və Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) dedik ki, ey Allahın rəsulu, onların silah asdıqları ağac - "zətu ənvat" olduğu kimi bizə də silahlarımızı asmağa bir ağac təyin et. Peyğəmbər (sallAllahu aleyhi və səlləm) dedi: Allahu Əkbər, bu əvvəlki ümmətlərin yollarıdır. Nəfsim əlində olana and olsun ki, İsrail övladlarının Musaya **اجْعَلْ لَنَا إِلَٰهًا كَمَا لَهُمْ آلِهَةٌ** (Onların ilahları olduğu kimi, bizim üçün də bir ilah düzəlt) dedikləri kimi dediniz. Siz, mütləq özünüzdən əvvəlkilərin yollarına tabe olacaqsınız." Hədis səhihdir. Alimlərin bu hədisin təfsirində iki görüşləri vardır: **(Birincisi)** onlar Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) sadəcə ağac tutaraq silahlarını ondan asmaqda müşriklərə bənzəyən bir şey istədilər. Kafirlərə bənzəməyin qadağan olunmuş bir əməl omasına görə Peyğəmbər (sallAllahu aleyhi və səlləm) də, onlara qarşı sərt davrandı. Şatibi və həmçinin də "İqtida sirati əl-müstəqim" kitabında İbn Teymiyyə hədisi bu mənanın üzərinə yozmuşlar. **(İkincisi)** onlar Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) elə bir ağac tələb etdilər ki, müşriklərin

qissədə bu şübhələri dəlil gətirirlər ki, İsrail övladları bu tələbləri ilə kafir olmadılar. Və həmçinin də *"onlardakı kimi bizim üçün də silahlarımızı asmağa bir şey ver"* deyənlər də kafir olmadılar. Cavab olaraq deyirik ki, İsrail övladları bunu etmədikləri kimi Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) istəyənlər də bunu etmədilər (yəni, Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) onlara bunu qadağan etməsindən sonra – çünki bəzi cahillər vardır ki, zənn edirlər ki, şeyx, şirki deməklə şirki etməyin arasında fərq

---

etdikləri kimi bunlar da ağacın yanında ibadətə qapılsın və onunla təbərrük etsinlər, bu isə şirkdir. Şeyx Muhəmməd İbn Abdul Vahhabın buradakı sözü də bu mənanın üzərində cərayan edir. Və həmçinin İbn Qeyyim "İğasətu əl-luhəfən" kitabında zikr edir ki, baxmayaraq ki, ağaca dua etmirdilər, lakin müəyyən ağacı müqəddəs bilib, onun yanında ibadətə sarılmaq Allahla yanaşı başqa bir ilah tutmaqdır. Və həmçinin, Suleyman İbn Abdullah Əliş-Şeyx (Şeyxin nəvələrindən olan) "Teysiru əl-Azizi əl-Həmid" kitabında və həmçinin başqa alimlər də bu hədisə bu mənanı vermişlər. Hədisin təfsirində doğru olan da – Allah daha doğrusunu bilir – elə bu ikinci mənadır və bu da bir çox şeylərə görədir. Bunu da hədisin gedişatına və ləfzinə qayıtmaqla bilə bilərsən. Çünki səhabələr küfrdən yeni çıxmış, İslamın əhkamları da onlarda hələ kök salmamışdır və həmçinin, onlar *"müşriklərin silah asmağa ağacları olduğu kimi, bizə də bir ağac ver"* dedilər. Və hədisin də zahiri müşriklərə tam olaraq oxşamaqdır. Hədisi isə zahirindən başqa bir yerə yozmağı vacib edən heç bir şey yoxdur, əksinə, hədisin tamamı bu mənanı qüvvətləndirir. Müşriklərə bənzəməyin mənası yalnız ağacdan silah asmaq deyil, onlar belə zənn edirdilər ki, ağacdan silah asmaqda bərəkət və onun ətrafında ibadətə qapılmaq vardır ki, bu da yardımın gəlməsinə səbəb olacaq və həmçinin, onlarda ağacdan silah asan müşriklərin etiqadlarına bənzər başqa etiqadlar vardı. Səhabələr bu əməlin İslama zidd olduğunu bilmirdilər. Və həmçinin bu təfsiri gücləndirən mənalardan, Peyğəmbər (sallAllahu aleyhi və səlləm) and içərək dedi ki, *"siz Musanın əshabının Musaya dediyi sözü (Onların ilahları olduğu kimi, bizim üçün də bir ilah düzəlt) dediniz"* və bildirdi ki, bu iş artıq qardaşı Musanın da başına gəlmişdir. Səhabələrin işlətdikləri bu ləfz bənzəməyi gərəkdirir, onlar uluhiyyəyə aid olan bir şey istədilər. İnsanların ağaclar barəsində olan etiqadı isə keçmişdə də, indidə də mövcuddur və ola bilsin ki, bunlar da bu əməlin şəriətdən olan vasitələrdən və ya vəsilələrdən olduğunu zənn etmişlər. Peyğəmbər (sallAllahu aleyhi və səlləm) də, onlara qarşı sərt davrandı ki, İslamın həqiqətini və İslamın cahiliyyə etiqadlarından uzaq olmasını bilsinlər. Və həmçinin, bu zikr etdiyimiz təfsiri gücləndirən mənalardan, Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) *"Özünüzdən əvvəlkilərin yollarına mütləq və mütləq qarış-qarış tabe olacaqsınız"* deməsidir. Çünki əvvəlkilərin içərisində ilah tələb etmiş və ya peyğəmbərlərindən sonra şirk etmiş və ya asiliklər etmiş kəslər olub. Və belə olduqda da, zahir olan tam bənzərlikdir. Allah daha doğru bilir.

qoyur). Və ixtilaf yoxdur ki, əgər İsrail övladları bu əməli etsəydilər kafir olardılar və həmçinin də ixtilaf yoxdur ki, Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) qadağan etdiyi kəslər də əgər ona itaət etməsəydilər və onun nəhyindən sonra, onlara qadağan olunan bu əməli etsəydilər, kafir olardılar. Və tələb olunan məna da elə budur. (Şeyxin "Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) nəhyindən sonra" sözü bunu göstərir ki, onlar nəhydən qabaq da kafir olmamışdılar). Lakin bu qissə bu faydanı verir ki, müsəlman, hətta alim belə, bəzən özü də bilmədən şirkin bəzi növlərinə düşə bilər. Və həmçinin faydalardandır ki, elm öyrənməyin və insanın özünü qorumasının zəruriliyi və həmçinin, elmsiz insanın "Tövhidi artıq başa düşmüşük" sözü ən böyük cahillikdən və şeytanın ən böyük hiylələrindəndir.

Və həmçinin, faydalardandır ki, müləsman olan kəs özü bilmədən küfr kəlimə işlədər və ona bu başa salınar və tövbə edərsə, kafir olmaz, İsrail övladları və Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) istəyənlər kimi. **Və həmçinin faydalardan, hətta kafir olmasa belə, onunla Peyğəmbərin** (sallAllahu aleyhi və səlləm) **etdiyi kimi sərt davranılmalıdır"** Kəlamın sonu.[40]

- Şeyx Suleyman İbn Abdullah İbn AbdulVahhab "Teysiru əl-Azizi əl-Həmid" kitabında deyir: "Bu cümlədə olan faydalardandır

[40] Ola bilsin ki, bu axırıncı cümlə şeyxin "Kitəbu ət-tövhid" kitabında bu hədisdən həmən sonra dediyi "Peyğəmbər onları cahilliyə görə üzrlü görmədi" və zəiflik səbəbilə qoluna halqa bağlayanın hədisində dediyi "o, cahilliyinə görə üzrlü bilinmədi" sözündəki qəsdini açıqlayır. Belə ki, Peyğəmbər (sallAllahu aleyhi və səlləm) *"əgər bu halqa sənin üzərində ikən ölsən, heç vaxt nicat tapmazsan"* və həmçinin İmam Hakimin rəvayət etdiyi *"O halqaya həvalə olunarsan"* deməklə ona qarşı sərt davrandı. Yoxsa ki, şeyx cahilliyin üzrlü olmamasını demir. Və məna da yalnız bizim dediyimiz şeylə aydın bilinir. Şeyx artıq burada açıq aydın bildirir ki, onlar kafir olmadılar və belə olduqda da üzr olmamasının nə mənası var? İşarə etdiyimiz bu məchul şəxsin sözünə görə şeyx kiçik şirkdə üzrü inkar etmir. Və biz görürük ki, Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) *"əgər o sənin üzərində ikən ölsən"* – yəni qadağandan sonra – və həmçinin, *"heç vaxt nicat tapmazsan"* sözlərinin təfsiri İmam Hakimin rəvayət etdiyi *"ona həvalə olunarsan"*-dır. Yəni yardımsız və köməksiz qalarsan, çünki bu halqa fayda vermir. Ona görə ki, halqa taxmaq alimlərin zikr etdiyi kimi, kiçik şirkdəndir.

ki, ağaclar, qəbirlər və daşlarla təbərrükü, bunların yanında ibadətə sarılmağı və bunlar üçün qurban kəsməyi etiqad edənlərin etdiyi bu əməllər şirkdir. Və bəzi avam və axmaqların etdikləri əməllərə aldanılmasın və **bunun şirk olması, həmçinin bu ümmətdə baş verməsi də uzaq görülməsin**. Əgər bəzi səhabələr bunu yaxşı şey zənn edərək, peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) tələb etdilərsə və peyğəmbər də (sallAllahu aleyhi və səlləm) onlara bunun İsrail övladlarının (bizim üçün ilah düzəlt) deməlerinə bənzədiyini bəyan etdisə, cahilliyin bu qədər yayılması və peyğəmbərlik dönəmindən bu qədər vaxt keçməsilə onlardan başqalarının halı necə olar?" Daha sonra deyir: "İsrail övladları və peyğəmbərdən istəyənlər bütlərdən və ağaclardan nəyisə yaratmalarını və ya onlardan ruzi istəmirdilər, onlardan yalnız bərəkət diləyib və onların yanlarında ibadətə qapılmalarını istəyirdilər. Və belə olduqda bu, Allahla yanaşı ilahlar tutmaq sayıldı və buradan da, çıxır ki, ilahın mənası məbud, ibadət olunan deməkdir. **Kim əgər cahil olaraq şirk etmək istəyər və bundan qadağan olunub bunu etməzsə küfr etməz.** (Bunun mənası etməyi istəyənlə edən arasında fərqin olması demək deyildir. Bunun hər ikisi də şirkdir. Lakin şeyx hədisin qissəsi üzərində danışır).

Bu əməl səhabələrə gizli qalması ilə yanaşı “Lə iləhə illəllah” onu inkar etdi. (Şeyx Muhəmməd İbn Abdul Vahhab demişdir: "Əgər səhabələr bundan cahil oldularsa, onlardan başqası bundan cahil qalmağa daha layiqdir". "Kitabu ət-tövhid"-də bunun kiçik şirk olmasına işarə etsə də "Kəşbu əş-şubuhət" kitabında bu dediyinin əksini deyir. Məsələdə doğru olanı artıq biz sənə bəyan etdik.) Və sonra şeyx Suleyman deyir: "Və həmçinin bu hədisdə “lə iləhə illəllah”ın mənasının "Allahın hər şeyi yaradan olmasını və Ondan başqasının isə məxluq olmasını iqrar etmək" olduğunu zənn edənlərə və cahilliklə buna bənzər başqa ibarələr deyənlərə rədd və cahilliklə belə əməllərə düşən kəslərə qarşı sərt davranmağa işarə vardır". Kəlamın sonu.

Şeyx Abdullah İbn Muhəmməd İbn Abdul Vahhab "əl-Kəlimətu ən-Nəfia" kitabında şeyxülislamdan nəql etdiyi kəlamdan sonra deyir: "Şeyxin cümlənin sonunda dediyi sözü fikirləş: "**Şəkk yoxdur ki, bunların sözlərinin əsli böyük şirk və Allah təalənin yalnız tövbə ilə bağışlayacağı böyük küfrdür. Bu əməl dindən çıxmağı və aləmlərin Rəbbinə küfr etməyi gərəkdirir**". Şeyx bunu edən kəs haqda, əgər ona kitab və Sünnə ilə hüccət qalxar və sonra da əməlinin üzərində israrlı qalarsa, o anda, onun kafir olub və dindən çıxdığını bildirdi". Kəlamın sonu.

- Bax! Şeyx Abdullah dindən çıxma hökmünü müxalif olan kəsin hüccət qaldırıldıqdan sonra etdiyi israrına bağladı və bunun da şeyxülislamın məzhəbi olduğunu bəyan etdi. Sənə Allaha həmd edərək deyirik ki, qəbirləri təzim və təvaf etmək, onlar üçün nəzir vermək və onlara dua etməklə onlara ibadət etmək dindən çıxaran böyük şirkdir və bu qəbirlərə ibadət edənlər də, ümumi olaraq müşrikdir, lakin müəyyən şəxsin küfrünə qəti hökm verməyimiz üçün vacibdir ki, həmin şəxsdə təkfirin şərtləri cəm olsun və maneələr də aradan qalxsın. Onlardan çoxu bu əməlləri şəriətin əmr etdiyini zənn edirlər və bu əməlləri təvəssül adlandıraraq qəbir sahibləri barəsində deyirlər ki,

**لَهُمْ مَا يَشَاءُونَ عِنْدَ رَبِّهِمْ** (Onlar üçün Rəblərinin yanında onların istədikləri hər şey vardır)[41]. Artıq pis, azdırıcı alimlər onlara məsələni başqa cür göstərmiş, onlara yalan hədislər rəvayət etmiş və batil fətvalar vermişdirlər. Belə olduğu təqdirdə isə, onlara hüccət qaldırmaq və haqqı onlara bəyan etmək vacibdir ki, həlak olan açıq-aydın bir dəlillə həlak olsun.

Şeyx Abdullahın şeyxülislamdan nəql etdiyi bu söz "**Biz qəti olaraq bilirik ki,** peyğəmbər (sallAllahu aleyhi və səlləm) öz ümmətindən heç bir kəsə nə ölü üçün, nə də ölüyə tərəf səcdə

[41] Zumər surəsi, 34.

etməyi və həmçinin buna bənzər başqa şeyləri şəriət qoymadığı kimi, ölülərdən heç bir kəsə - istər peyğəmbərlərə, istərsə də salehlərə olsun – dua etməyi də şəriət qoymamışdır. Əksinə olaraq bilirik ki, peyğəmbər (sallAllahu aleyhi və səlləm) bütün bu şeyləri qadağan etmiş və bunlar Allah və rəsulunun (sallAllahu aleyhi və səlləm) haram etdiyi şirk əməllərdəndir. **Lakin axırzaman insanlarda dində cahilliyin çoxalması və elmin azalması səbəbi ilə, hətta onların müxalif olduqları şeylərdə peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi şey onlara bəyan olunana qədər, bu əməllərə görə onları kafir saymaq mümkün deyildir."** Kəlamın sonu. [42]

---

[42] İşarə etdiyimiz bu məchul şəxsin, şeyx Abdur Rahmən İbn Həsən Əliş-Şeyxin "Aslu dini əl-İsləm" risaləsindəki kəlamına və həmçinin də, şeyx Abdur Rahmənin zikr etdiyimiz bu sözündən sonra dediyi: "Şeyxülislama onları və xüsusi olaraq da müəyyən şəxsi yalnız bəyandan və isrardan sonra təkfir etməyi vacib edən şey tək imam olması idi. (Yəni, o, onların arasında haqqı tək olaraq yayırdı. Necə ki, Allah təalə İbrahim peyğəmbər barəsində deyir:

إِنَّ إِبْرَاهِيمَ كَانَ أُمَّةً قَانِتًا لِلَّهِ حَنِيفًا وَلَمْ يَكُ مِنَ الْمُشْرِكِينَ

***Həqiqətən, İbrahim Allaha müti, batildən haqqa tapınan bir imam (rəhbər) idi. O heç vaxt müşriklərdən olmamışdı. ( Nəhl surəsi, 120)***

Həmçinin, alimlərdən eləsi olmuşdur ki, insanlara ibadətdə şirki qadağan etdiyinə görə onu təkfir etmişdir. Şeyxülislama da, o kəslərlə yalnız dediyi kimi (hüccətdən sonra təkfir etməklə) müamilə etmək mümkün idi. Necə ki, dəvətinin əvvəllərində şeyx Muhəmməd İbn Abdul Vahhabın başına gəldiyi kimi. Şeyxülislam insanların Zeyd İbn Xattaba dua etdiklərini eşitdikdə, ümumi məsləhəni güdərək, onları qaçırmamaq üçün yumşaq sözlə onları şirkdən çəkindirməyə hazırlaşdıraraq onlara dedi: "Allah Zeyddən daha xeyirlidir". Allah təalə daha doğrusunu bilir" Kəlamın sonu. Və biz deyirik ki, Şeyxülislamın bu sözünü yalnız məsləhəyə bağlamaq açıq-aydın xətadır və icazəli deyildir. Çünki şeyxülislam öz kitablarında bir çox yerlərdə onların hökmünün bundan ibarət olduğunu, yəni, hüccətdən sonra təkfir olunduqlarını bildirmişdir. Əgər məsləhə üçün olmuş olsaydı, onda onların hökmünün bundan ibarət olduğunu deməz, əksinə, bəzi yerlərdə onların üzrlü olmadıqlarını zikr edərdi. Şeyxülislam açıq-aydın bildirmişdir ki, bu əməlləri edən şirk edir və bu əməllər qadağan olunmuş şirkin özüdür. Beləliklə də, təkfiri ümumi itlaq etmiş, lakin müəyyənə aid etməmişdir və elə buna görə də onunla müharibə etmişdirlər. Əgər belə deyilsə, onda yalnız hüccətdən sonra təkfir etməsini deməsi nə məna ifadə edir? Şeyxülislamın və həmçinin də şeyx Muhəmməd İbn Abdul Vahhabın bütün bunların hamısını təqiyyə və məsləhə üçün demiş olmaları heç ağlabatandırmı? Onlar bu hökmü zikr etmiş və özlərindən sonra gələn alimlər də, bu hökmü onlardan götürmüşdürlər. Və artıq bu

Şeyx Abdullah şeyxülislamdan nəql edir ki, İbn Bəkri[43] ölülərdən kömək istəməyin icazəli olduğuna dair kitab yazmış və

kəlamı - "**Biz qəti olaraq bilirik ki,....**" Şeyx Abdullah "əl-Kəlimətu ən-Nəfia" kitabında nəql etmiş və buna yuxarıda gətirilən bu etirazlarla qarşı çıxmamış, əksinə buna müvafiq olmuşdur. Və həmçinin, Əbu Batin bunu "əl-İntisaru lihizbilləhi əl-muvahhidin" kitabında gətirmiş və o da buna müxalif olmamışdır. Və bildirmişdir ki, şeyxülislamın məqsədi "Kim belə edərsə kafirdir" sözünü ümumən itlaq etməklə yanaşı, **hüccət qalxmamış müəyyən şəxsləri təkfir etməməkdir.** Həmçinin, Şeyx Əbu Batin öz risaləsində (Məcmuu ət-Tövhid, səhifə 209; Məkkə şəhəri "Hukumə" mətbəəsi) qəbirlərə ibadət edənlərin şirklərini zikr etdikdən sonra deyir: "**<u>Lakin şeyxülislamin dediyi üzrə, heç bir kəsə Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiyi bəyan olunmayana qədər "O, kafirdir" demək olmaz.</u>** Əgər bəyandan sonra israr edərsə, onda onun küfrünə hökm verilər, qanı və malı halal olar". Kəlamın sonu.

Şeyx bunu sabit bir hökm etdi və bunun məsləhə üçün olduğunu zikr etmədi. Bu da, əlhəmdulilləh, açıq-aydındır.

- Şeyx Əbu Batinin başqa bəzi risalələrində ziddiyyətlərın ortaya çıxdığını və şeyxülislamdan onun üzrü yalnız zahir olmayan gizli məsələlərdə və həmçinin də, kiçik şirkdə gördüyünü zikr etdiyini görürük. Bəzən isə, etdiyi nəqlə müxalif olmaqla yanaşı işarə edir ki, cahillik üzrlü deyildir. Misal olaraq, "əl-İntisaru lihizbilləhi əl-muvahhidin" risaləsində bu kimi sözlər zikr etdikdən sonra qayıdır və şeyxülislamdan "**Biz qəti olaraq bilirik ki,.....**" sözünü nəql edir və sonra da, yuxarıda zikr etdiyimiz kimi, ona müxalif olan heç bir etirazlarla qarşı çıxmır. Bu məqamda ən layiq olan şeyxin kəlamını ibarədə qüsura yozmaqdır. Şeyx burada "Şirk edən cahil heç vaxt təkfir olunmaz" deyənlərə rədd edir. (Necə ki, Şeyx Muhəmməd İbn Abdul Vahhabın münaqişə etdiyi kəslərdən bu haqda əvvəldə zikrlər etdik.). Belə olduqda məna bundan ibarət olur ki, onlara cahilin təkfir olunduğunu zikr edir və qəsdi də hüccətdən sonraya aiddir. <u>Və həmçinin bu işlərdə cahili üzrlü bilməməsindən məqsədi, ona qarşı sərt davranılmasıdır</u>. Allah daha doğrusunu bilir.

Həmçinin Şeyx Abdullah İbn Həsən Əliş-Şeyxin öz "əl-Aqidətu əs-Sələfiyyə" risaləsindəki cahilin tövhiddə üzrlü olmaması sözü elmsizliyin ümumi olaraq üzr olmaması və xüsusilə də, bu məsələlərdə üzr olmaması mənasına aparılır ki, **bunun da mənası, insan ona vacib olan elmdə səhlənkarlıq etdiyinə görə cəzalandırılması mənasında olur.** Allah daha doğrusunu bilir.

Və yaxud da şeyxin sözü şəriətdən bütünlüklə üz döndərən kəsə aid olunur – az sonra bunun hökmünü zikr edəcəyik inşə Allah. Ehtimalları əgər heç bir tərəfə aparmaq mümkün olmadıqda isə, onda onların bu sözləri dedikləri sözlərdə ziddiyyətlərin olduğuna və zikr etdiyimiz alimlərə müxalif olduqlarına görə bəzi alimlərin etdikləri çəkinilməsi vacib olan xətalardan sayılmalıdır.

[43] Sufi alimlərindən olmuşdur. İbn Kəsir öz "Tarix"ində deyir: "Ali İbn Yaqub İbn Cibrin əl-Bəkri əş-Şafii əl-Misri. Sultan bir neçə dəfə onun qətlini istəsə də, əmirlərin şəfaəti ilə canını qurtarmışdır. Ölülərdən istiğasə etməyi qadağan etdiyinə görə şeyxülislama rəddiyyə

orada şeyxülislamı təkfir etmişdir. Və zamanının alimlərindən heç bir kəs şeyxülislama yazdığı rəddiyyəyə görə ona müvafiq olmamışdır. Şeyxülislam bəyan etmişdir ki, elm və iman əhli onlara müxalif olan kəsi təkfir etmirlər, hətta müxalif olan kəs bunları təkfir etsələr belə. Və deyir: "Həmçinin, müəyyən şəxsi təkfir etmək və onun qətlini icazəli bilmək peyğəmbərlik hüccətin ona çatmasına bağlıdır, o hüccət ki, ona müxalif olan kəs kafir olur. Yoxsa ki, dindən hər hansı bir şeydə cahil olan hər bir kəs təkfir olunmur". Kəlamın sonu.

## Şeyx Suleyman İbn Səhmən

Şeyx Suleyman İbn Səhmən "Minhəcu əhli əl-haqqi val-ittiba" kitabında Nəcd diyarında tövhid dəvətinin tabeçilərindən olan bəzi həddi aşanlara (ğulatlara) rəddində deyir: "Bil ki, məhz İslam əhlinin şeyxləri və onların elm tələbələrindən olan qardaşları – o şeyxlərin yolunda olanlar –məhz onlar şeyxülislam Muhəmməd İbn Abdul Vahhabın yoluna tabe olmuş, öz zamanında olan Nəcdin şəhər və kənd əhli barəsində onun bütün sözlərini götürmüşlər. Və eləcə də, onun Nəcd əhlinin bədəviləri barəsində nəql etdiyi altıncı bənddə dediyi sözünü də onlar götürmüşlər - belə ki, onları Allahın tövhidinə dəvət etdikdən və onlara hüccət qaldırdıqdan, onları (dəlillərlə) qorxutduqdan və üzrü onlardan qaldırdıqdan sonra onlara təkfir edici vəsfi vermişdir.[44] Həmçinin,

---

etmişdir. Təkfirdən canı qurtardısa, yalnız cahilliyinə görə qurtardı". İxtisarla kəlamın sonum (tərc).

[44]Amma o ki qaldı şeyx Suleymanın "Minhəcu əhli əl-haqq" kitabının əvvəlində şeyxin dəvətdən qabaq vadi əhlini təkfir etməsinə, mən bilmirəm şeyxin bundan istəyi əsli küfrdür, yoxsa riddə küfrüdür. (yəni bunlar əslən İslama girməyən kafirlər kimidir, yoxsa İslama girib sonradan etdikləri küfrə görə dindən çıxanlardır- tərc.). Əgər ikincidirsə hüccətdən qabağı qəsd edir, yoxsa sonranı? Burada və həmçinin, "Təbriətu əş-Şeyxeyn əl-İmameyn" kitabında zikr etdiyinə və şeyxdən nəql etdiyinə görə açıq-aydındır ki, onlar hüccətdən sonra kafir olmuşlar. İnşə Allah sənin üçün bunları da nəql edəcəyik.

bu alimlər onun Şərifə yazdığı məktubda insanları nə ilə təkfir etdiyi və onlarla nəyə görə vuruşduğu haqda sualına verdiyi cavabını və həmçinin Suveydiyə yazdığı məktubunda insanları ümumi olaraq təkfir etməsi haqda sözünü də götürmüşlər. Həmçinin ondan sonra övladlarının bu məsələdə dedikləri sözlərini götürmüşlər və biz onların dediklərini gətirəcəyik... **Və sonra şeyxdən nəql edərək deyir: "Əgər biz Əhməd Bədəvinin qəbri üstündə olan bütə ibadət edənləri onların cahilliyinə və onları ayıldanın və çəkindirənin olmadığına görə təkfir etmiriksə...**"[45]

Daha sonra şeyx Suleyman deyir: "Şeyx Huseyn İbn Muhəmməd və qardaşı Abdullah İbn Muhəmməd İbn Abdul Vahhab müxtəlif məsələlərdən soruşulduqda bu suallara cavab verdikdən sonra deyirlər: On səkkizinci məsələ dəvətin çatmış olduğu ölkə əhli barəsində: Onlardan bəziləri deyir ki, bu haqdır və nə münkəri inkar edir, nə yaxşını əmr edir, nə də ki, düşmənçilik edir..... və tövhid əhli "atalarımızın, babalarımızın dinindən üz döndərdik" dedikdə onlara qarşı inkar edir və onlardan bəziləri isə açıq-aşkar ya müsəlmanları təkfir edir, ya da bu dini söyərək deyir ki, bu, Museyləmənin dinidir. "Bu haqdır" deyən kəslərin bu şeyləri açıq-aşkar demələri mümkün deyildir. Belə olduqda bu hal üzrə olan bu diyar barəsində nə deyirsiniz? Onlar müsəlmandırlar yoxsa kafir? Şeyxin və başqalarının "Biz ümumu olaraq təkfir etmirik" sözlərinin mənası və ümumi ilə xüsusinin mənası nədir? (Cavab): Bu ölkənin zikr olunan bu əhalisi əgər üzərilərinə tərk edənin kafir olduğu hüccət qalxmış olarsa,

---

Onların əsli kafir olması sözünə gəldikdə isə, bu batil bir sözdür, bunu alimlərdən heç bir kəs deməmişdir. Yalnız Alləmə Sənanidən başqa. O bunu "Təthiru əl-etiqad" adlanan "Təcridu ət-tövhid" risaləsində demişdir. Şeyx isə buna müxalif olmuşdur. Bir neçə səhifədən sonra bunu nəql edəcəyik.

[45] Şeyx Muhəmməd İbn Abdul Vahhab Nəcddə, Əhməd Bədəvinin qəbri isə Misirdə olub və necə deyilə bilər ki, Şeyx bunu məsləhə üçün demişdir.

onların hökmü kafir hökmüdür. Onların arasında yaşayan və dinini izhar edə bilməyən müsəlman, əgər Allahın üzr verdiyi kəslərdən deyilsə, onda ona hicrət etmək vacibdir. Yox əgər hicrət etməzsə, onda onun hökmü öldürülmək və malının əlindən alınmasında onların hökmündə olar. Şeyxin "Biz ümumi olaraq təkfir etmirik" sözünün mənasına gəldikdə isə, burada ümumi ilə xüsusi arasındakı fərq açıq-aydındır. Ümumi olaraq təkfir etmək insanların hamısını – alimini, cahilini, hüccət qalxanını və hüccət qalxmayanını təkfir etmək, xüsusi təkfir isə, ancaq risali hüccət qalxanları təkfir etməkdən ibarətdir, o hüccət ki, ona qarşı çıxan kəs kafir olur". Kəlamın sonu.

Və həmçinin şeyx Suleyman İbn Səhmən on üçüncü məsələdə zahiri nə İslam, nə də küfr olmayan, əksinə cahil olan kəslə müamilənin necəliyinə cavab verdikdə deyir: "Amma o ki qaldı zahiri nə İslam, nə də küfr olmayan, əksinə cahil olan kəsə, biz deyirik ki, əgər bu cahil insanın özündə onu İslama daxil edən əsl olarsa, o müsəlmandır, hətta lap dininin təfsilatlarından cahil olsa belə [46], Allah və rəsulunun qoyduğu şəriətin təfsilatlarını

[46] **Cümhur alimlərin üzərində olduğu budur ki, insanı İslama daxil edən əsl, şəhadət kəlməsini nitq etmək və bunu etiqad etməkdir**. Şeyxülislam deyir: "Artıq peyğəmbərin (sallAllahu aleyhi və sələm) dinindən məcburi olaraq bilinmiş və ümmət də bunun üzərində ittifaq etmişdir ki, İslamın əsli və insanların ən birinci əmr olunduqları şey "Lə iləhə illəllah və Muhəmmədun rəsulullah" şəhadətidir. Və bununla da kafir olan kəs müsəlmana çevrilir". Kəlamın sonu. Bunu Abdur Rahmən İbn Həsən əliş-Şeyx "Fəthul Məcid" kitabında şeyxülislamdan nəql etmişdir. Və İbn Həcər "Fəthul Bəri"-də 13-cü cild, 354-355-ci səhifələrdə deyir: "İbn Abbasın hədisində əvvəldə keçməyən faydalardan da biri budur ki, əgər kafir olan kəs şəhadəti iqrar edərsə, onun İslamına hökm verilir". Və bu mövzuda bu iki sözdən başqa sözlər nə çoxdur! Və həmçinin peyğəmbərin (sallAllahu aleyhi və səlləm) **"Hər bir doğulan şəxs fitrət üzrə doğulur"** sözünə görə kim iki müsəlman valideyndən dünyaya gələrsə, onun da İslamına hökm verilir. Bu da alimlərin hamısının ittifaq etdiyi bir məsələdir, bunda yalnız Allahı tanımaqda istidləli və fikirləşməyi vacib edən kəlam əhli müxalif olmuşlar. Məqsəd şəhadət kəlimənin dəlalət etdiyini fəhm etməkdir. Lakin bu fəhm vacibdir, yoxsa şərtdir? Doğru olan budur ki, Allah təalənin فَاعْلَمْ أَنَّهُ لَا إِلَٰهَ إِلَّا اللَّهُ ***- Bil ki, Allahdan başqa (ibadətə layiq olan) heç bir məbud yoxdur. (Muhəmməd surəsi 19)*** ayəsinə əsasən bu, vacibdir. Buna şərt demək üçün heç bir xas dəlil tapmadıq.

öyrənməyə qüdrəti olmayan adi müsəlmanlara, şəriətin təfsilatını öyrənməyə Allahın qüdrət verdiyi alimlərin bildiyi təfsilatı bilmək vacib deyildir...." və sonra deyir: "Əgər  insanda onu İslama daxil edən əsl olmazsa, onda o kəs kafirdir və onun küfrü də dini öyrənməkdən üz döndərməsi (erad) səbəbilədir, onu nə bilmir, nə öyrənmir və nə də ona əməl etmir.[47]

Zahiri nə İslam, nə də küfr olmayan ifadəsinin mənə görə heç bir mənası yoxdur, çünki labüddür ki, insan ya cahil müsəlman, ya da cahil kafir olmalıdır. Kimin zahiri küfrdürsə, o, kafir və kimin də zahiri asiliklərdirsə, o, asidir. Biz də yalnız hüccət qalxdıqdan sonra Allah və rəsulunun təkfir etdiyi kəsi təkfir edirik. Kəlamın sonu.

---

(Çünki əgər şərt deyilərsə, onda kəlam əhli, misal olaraq məturidilər İslama girməmişlər, çünki onlara görə şəhadət kəlməsinin mənası "Allahdan başqa yaradan yoxdur" deməkdir. Onların kafir olmasını isə ümmətdən heç kim deməyib. tərc.)  Qeyri ərəblər İslam Fəthləri zamanı dəstə-dəstə Allahın dininə girir və şəhadət kəliməsindən başqa bir şeylə mükəlləfiyyətlik daşımırdılar. Sonra isə dini öyrənirdilər. Əgər İslamdan sonra onlardan riddə baş verərdisə, hüccətdən sonra bu riddənin hökmü ilə müamilə olunardılar. Bu əcəmilər ərəb dilini başa düşmürdülər, o ki qaldı şəhadətin mənasını anlasınlar. Lakin etiqad edirdilər ki, bu din haqdır. Əksinə, bəzi ərəblər şəhadət kəliməsinin nəyə dələlət etdiyini başa düşmürdülər və kimlərinsə bunu başa düşməyi isə onu göstərmir ki, onların hamısı bunu başa düşmüşdürlər. Lap onun lüğəti cəhətdən nəyə dələlət etdiyini başa düşsələr belə, bu onun şəri cəhətdən nəyə dələlət etdiyini başa düşmələrini gərəkdirmir. Necə ki, hakim təyin etmək, mühakimə məsələsi şəhadətin dələlət etdiyi şeylərdən olması kimi. Bunu yalnız Quran onlar üçün açıqlamış və onlar da buna iman gətirmişdirlər. Peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) təbərrük üçün silah asmağa ağac tələb edən səhabələr kimi, bunlar "lə iləhə illəllah"ın mənasının ağacla təbərrük etməyi qadağan etdiyini bilmirdilər. Bu məsələ barəsində təfsilatı ilə müəyyən şəxsə İslam hökmü vermək haqqında xüsusi risalədə danışacağıq. Burada sənəvilər (iki ilahın – xeyir ilahı və şər ilahı olduğunu deyən bir yoldur), əhli kitab və həmçinin də təvaqquf (hökm verməkdə durmaq, hökm verməmək) məsələlərindən alimlərin sözlərinə aydınlıq gətirəcəyik.

[47] Bu tam olaraq dindən üz döndərib, nə əməl edən və nə də ki, öyrənməyən bir kəsdir. Və bu kəsdə şəri naslarda heç bir şübhə də yoxdur, əksinə zənn edir ki, başlı-başına buraxılıb, əmr və qadağaların buna aidiyyatı yoxdur. Bunun hökmü risalənin axırında gələcəkdir inşə Allah.

Şeyx açıq-aydın bəyan etdi ki, o, hər bir halda təkfir etmir, yalnız şəri dəlillə və hüccətdən sonra təkfir edir.

"Siyənətu əl-İnsən" kitabında 445-ci səhifədə şeyxin düşmənlərindən birinin ona atdığı iftiralarını zikr etdikdən sonra müəllif deyir: "İftiraçının "Şeyx özünün sözünə müvafiq olanlardan başqa ümmətin hamısının, ümumi və xüsusilərinin təkfirinə getmiş və onlarla vuruşmuşdur" sözü onun yalan təsəvvürənə dəlalət edir.... və sonra müəllif deyir: "Əksinə şeyx Muhəmməd İbn Abdul Vahhabın sözü rəsulların icma etdikləri şeylərdəndir ki, ... yalnız etibar olunan hüccət qalxdıqdan sonra, bu əslə görə təkfir olunur. Və şeyx bunda doğru yol üzrədir, özündən əvvəlkilərə tabe olub, heç bir yenilik gətirməyib" və 446-cı səhifədə deyir: "Amma iftiraçının sözü ki, "Şeyx müsəlman ölkələrini əsli kafir etmişdir" - bu söz yalan və böhtandır. Belə şey baş verməyib, deyilməyib və müsəlmanlardan heç bir kəsdən də bunu bilmirəm, o ki qaldı bunu din və elm əhli desin. Əksinə elm əhlinin hamısı icma etmişdir ki, bütün zamanlarda və məkanlarda müsəlman ölkələrinin hökmü İslam hökmüdür. İnsanlar yalnız peyğəmbərlərə, mələklərə və salehlərə ibadət edən, onları aləmlərin Rəbbinə ortaq tutan və onlara qəbirpərəstlərin həddi aşanları (ğulatları) kimi (kainatda) idarəçilik və ağalıq isnad edən müşriklərin ölkələrindən və bu kəslərin küfründən, şirkindən və zəlalətindən danışmışlar. Elm əhlində ittifaqla bilinən də budur ki, şəhadəti gətirənlərdən kim bu şeyləri edərsə, ona hüccət çatdıqdan sonra onun küfrünə və dindən çıxmasına hökm verilər və **bu kimi kəsləri əsli kafir saymamışlar.** Və mən buna (yəni, əsli kafir görməyi - tərc.) heç bir kəsdən yox, yalnız Muhəmməd İbn İsməil əs-Sananidən "Təcridu ət-tövhid"[48]

[48] Burada mən sənə Sananinin öz risaləsində dediyini nəql edirəm. Belə ki, qəbirpərəstlərin bütlərə ibadət edənlər kimi müşrik olmasını zikr etdikdən sonra deyir: "Əgər desən ki, onlar etdikləri şeylərlə müşrik olmalarını bilmirlər, mən deyirəm: Artıq fəqihlər fiqh kitablarında riddə fəslində açıq-aydın bildirmişlər ki, kim küfr kəliməsi işlədərsə, hətta onun mənasını

qəsd etməsə belə kafir olur. Bu da onların İslamın həqiqətini və tövhidin mahiyyətini bilmədiklərini göstərir. Və belə olduqda da onlar əsli küfrlə kafir olurlar." Kəlamın sonu.

Mən deyirəm: Şəkk yoxdur ki, bu alimlərin çəkinilməsi lazım olan xətalarındandır və ona da "Siyənətu əl-İnsan" kitabının müəllifinin sözündə keçdiyi kimi, alimlərdən heç bir kəs müvafiq olmamışdır. Ustaz Məsud Nədəvi ("Muhəmməd İbn Abdul Vahhab muslih məzlum" kitabı, səhifə 216) zikr etmişdir ki, şeyx Muhəmməd İbn Abdul Vahhab Sananiyə müvafiq olmuşdur, yalnız o, hüccəti tamamlamağı şərt qoymuş və buna görə də, onların hamısını təkfir etməmişdir. Mən deyirəm: Məlumdur ki, Şeyx ona yalnız bunda müvafiq olmuşdur ki, qəbirlərə ibadət edənlər müşrikdirlər - əsli kafir deyillər və bununla da yanaşı, hüccəti tamamlamağı şərt görmüşdür. Şeyx Suleyman İbn Səhman deyir: "Şeyx, yalnız övliyalara və salehlərə dua edən bütlərə ibadət edənləri və bunlardan başqa Allaha şərik və ortaq qoşanları hüccət qaldırdıqdan və doğru yolu bəyan etdikdən sonra təkfir etmiş və bunlar şeyxlə döyüşməyə başladıqdan sonra onlarla vuruşmuşdur...." Kəlamın sonu. ("Təbriətu əş-Şeyxeyn" səh. 86; Nədəvidən nəql olaraq).

Buna görə də Şövkəni Sananinin bu sözdən döndüyünü rəvayət etmişdir ("Əd-Durru ən-Nədiyyə" kitabında, Nədəvi rəvayət etmişdir). Baxmayaraq ki, Şeyx Suleyman İbn Səhman bunu inkar etmişdir. Ola bilsin ki, o, şirklərini görməklə yanaşı yalnız əsli kafir sözündən dönmüşdür, necə ki, bu da şeyxin etiqadıdır, lakin hüccət qaldırdıqdan sonra və doğru olan da budur.

Sanani bundan sonra deyir: "Əgər desən ki, onlar müşrikdirlərsə, onlarla cihad etmək və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) müşriklərdə tutduğu yolu onlarla tutmaq vacib olur. Onda mən deyərəm: Elm imamlarından olan alimlərdən bir dəstə buna getmiş və demişlər ki, ən birinci olaraq onları tövhidə dəvət etmək, onların fayda və zərər verəcəyini etiqad etdikləri şeylərin onlar üçün Allah yanında heç bir fayda verə bilməyəcəyini, bunların da onlar kimi məxluq olmalarını bəyan etmək və həmçinin onların bu etiqadlarının şirk olmasını, peyğəmbərlərin gətirdiklərinə olan imanın yalnız bu şeyləri tərk etməklə və bundan tövbə etməklə, tövhidi – etiqad və əməl olaraq – yalnız Allah üçün fərdləşdirməklə tamamlanmasını onlara bəyan etmək vacibdir. Və alimlərin üzərinə vacibdir ki, qəbirlərə nəzir vermək, qurban kəsmək və onları təvaf etməklə etdikləri bu etiqadların haram və şirk olmasını onlara bəyan etsinlər və bildirsinlər ki, bu əməllər müşriklərin öz bütləri üçün etdikləri əməllərin eynilə özüdür. Əgər alimlər bunları imamlara və hakimlərə bəyan etsələr, onda imamlara və hakimlərə də vacib olur ki, insanlara onları tək Allaha ixlasla ibadət etməyə çağıran dəvətçilər göndərsinlər. Və kim bundan sonra qayıdar və (tövhidi) iqrar edərsə onun malı, qanı və namusu qorunar və kim də bunda israr edərsə, onda Allah təalə peyğəmbərinə müşriklər barəsində halal etdiyi şeyləri bunun barəsində də halal edər". Kəlamın sonu. (Sananinin "Tathiru əl-etiqad" kitabından). **Bax, oxuduğun kimi, Sanani qanın halal olmasını yalnız imamlara hüccət çatdıqdan sonra və insanlara dəvətçilərin göndərilməsindən sonra israr edənlər barəsində hökm verdi və bu da bizim məzhəbimiz, tutduğumuz yolun özüdür. Əgər onlar əsli kafir olmuş olsaydılar, bu (hüccət) vacib olmazdı. (Oxuduğun kimi, artıq o özü zikr etdi ki, bu (hüccət) vacibdir.)** Çünki əsli kafir əgər bundan əvvəl ona dəvət çatmışdırsa, onda dəvəti yeniləmədən onunla döyüşülür və

kitabında rast gəldim. Və o bu sözünü bununla əlaqələndirmişdir ki, onlar ixlas (tövhid) kəliməsinin nəyə dəlalət etdiyini bilmir və bu da onları İslama daxil etməmişdir. Şeyximiz isə bu şey üzərində ona müvafiq olmamışdır. [49] Kəlamın sonu. ("Siyənətul-İnsən" kitabından).

## Şeyx Abdul Lətif İbn Abdur Rahmən Əli Şeyx

Qazi Əhməd İbn Həcər[50] öz "Şeyx Muhəmməd İbn Abdul Vahhab" adlı kitabında "Tarixu Nəcd" kitabından Şeyx Abdul Lətif İbn Abdur Rahmən Əli-Şeyxlə Davud İbn Curcis Bağdadi arasında olan münaqişəni nəql edir. Şeyx Abdul Lətif İbn Abdur Rahmən Əli-Şeyxdən nəql edərək deyir: "Biz, yalnız alimlərin hamısının icma etdiyi şeydə döyüşürük və o da şəhadət kəlməsidir. **Həmçinin biz kimisə öyrətdikdən sonra əgər bilər və inkar edərsə, bu halda təkfir edirik**". Sonra Şeyx Abdul Lətif zikr edir ki, insanlar bir neçə növdür. Birinci növ budur ki, kim tövhidi və şirki bilər, lakin şirki tərk etməz və tövhidə də daxil olmazsa, bu kafirdir, bununla küfrünə görə döyüşürük, çünki o, rəsulun dinini bilmiş və ona tabe olmamış, eləcə də, şirk dinini bilmiş və onu tərk etməmişdir... və sonra ikinci növü zikr edir və bu da əvvəlki növ kimidir, lakin bu növə tövhid əhlini söyməyi və müşrikləri tövhid

dəvətin yenilənməsi isə müstəhəb olur və bu yeniləmə də bu formada olmur. Məsələ açıq-aydındır, həmd olsun Allaha.

[49] Bundan əvvəldə sənə zikr etdik ki, şəhadət kəliməsinin dəlalət etdiyini bilmək şərt yox, vacibdir, müəyyən şəxsin İslamına hökm vermək üçün bunun şərt qoyulmasına isə heç bir dəlil gəlməmişdir. Əvvəlkilər İslama daxil olan kəsi imtahan etməzdilər ki, şəhadət kəliməsini başa düşmüsən ya yox? İstər İslama girən şəxs ərəb olsun, istərsə də əcəm.

[50] Əhməd İbn Həcər ali-Butami hicri 1335-1422-ci illərdə yaşamış, otuz beş il Qatar dövlətinin qazisi olmuş, sələfi etiqadını daşıyan böyük alimlərdən olmuş, bir çox əqidə və başqa kitabların müəllifi olmuşdur, bunlardan "Əl-əqaidu əs-Sələfiyyə" ilk olaraq nəzm yazmış, sonra isə onu şərh etmiş, "əş-şeyx Muhəmməd İbn Abdul Vahhab aqidətuhu əs-Sələfiyyə", "Məzhəbu əhli ət-təfvid" və s. (tərc).

əhlindən üstün tutmağı əlavə edərək deyir: "Bu əvvəlkindən daha şiddətlidir, bunda Allah təalənin bu ayəsi vardır

**فَلَمَّا جَاءَهُمْ مَا عَرَفُوا كَفَرُوا بِهِ** - ***Onlara tanıdıqları (peyğəmbər) gəldikdə isə onu inkar etdilər*** [51]

Daha sonra üçüncü növü zikr edir ki, "Kim tövhidi bilər və ona tabe olar, həmçinin şirki bilər və onu tərk edər, lakin tövhidə daxil olanları xoşlamaz və şirk üzrə qalanları da sevərsə, bu da kafirdir".

Dördüncü növ: "Kim bunların hamısından salamat qalar, lakin onun yaşadığı yer əhli tövhidə qarşı düşmənçiliyi açıq-aydın edir və onlarla döyüşməyə səy edirlər. Və bu kəsə də öz vətənini tərk etmək qeyri mümkün və çətin olur, beləcə də onlarla yanaşı tövhid əhli ilə döyüşür və öz malı və nəfsi ilə cihad edir. Bu da həmçinin, kafirdir".... və sonra deyir: "Və əgər biz, qəbirlərə ibadət edən avamları cahillikləri və onlara çatdıranın olmamasına görə təkfir etmiriksə..." kəlamın sonu. (Əhməd İbn Həcərin "Şeyx Muhəmməd İbn AbdulVahhab" kitabından səhifə 61-62-63. Və şeyx İbn Bəz səhihləşdirmişdir). Qazi Əhməd İbn Həcər "əl-Aqaidu əs-Sələfiyyə" kitabında 1-ci cild, 39-cu səhifədə deyir: "Lakin Allah və rəsuluna iman gətirmələri və şəriətdən başqa əməlləri etmələri ilə yanaşı tövhidə zidd olan bu xislətlərə bulaşmış müəyyən şəxsə və ya xas bir topluma, tayfaya küfr və şirklə hökm verilirmi? (Cavab budur ki,) belə deyilir ki, bu əməl şirkdir və ya küfrdür, məsələn övliyaya səcdə və ya qəbrini təvaf etmək və yaxud da ona nəzir etmək kimi əməllər. Lakin müəyyən şəxsin və ya xas dəstənin təkfirinə tələsmirik. Əksinə, vacibdir ki, onlara şirki bəyan edən və ondan çəkindirən Quran ayələrini və peyğəmbərin (sallAllahu aleyhi və səlləm) hədisləri təbliğ olunsun və onlara çatdırılsın ki, bu əməl sahibinin Cənnətdən payı yoxdur, bu əməllər şirkdir. Əgər müəyyən şəxs və ya hər hansı bir toplum, tayfa bundan sonra israr

---

[51] Bəqərə surəsi 89.

edər, inad göstərər və qəbul etməzsə, bu halda şirk adını bu topluma və ya fərdi insana aid etmək halal olur...." Və 42-ci səhifədə "Əgər deyilsə ki, sizin sözünüzdən belə çıxır ki, Muhəmməd ümmətinin çoxunu təkfir etmək lazımdır. Bələ ki, onlar sizin bu şirk dediyiniz şeyləri – övliyalara nəzir etmək, onlar üçün qurban kəsmək və onlardan yardım istəmək kimi bu əməlləri edirlər. (Cavab) birincisi: **Ümumi deyilən söz xüsusi sözdən ayrıdır, fərqlidir**. İkincisi: Bir çox yerlərdə və ölkələrdə baş verən tövhiddə, pak Sünnədə, şirkdə, şirkin qismlərində və ona aparan vəsilələri bilməkdə **cahilliyin artması və elmin azalması məhz bu şeylər, müəyyənə şirklə hökm verməkdə maneə olur**. Yalnız o kəsdən başqa ki, ona dəlillər çatmış, hüccət qalxmış və bundan sonra inad göstərərək israr edərsə, bu kəsə şirklə hökm verilir". Kəlamın sonu.

"Ğayətu əl-əməni" kitabının müəllifi [52] (Bu kitab şeyx Muhəmməd İbn Abdul Vahhabın dəvətinin düşmənlərindən birinə rəddiyyədir) şeyxülislamın kəlamını nəql etdikdən sonra 22-ci səhifədə deyir: "Gətirdiyimiz dəlilərdən bu hasil olur ki, həddi aşanlar (ğulatlar), Allahdan başqasına dua edənlər və qəbirlərə ibadət edənlər əgər etdikləri bu əməllərin hökmündən cahil olarlarsa və elm əhlindən də heç bir kəs bu xətaları onlara bildirməyibsə, heç bir kəsin onları təkfir etməyə haqqı çatmaz. Amma o kəs ki, ona hüccət qalxıb və etdiyi əməl üzərində israr edir və təkəbbürlük göstərir, yaxud elm əldə etməyə əli çatır, lakin öyrənmir, bu kəsin hökmünü zikr edəcəyik...." kəlamın sonu. ("Ğayətul-əməni", 1-ci cild).

[52] Alləmə Mahmud Şükri əl-Əlusi –vəfatı hicri 1342 (tərc)

## Hafiz Əz-Zəhəbi[53]

Böyük günahlar mövzusunda olan "Risalətu əs-Suğra" kitabında (bu kitab onun məşhur "Kəbəir" kitabından başqa bir kitabdır.) üçüncü böyük günahı (sehrin şirk olmasını) zikr etdikdən sonra deyir: "Bil ki, bu günahlardan çoxunda – çox az bir qismindən başqa hamısında – ümmətdən bir çoxu bunların haramlığından cahildir və bu şeylərdə hədə və nəhy dəlilləri onlara çatmayıb. Alim olan kəsə lazımdır ki, cahilin üzərinə tələsməsin, əksinə onunla yumşaq davransın və Allahın ona verdiyi elmdən bu kəsə də öyrətsin. Xüsusilə də, əgər insan cahillikdən yenicə çıxmış, uzaq küfr diyarlarında yaşamış və əsir götürülərək İslam diyarına gətirilmiş, ərəb dilini bilməyən türk və ya müşrik çerkezlərdən olarsa və elmi, anlayışı olmayan türk əmir onu satın almışsa, bu kimi kəslərdə xüsusən tələsməmək və yumşaq davranmaq lazımdır. Bu kəs şəhadət kəliməsini çox çətinliklə nitq edir və əgər bir neçə gündən sonra şəhadət kəliməsinin mənasını anlaması üçün ərəb dilini başa düşərsə nə gözəl. Sonra isə belə kəs ya namaz qılır, ya da qılmır. Ustadında əgər dindən nəsə varsa, ona fatihə surəsini uzun-uzadı təlqin edər, yox, əgər ustadı da özü kimidirsə, onda bu miskin haradan İslam şəriətlərini, günahları öyrənsin və ondan çəkinməyi bilsin, vacibləri bilsin və onu yerinə yetirsin? Əgər həlak edici günahları bilər və ondan çəkinərsə, eləcə də, fərzlərin rükunlarını bilər və onu etiqad edərsə, bu insan xoşbəxt insandır, bu isə nadir haldır. Qula vacib olan, afiyətə görə Allaha həmd etməkdir. Əgər deyilsə ki, bu kəs səhlənkarlıq etmişdir, belə ki, özünə vacib olan şeyləri soruşmamışdır, onda deyilər ki, onun heç ağlına belə gəlmir ki, onu öyrədən kəsdən soruşmaq ona vacibdir. Allah kimə nur verməsə onun nuru olmaz. Hər bir kəs

[53] Hicri 748-ci ildə vəfat edib (tərc)

yalnız elmdən və özünə hüccət qalxdıqdan sonra günah daşıyır. Allah qullarına Lütfkar və Şəfqətlidir. Allah təalə buyurur:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

***Biz elçi göndərməmiş (heç kəsə) əzab verməriк.***[54]

Səhabələr Həbəşistanda olduqda vacibatlar və haramlar nazil olur və bu da onlara yalnız bir neçə aydan sonra çatırdı. Bu aylar ərzində onlara dəlil gəlib çatana qədər, onlar cahilliyə görə üzrlü idilər. Həmçinin elmi olmayan kəs də, ona dəlil çatana qədər cahilliyə görə üzrlüdür." Kəlamın sonu. ("Kəbəir" (Böyük günahlar) kitabı, haşiyə səhifə 16).

Və bütün bunlar, dini işlərdə cahili üzrlü bilmələrində Əhli Sünnə vəl-Cəməa alimlərindən – çoxunu tərk etməklə yanaşı – nəqlinə müyəssər olduğumuzdur. Əvvəldə keçdiyi kimi, alimlərdən etdiyimiz bütün bu nəqllərin hamısı şirki məsələlərə aiddir. Cahilliyin üzrlü olmasında başqa alimlərin sözləri də vardır ki, bunlar da ümumi olaraq dini məsələlərə aiddir. Burada bunlardan bəzilərini inşə Allah nəql edəcəyik. Bilərək ki, bu alimlərdən cahilliyi üzr görməkdə məsələlərin arasında fərq qoymaq varid olmamışdır. Fərq yalnız məsələdə elmin olub-olmamasındadır.

## İmam Əş-Şafii

İbn Həcər "Fəthul-Bəri" kitabında 13-cü cild, 407-ci səhifədə və Hafiz əl-Həkəmi "Məaricul-qabul" kitabında 1-ci cild, 329-cu səhifədə ondan nəql edirlər ki, İmam əş-Şafii[55] deyir: "Allahın adları və sifətləri vardır ki, bunları da Allah Öz kitabında gətirmiş və peyğəmbər də (sallAllahu aleyhi və səlləm) bunları öz ümmətinə xəbər vermişdir. Allahın yaratdıqlarından hüccət

[54] İsra surəsi 15.

[55] Əbu Abdullah Muhəmməd İbn İdris əş-Şafii əl-Quraşi, Şafii məzhəbinin imamı, hicri 150-204-cü illərdə yaşamışdır (tərc).

qalxmış heç bir kəsin bunları rədd etməsinə gücü çatmaz. Çünki bunu Quran gətirmiş və ədalətli səhabələrin rəvayət etdikləri hədislərdə peyğəmbər (sallAllahu aleyhi və səlləm) bunları xəbər vermişdir. Və kimsə ona hüccət qalxmağı sabit olduqdan sonra, bunlara qarşı çıxarsa, o kəs kafirdir. Amma hüccət qalxmamışdan qabaq isə o, cahilliyə görə üzrlüdür. Çünki bunlar nə ağılla, nə yuxu ilə və nə də ki, fikirlə bilinmir. Bunlardan cahil olan hər hansı bir kəs yalnız bunlar barəsində olan xəbər ona çatdıqdan sonra təkfir olunar." Kəlamın sonu.

## İmam Ən-Nəvəvi[56]

"Səhih Muslim"in şərhində 1-ci cild, 173-cü səhifədə ("''Lə iləhə illəllah" deyənə qədər insanlarla döyüşülməyin əmri" fəslində) *"İnsanlarla döyüşülməklə əmr olundum"* hədisinin şərhində, fəslin əvvəlində Əbu Bəkrin vaxtındakı mürtədlərin sinifləri barəsində Xattabinin sözünü nəql etdikdən sonra deyir: "Xattabi deyir: "Əgər deyilsə ki, zəkatı verməkdən boyun qaçıran o dəstənin etdikləri o əməli yozaraq necə olur ki, onları zülm əhli (əhli bəğy) adlandırırsan? Və bizim bu zamanımızda da, müsəlmanlardan hər hansı bir qövm, zəkatın fərz olmasını inkar edər və onu verməkdən boyun qaçırarsa, bunların da hökmü həddi aşan, zülm edən qövmün hökmü olacaqmı? Deyirik ki, yox. İndiki zamanda zəkatın fərzliyini kim inkar edərsə, müsəlmanların icması ilə o, kafir olar. İndikilərlə onların arasında olan fərq bundan ibarətdir ki, onlar indiki vaxtda baş verə bilməyəcək bir neçə səbəblərə və işlərə görə üzrlü bilindilər. Bunlardan, əhkamların nəsx olunmaqla dəyişilməsi baş verən şəriət vaxtından az bir müddətin keçməsi və həmçinin o qövmün dində cahil və İslamda da yeni olmaları

[56] Muhyi əd-Din Əbu Zəkəriyyə Yəhyə İbn Şəraf əş-Şəfii , "əl-Minhəcu fi şərhi Muslim" və başqa böyük əsərlərin müəllifi, hicri 631-676-cı illərdə və`fat etmişdir (tərc).

səbəbilə onlara şübhə daxil olmuş və buna görə də üzrlü bilinmişlər. Amma bu gün isə, artıq İslam dini və zəkatın vacib olması elmi müsəlmanlarda yayılmış[57], hətta bunu ümumi və xas insanlar bilmiş və alim də, cahil də bunda müştərək olmuşdur. Və belə olduqda heç bir kəs bunu inkar etdikdə təvil etməyə görə üzrlü bilinməz və həmçinin də, dinin işlərindən – beş vaxt namaz, ramazan ayının orucu, cənabət qüsulu, zinanın, spirtli içkinin, naməhrəmlərlə nikahın haramlığı və buna bənzər başqa əhkamlar kimi elmi yayılmış, ümmətin icma etdiyi hər hansı bir şeyi inkar edən kəs üzrlü bilinməz. **Yalnız İslamda yeni olan və dinin hüdudlarını bilməyən kəsdən başqa, bu kəs cahillikdən dolayı dindən hər hansı bir şeyi inkar edərsə təkfir olunmaz**". Kəlamın sonu. (İmam ən-Nəvəvi də, bu sözü bəyənmişdir).

## Hafiz İbn Həcər

İbn Həcər[58] "Fətu əl-Bəri" kitabının 12-ci cildinin 277-ci səhifəsində, "Fərzləri qəbul etməkdən boyun qaçıran kəsin öldürülməsi və riddəyə nisbət edilməsi" fəslində deyir: "Fərq qoymaqda murad budur ki, kim ki, namazı iqrar edər və zəkatı inkar edər və ya onun fərzliyini etiraf etməklə verməkdən boyun qaçırar; qissənin əvvəlində küfr kəlməsini hər iki sinfə şamil olması üçün ləfzi ümumi işlətmişdir. Belə ki, zəkatı inkar edənlər haqqında bu həqiqi mənada və başqaları haqqında isə bu məcazi

[57] Bu hicri dördüncü əsrdə Xattabinin zamanında deyilmiş bir sözdür. Peyğəmbərdən (sallAllahu aleyhi və salləm) səhih olaraq gəlmişdir ki, din qərib olaraq qayıdacaq və həmçinin, səhih olaraq gəlmişdir ki, zaman gələcək insanlar o zamanda dindən "lə ilahə illəllah"dan başqa heç bir şey bilməyəcəklər və Huzeyfə də, (radiyAllahu anhu) demişdir ki, bu onlara fayda verəcəkdir. Həmçinin, səhih olaraq gəlmişdir ki, cahilliyin yayılması Qiyamətin əlamətlərindəndir. Və dinə bir çox dəlalət edən şeylər vardır ki, insanların çoxu bunları bilmir. Və belə olduqda da, haqla Allahın hüccətini qaldırmaqda səy etmək vacib olur.

[58] Hafiz Şihəbud-din Əbu əl-Fadl Əhməd İbn Əli İbn Muhəmməd əl-Asqaləni "Fəthu əl-Bəri fi şərhi sahihi əl-Buxari" kitabının müəllifi, hicri 773-852-ci illərdə yaşamışdır)(tərc).

mənada və inkar edənlərin çoxluğuna görə bu ad ümumi işlədilmişdir. Əbu Bəkr isə yalnız ona görə onlarla vuruşmuş və onları cahilliyə görə üzrlü bilməmişdir ki, çünki onlar döyüşə qalxdılar. Əbu Bəkr də onları tövbəyə çağıran dəvətçilər göndərdi və sonra isə onlar israr etdikdə, onlarla döyüşdü" (ən-Nəvəvinin "Səhih Muslim"in şərhində, Xattabidən etdiyi nəqlə qayıt). Həmçinin 280-cı səhifədə deyir: "İslamın əslindən yapışıb və dedikləri şübhəyə görə zəkatı verməyənlərə hüccət qaldırılmadan öncə küfrlərinə hökm verilmədi. Və sonra isə səhabələr onların üzərində qələbə qazandıqdan sonra onlar barəsində ixtilaf etdilər, onların malları kafirlər kimi qənimət olaraq və övladları isə əsir olaraq götürülürmü, yoxsa həddi aşan kəslərlə döyüşdəki kimi onlardan heç bir qənimət və əsir götürülmür? Əbu Bəkr birincini görmüş və buna uyğun əməl etmiş, Ömər bunda onunla münaqişə etmiş və ikinciyə getmiş və başqaları isə Əbu Bəkrə müvafiq olmuşlar. Hər hansı bir şübhə ilə fərzlərdən hər hansı şeyi inkar edən barəsində icma bərqərar oldu ki, inkar edən kəsdən bu əməldən qayıtmaq tələb olunmalı və əgər döyüşə qalxarsa və döyüşülərsə və ona hüccət qalxarsa – bu hüccətdən sonra qayıdarsa heç, yox əgər qayıtmazsa bu halda onunla kafir müamiləsi edilər". Kəlamın sonu.

## Cahilliyin Üzrlü Olması Qəti Bilinən Əsli Məsələlərdəndir

Bil ki, cahilliklə yanaşı olan müxalifliyə görə cəzalandırmamaq qəti olaraq bilinən şəri qaydadır, əsldir və bunun da üzərində alimlərin ittifaqı durur. Bu da Əbu Muhamməd İbn Həzmin və şeyxülislamın zikr etdiyi kimi peyğəmbərin (sallAllahu aleyhi və səlləm) və səhabələrinin (radiyAlllahu anhum) yolundan açıq-aydın bilinir. Səhabələr zikr etdiyimiz kimi, etiqadla əməlin arasını ayırmazdılar, bunların arasında fərq qoymazdılar. Bu qəti bilinən

əsl müəyyən bir dəlillə yox, əksinə ümumi Quran və Sünnə yolundan götürülmüşdür ki, qorxudaraq xəbərdarlıq edilmədən və hüccət qaldıraraq onu çatdırmadan heç bir cəza, danlaq, qınaq yoxdur və cahilə də, yalnız hüccət qalxdıqdan sonra əzab verilər. Və buna görə də, əgər bu mövzuda zikr olunan dəlillərə fərdi olaraq baxsaq, görərik ki, bu dəlillər zənnidir. Bu səbəbdən də, görürsən ki, haqqında danışdığımız bu etirazçı – bu məsələyə diqqət yetirməməsi və üsul qaydalarını necə götürməyi bacarmaması səbəbinə görə - bu dəlillərə bir-birinin ardı ilə tək-tək rəddiyyə verməkdə var-gəl edir. Necə ki, özünü yandırmağı əmr edənin, təbərrük üçün ağac istəyənlərin ("Zətu ənvat" hədisi) və Muazın peyğəmbərə (sallAllahu aleyhi və səlləm) səcdə etməsi hədisləri kimi və başqa nə qədər hədislər və həmçinin Allah təalənin bu ayəsi وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا ***(Biz elçi göndərməmiş (heç kəsə) əzab vermirdik.)***[59] barəsində danışdıqda misal olaraq deyir ki, bu dəlillər xas, müəyyən hala aid məsələdir, bunlarla əsl olan şeyə qarşı çıxılmaz. Bu söz də, batil bir sözdür. O necə isbat edib ki, bu dəlillər xas hallara yozulan müəyyən hala aid məsələlərdir və o, haradan bilir ki, bunlar əslə ziddir?! Bu dəlillər zikr etdiyimiz bu əzəmətli əslin bir hissəsidir. Görürsən ki, o, zikr etdiyimiz bu ayə ilə etdiyimiz istidlələ "artıq rəsullar göndərilmişdir" sözü ilə rəddiyyə verir. Və bilmir ki, bu ayədən murad peyğəmbərin (sallAllahu aleyhi və səlləm) gətirdiklərinin və şəriətin çatmasıdır. Allah təalə deyir: لِأُنْذِرَكُمْ بِهِ وَمَنْ بَلَغَ ***(Onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim)***[60]. Buna görə də, ər-Rabii İbn Ənəs[61] bu ayənin təfsirində deyir ki, "Allahın rəsuluna

---

[59] İsra surəsi 15.
[60] Ənam surəsi 15.
[61] ər-Rabii İbn Ziyəd İbn Ənəs əl-Bəkri tabiindir, böyük təfsir imamlarından olub, Ənəs İbn Məlikdən, Əbu əl-Aliyədən və Həsən əl-Basridən rəvayət etmiş, sonuncu ikisinin tələbələrindən olmuşdur, təfsirçilərin imamı sayılan İbn Cərir ət-Təbəri ondan çox rəvayət etmişdir, hicri 139-cu ildə vəfat edib (tərc).

(sallAllahu aleyhi və səlləm) tabe olan kəsə vacibdir ki, onun dəvət etdiyi kimi dəvət etsin, onun qorxutduğu kimi qorxutsun". Buna görə də, alimlərə peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) təbliğ etmək vacib olmuş və onlar hüccət olmuşlar.

Şatibi[62] "Muvafaqat" kitabında 1-ci cilddə qəti üsullarin bəzən zənni dəlillər məcmusunun köməyi ilə hasil olmasından – qəti əsl də, yalnız dəlillər toplusu ilə hasil olur – danışdıqda 36-cı səhifədə deyir: "Həqiqətən, burada eyni məna üzərinə kömək edən zənni dəlillərin ümumiliyindən lazımi dəlillər götürülür və beləcə də bu, qətilik ifadə edir. Və həqiqətən də, birlikdə, cəm olmaqda təklikdə olmayan bir qüvvə vardır. Buna görə də, mütəvatir, çox saylılıq qətilik ifadə edir, bu da ondan bir növdür. Bir məsələnin dəlillərinə baxdıqda, onu izlədikdə lazım olan elmi ifadə edən məcmu hasil olarsa, bu tələb olunan dəlillər sayılır. Bu da, məna ilə olan mütəvatirə bənzəyir[63], misal olaraq Əlinin (Allah ondan razı olsun) şücaəti və Hatimin [64] səxavətliliyi barədə nəql olunan xəbərlərlə bilinən elm kimi ". Və 37-ci səhifədə buyurur: "Dəlillər çoxaldıqda və eyni məna üzrə bir-birinə yardım etdikdə, öz məcmuluğu ilə qətilik ifadə edir. Həmçinin üsulları (dinin təməl qaydalarını) götürməkdə də, iş bu cürdür. Yalnız əvvəlkilərdən olan üsulçular ola bilsin ki, bu mənanı və buna diqqət yetirməyi tərk ediblər, buna görə də, sonra gələn bəzi elm əhlinə də bu gizli qalmışdır, beləcə də, ayə və hədislərlə tək-tək fərdi halda dəlil gətirmək problemi çıxmışdır. Belə ki, dəlillər cəm halda götürülməmiş və hər bir dəlilə

---

[62] İbrahim İbn Musə İbn Muhəmməd əl-Ləxmi əş-Şatibi Usulçu hafiz, "Muvafaqat", "İtisam" kitablarının sahibi, hicri 790-cı ildə vəfat etmişdir (tərc).

[63] Mütəvatir iki növdür: Ləzfi və mənəvi mütəvatirlik. Ləfzi mütəvatirlik eyni ləfzlə olan hədislər toplumu, mənəvi mütəvatirlik isə eyni mənaya dəlalət edən hədislər toplumudur. (tərc.)

[64] Hətim İbn Abdullah İbn Səd ət-Tai əl-Qahtani. Cahiliyyə dövrünün şairlərindən olub, səxavətlilikdə və comərdlikdə onu misal çəkərlərmiş. Oğlu Adiy (radiyAllahu anhu) səhabə olmuşdur. (tərc.)

fərdi şəkildə etirazlarla hücum edilmişdir. Beləcə də, bu dəlillərlə qətilik murad olunan üsul qaydaları üzərinə dəlil gətirmək zəifləmişdir. Bu dəlillər bu yolla (yəni cəm halda) götürülərsə heç bir işkəl qalmır. Əgər cüzi və kulli əsaslar üzrə şəri dəlillər bu cür etiraz edənlərin yolu ilə götürülmüş olsaydı, konkret olaraq şəri hökmlərdə bizim üçün heç bir qətilik hasil olmazdı, buna yalnız ağılın köməkliyi ilə nail olmaq mümkün olardı. Ağıl isə şəriətdən sonradır. Və labüddür ki, üsuli dəlilləri təhqiq etməkdə bu qayda üzrə gedilsin".[65] (Səhifə 39). Və danışdığımız bu müqəddimənin üzərində başqa bir məna qurulur, bu da ondan ibarətdir ki, şəriətin istəklərinə müvafiq olan və şəri dəlillərdən götürülmüş, özünə müəyyən bir dəlilin şahidlik etmədiyi hər bir şəri üsul, özünün üzərində başqa qaydaların qurulması üçün üsul olaraq səhihdir və yararlıdır və buna müraciət olunur. Belə ki, bu üsul (bu əsas) bütün dəlillər məcmusu ilə qəti bir əslə çevrilir, çünki əvvəldə keçdiyi kimi, dəlillərin fərdi halda, ona başqa dəlillər qoşulmadan qəti hökmə dəlalət etməsi gərəkmir. Çünki bu mümkün olmayan bir şey kimidir".

Və yenə "Mavafaqat" kitabında, 3-cü cild, 377-ci səhifədə Qurana başqa elmlərin izafə (əlavə) olunmasından danışdıqda deyir: "Bir qism elmlər Allahın Quranı nazil etməsindəki Sünnəsindən, yolundan, məxluqatına onunla xitab etməsindən və onlarla ən gözəl tərzdə və rifqətlə müamiləsindən götürülmüşdür... və bu da əsli qaydalardan, fəri (törəmə) faydalardan və ədəbi

---

[65] Buna görə də şeyxülislam Allah təalənin yalnız hüccətdən sonra əzab verdiyini zikr etdikdə 22-ci cild, 42-ci səhifədə deyir: "Və əgər Allah təalə imanı tərkə görə yalnız və yalnız hüccət çatdıqdan sonra azab verirsə, onda imanın bəzi hissəsinin tərkinə görə hüccətdən sonra əzab verməsi daha layiq, daha münasib və daha məqsədə uyğundur. Bu da, rəsulullahdan (sallAllahu aleyhi və səlləm) bu cür misallarda yayılmış, məşhur Sünnəsidir..." Kəlamın sonu. Və sonra da ibadət əməllərində Sünnədən bir çox misalları zikr edir və bunlarla da, zikr etdiyi bu əslin (əsasın) üzərinə məcmu halda dəlillər gətirir. Bununla yanaşı zikr etdiyi bu əsas üzrə üzrün etiqad və əməli məsələlərə aid olmasından danışmışdır.

gözəlliklərdən bir neçə növü şamil edir, əhatə edir. Bunu başa düşməyə yardım edən bir neçə misallar çəkək: Qorxutmadan, xəbərdarlıq etmədən cəzalandırmamaq və buna da Allah təalənin Özü barəsində verdiyi xəbər dəlalət edir. Allah təalə deyir:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولً

***Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik!***[66]

Və məxluqat üzərində Allahın təkrar-təkrar cərəyan edən Sünnəsi budur ki, Allah təalə rəsullar göndərməmiş müxalifliyə görə qınamır. Və əgər onlara hüccət qalxarsa bundan sonra

**فَمَنْ شَاءَ فَلْيُؤْمِنْ وَمَنْ شَاءَ فَلْيَكْفُرْ** ***(Kim istəyir iman gətirsin, kim də istəyir kafir olsun).***[67] Hər bir əməl üçün öz mislində cəza və ya mükafat vardır. Və hüccət qaldırmaqla haqqı çatdırmaq da Allah təalənin Sünnələrindən, yollarındandır...." Kəlamın sonu.

Və müxalifliyə görə cəzalandırmağı yalnız hüccətdən sonraya aid etdi, bunu da zikr etdiyi bu əsli qaydaların ən birincisi etdi.

Həmçinin İbn Qeyyim "Tariqul-hicrəteyn" kitabında təqlidçilərin və kafirlərin cahillərinin təbəqələrindən danışdıqda 413-cü səhifədə deyir: "Və bu təfsilatla məsələdə[68] işkəl aradan qalxır və bu məsələ dörd əsas üzərində bina olunmuşdur. **Birincisi:**

---

[66] İsra surəsi 15.

[67] Kəhf surəsi 29.

[68] İbn Qeyyim deyirdi ki, kafirlərin qadınlardan və ya uşaqlardan olan tabeçiləri cahil olsalar belə kafirdirlər. Deyir: "Kafir, inadkarlıqla və yaxud da cahilliklə və inad əhlinə təqlidlə Allahın tövhidini inkar edən və Onun rəsulunu yalan sayan kəsdir". Sonra onlardan üz döndərənlə (erad edənlə), üzərində olduğu şeydə xeyiri bilməyən acizin arasını ayırır və əzabın haqlı olmasında da, bu ikisi arasında fərq qoyur. Amma zahirdə deyir: "Qula vacibdir ki, İslamdan başqa bir din üzərində olan hər bir kəsin kafir olmasını etiqad etsin". Bizim buradakı muradımız yalnız bu məsələnin qəti üsullardan olmasını bəyan etməkdir. Sonra da şirk edən cahil müsəlman isə bu təbəqədən deyil, çünki o, rəsulu yalan saymır, əksinə bunun muradı rəsula tabeçilikdir, sadəcə şəriətdən olduğunu zənn etdiyi bir şeylə cahillik üzrə müxalif olmuşdur. Bunda diqqətli ol!
Amma peyğəmbərin şəriətindən bütünlüklə, cümləliklə üz döndərənsə, bu kəs əslən dinə tabeçiliyi qəsd etməmişdir.

Allah subhənəhu və təalə heç bir kəsə ona hüccət qaldırmamış əzab verməz. Necə ki, buyurur:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولً

*Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməzik!*[69]
Həmçinin deyir:

رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

*Biz peyğəmbərləri (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.*[70]

Həmçinin deyir:

كُلَّمَا أُلْقِيَ فِيهَا فَوْجٌ سَأَلَهُمْ خَزَنَتُهَا أَلَمْ يَأْتِكُمْ نَذِيرٌ قَالُوا بَلَىٰ قَدْ جَاءَنَا نَذِيرٌ فَكَذَّبْنَا وَقُلْنَا مَا نَزَّلَ اللَّهُ مِنْ شَيْءٍ إِنْ أَنْتُمْ إِلَّا فِي ضَلَالٍ كَبِيرٍ

*Hər dəfə bir dəstə oraya atılarkən (Cəhənnəmin) gözətçiləri onlardan soruşacaqlar: "Məgər sizə xəbərdarlıq edən (bir peyğəmbər) gəlməmişdi?") (Onlar deyəcəklər: "Əlbəttə, bizə qorxudan (bir peyğəmbər) gəlmişdi. Amma biz (onu) yalançı sayıb: "Allah heç bir şey nazil etməyib, siz də ancaq böyük bir azğınlıq içindəsiniz"– demişdik.*[71]

Həmçinin deyir:

يَا مَعْشَرَ الْجِنِّ وَالْإِنْسِ أَلَمْ يَأْتِكُمْ رُسُلٌ مِنْكُمْ يَقُصُّونَ عَلَيْكُمْ آيَاتِي وَيُنْذِرُونَكُمْ لِقَاءَ يَوْمِكُمْ هَٰذَا ۚ قَالُوا شَهِدْنَا عَلَىٰ أَنْفُسِنَا ۖ وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا وَشَهِدُوا عَلَىٰ أَنْفُسِهِمْ أَنَّهُمْ كَانُوا كَافِرِينَ

*Ey cin və insan tayfası! Məgər sizə öz içərinizdən ayələrimi xəbər verən və bu gününüzlə qarşılaşacağınız barədə sizə xəbərdarlıq edən elçilər gəlmədimi? Onlar deyəcəklər: "Biz öz əleyhimizə şahidlik edirik!" Onları dünya həyatı aldatdı və onlar kafir olduqları barədə özlərinə qarşı şəhadət verdilər.*[72]

---

[69] İsra surəsi 15.
[70] Nisə surəsi 165.
[71] Mülk surəsi 8-9.
[72] Ənam surəsi 130.

Və Allah təalə Quranda çox sayda xəbər vermişdir ki, O, rəsul gələn və hüccət qalxan şəxslərə əzab verir və bu kəs isə, öz günahını etiraf edən günahkardır. Allah təalə deyir:

وَمَا ظَلَمْنَاهُمْ وَلَٰكِنْ كَانُوا هُمُ الظَّالِمِينَ

***Biz onlara zülm etmədik, amma onlar özləri zalım idilər (öz-özlərinə zülm etdilər)*[73]*.***

Zalım o kəsdir ki, rəsulun nə gətirdiyini bilir və ya hansısa bir yolla onu öyrənməyə qüdrəti çatır. Amma rəsulun gətirdiyini bilməyən və bunu öyrənməkdən də aciz olan bir kəs barəsində necə deyilə bilər ki, o zalımdır? **İkinci əsl:** Əzab iki səbəbə görə haqlı olur: Birincisi hüccətdən üz döndərmək (erad etmək), onu istəməmək və onun vacib etdiyinə əməl etməmək, ikincisi isə hüccətdən sonra ona qarşı inad etmək və onun vacib etdiyi şeyi tərk etməklə. Birincisi üz döndərmək (erad) küfrü, ikinci isə inad küfrüdür. Amma hüccət qaldırılmamaqla və bu hüccəti də öyrənməyə qüdrətin çatmaması ilə yanaşı olan cahillik küfrü isə Allahın rəsullarla hüccət qaldırmağa qədər əzabı inkar etdiyi bir küfrdür.

**Üçüncü əsl**: Hüccət qaldırmaq zamanın, məkanın və şəxslərin dəyişməsi ilə dəyişir.

**Dördüncü əsl:** Allahın felləri Özündən heç vaxt uzaq qalmayan hikmətinə tabedir. Və bu hikmət öz tərifəlayiq qayəsi və nəticəsi üçün məqsəddir. Bu əsl bu təbəqələrdə sözün əsasıdır..." Kəlamın sonu.

Bil ki, cahilliyin üzrlü olması heç də mütləq formada deyil. Və labüddür ki, əgər məsələdə səhlənkarlıq olarsa cəzadan hansısa bir növ olsun. Necə ki, Ömər (Allah ondan razı olsun) Həbəşi qadını etdiyi zinanın haramlığından elmsiz olması ilə yanaşı, onu öyrənməkdə səhlənkarlıq etdiyinə görə şəri hədd olmayaraq və həmçinin, səhabələr içkini halallaşdıranları halal və haramı

---

[73] Zuxruf surəsi 76.

öyrənməkdə nöqsanlarına görə şəri hədd olmayaraq cəzalandırmışlar. (Ədəbləndirmək baxımından tərc.) Buna görə də alimlər cahillik üzərində bina olunan əməllərin səhihliyində ixtilaf etmişlər. Və biz də şeyxülislamdan sənə nəqllər gətirdik ki, şeyxülislama görə, kim cinsi şəriətdən olan əməllərdə cahilliklə bidət edərsə, bu kəs öz qəsdinə görə savab qazana bilər. Amma şirk cinsindən olan əmələ görə isə ona savab yoxdur, çünki bu əməl məşru deyildir. Lakin bu kəs cahilliyinə görə əzablandırılmır.

Şatibi "Muvafaqat" kitabında 2-ci cild, 342-ci səhifədə bu məsələdə deyir: "Əgər (şəri hökmə) müxalif əməl (yəni, misal olaraq ibadət və ya müamilələr) cahilliklə olarsa (lakin niyyəti şəriətə müvafiq olmaq olarsa), onda buna iki tərəfdən baxılır (yəni, bir tərəf əməlin səhihliyini və digər tərəf əməlin batilliyini ifadə edir). Sonra birinci baxışı, yəni, əməlin səhihliyini ifadə edən baxışı aydınlaşdırır ki, əməlin səhihliyi əməl edənin qəsdi etibarı ilədir, belə ki, əməllər niyyətlərə görədir və bunun da, niyyəti itaət etməkdir. Və ikinci baxış - əməlin batil olmasını ifadə edən baxış isə, əməlin şəritətə müxalif olması etibarı ilədir. *Kim bizim bu işimizdə ondan olmayan bir yenilik edərsə o rədd olunur.* Sonra isə zikr edir ki, alimlərdən bir dəstə, əməl edənin qəsdinə meyl etmiş və ibadətlərdən tələfi vacib olanını tələf etmiş və müamilələri isə səhih görmüşdürlər. Başqa bir dəstə isə mütləq olaraq əməlin fasid olmasına meyl etmiş və şəriətə müxalif olan hər bir ibadət və müamilələri batil saymışdır. Sonra isə məsələdə orta yolda olanların məzhəbini zikr edir və özü də, ona meyl edir. O da bir tərəfdən qəsdin, digər tərəfdən isə əməlin tələbinə baxmaqdan ibarətdir. Buna da bir çox şeylərlə dəlil gətirmişdir, bunlardan – haram olmasından cahil olaraq harama girmək, misal olaraq özünə haram olan kəslə evlənən şəxs kimi. Bu şəxsin qəsdinə baxılaraq ona zina həddi tətbiq olunmur. Lakin bununla yanaşı nikah pozulur. Həmçinin İmam Malik ibadətdəki cahilliyi ümumi olaraq unutqanlıqdan saymış və üçüncü dəlili zikr etmişdir" **Bu**

**ümmətdən xətanın qaldırılmasına dəlalət edən dəlillər;** Qurandan:

**وَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ فِيمَا أَخْطَأْتُمْ بِهِ وَلَٰكِنْ مَا تَعَمَّدَتْ قُلُوبُكُ**

***Səhvən etdiyiniz əməllərdə sizə heç bir günah yoxdur. Lakin qəlbinizin qəsdlə etdiyi işlərdən ötrü (sizə günah var)***[74]

Həmçinin:

**رَبَّنَا لَا تُؤَاخِذْنَا إِنْ نَسِينَا أَوْ أَخْطَأْنَا**

***Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma!***[75] [76]

Və hədisdə də, artıq gəlmişdir ki, *"Artıq edildi"*. Və hədisdə *"Allah təalə mənim ümmətimdən xətanı, unutqanlığı və məcbur*

---

[74] Əhzəb surəsi, 5.

[75] Bəqərə surəsi, 286.

[76] Şeyx Şinqiti zikr edir ki, xəta və unutqanlıq üzrə cəza əvvəlki ümmətlərdə idi. "Ədva əl-Bəyan" adlı təfsir kitabında 3-cü cild, 73-cü səhifədə Kəhf surəsinin təfsirində deyir: "Alimlər bu ayədən götürmüşdürlər ki, məcbur olunduqda üzrlü bilinmək bu ümmətin xüsusiyyətlərindəndir. Çünki mağara əhli barəsində **إِنْ يَظْهَرُوا عَلَيْكُمْ يَرْجُمُوكُمْ أَوْ يُعِيدُوكُمْ فِي مِلَّتِهِمْ** ***(Çünki onlar sizi tapsalar ya sizi daşqalaq edər, ya da öz dinlərinə döndərərlər.) (Kəhf surəsi, 20)*** sözündən zahir olur ki, onlar buna məcbur edilmiş və itaət etməmişlər, bununla yanaşı dedilər ki, **وَلَنْ تُفْلِحُوا إِذًا أَبَدًا** ***((Onda) siz heç vaxt nicat tapa bilməzsiniz!)*** Və bu da dəlalət edir ki, (əvvəlkilərdə) məcburiyyət üzr deyildir. Bu mənaya Tariq İbn Şihəbin ölümlə qorxudularaq milçəyi qurban kəsməyə məcbur edilənin Cəhənnəmə girməsi hədisi şahidlik edir. Çünki onun yanındakını milçəyi qurban kəsməkdən imtina etdiyinə görə öldürdülər. Və həmçinin buna, peyğəmbərin (sallAllahu aleyhi və səlləm) sözündən başa düşülən əks məna da (məfhum muxaləfə) şahidlik edir: *"Allah təalə mənim ümmətimdən xətanı, unutqanlığı və məcbur olunduqları şeyi keçmişdir"*. Peyğəmbərin *"mənim ümmətimdən"* sözündən başa düşülür ki, başqa ümmətlərdən bu şeylər keçilməyib ..." Şinqiti bu məsələni "Dəfu ihəmi əl-idtirab" kitabında açıqlamış və orada unutqanlığı və başqa məsələləri zikr etmişdir. (Səh. 189-191)
(Unutqanlığın üzrlü olması üzrə artıq ümmət icma etmişdir, çünki bu, Quran və səhih sünnə ilə sabit olmuşdur və bu da istər etiqadda, istərsə də əməldə olsun, belədir. Unutqanlıq elmdən sonra baş verən bir haldır və ya sifətdir. Və əgər elm əldə etdikdən sonra unudan insan düşdüyü müxaliflikdə buna görə üzrlüdürsə (və bu belədir), onda cahil olan kəs üzrlü bilinməyə daha layiqdir. Çünki nəticə baxımından hər ikisi əməli elm üzərə etməyiblər, buna diqqət yetir. Allaha daha yaxşı bilir. "Zahiratu ət-təkfir" on cildlik ensiklopediyadan-Tərc.)

*olunduqları şeyi keçmişdir, bağışlamışdır"*[77] Bu ümumiyyətlə ittifaq olunmuş bir mənadır və bunda müxalif yoxdur. İxtilaf etmişlər ki, cəzanın qaldırılması xas olaraq Axirətə aiddir yoxsa yox?[78] Və həmçinin ixtilaf etməmişlər ki, cəzanın qaldırılmasının mütləq formada oması doğru deyil. [79] Və bu belə olduqda zahir olur ki, nə qədər ki, kənardan başqa bir dəlil bunun əksinə dəlalət etmir, hər iki tərəf ümumi olaraq mötəbər sayılır. Allah daha doğru bilir...." Kəlamın sonu.

Həmçinin bu mövzudandır ki, dindən ümumiyyətlə, bütövlüklə üz döndərən, özünü dinlə mükəlləf etməyən və əməl etməyən, əksinə bütün istəyi, himməsi dünya olan, şəriətin hamısını tərk edən kəs – İslama nisbət olunmasını iddia etsə belə - kafirdir, **çünki bu şəxs üz döndərib, təkəbbürlük edir, şəriətlərdən heç bir şəriətdən yapışmayıb.** Beləsinə üzr yoxdur, üzr yalnız şübhəsi olana və ya dində aldadılan, məsələlər doğru olmayan tərzdə çatdırılan kəs üçündür, bu kəs ta ki, ona hüccət qalxana qədər

[77] Hədis həsəndir, onun başqa yolları və şahidləri vardır. Elm əhlindən bir dəstə hədisi həsənləşdirmişdir. Hakim səhihləşdirmiş və Zəhəbi müvafiq olmuşdur. Bəzi alimlər zəifləşdirsələr belə, başqa yolları ilə həsəndir. Allah daha doğru bilir.
(Şeyx Əlbəni səhih demişdir. Tərc.)

[78] Doğru olan budur ki, cəzanın qaldırılması həm dünya, həm də Axirət cəzasına aiddir, necə ki, bunu muhaqqiqlərin (təhqiqatçı alimlərin) cümhuru və müəllifin özü deyir.

[79] Şeyx Muhəmməd İbn Abdul Vahhabın övladlarından olan alimlər müsəlman şəxs şirk əməllər etdikdə ona hüccət qaldırılmamış təkfir etməməkdə qəti olmaları ilə yanaşı deyirlər ki, bu o şəxsin sağlığında ikəndir, lakin dəvət çatmamış şirk üzrə ölərsə, onların çoxundan nəql olunan budur ki, o şəxs yuyulmaz və ona namaz qılınmaz... Çünki o şəxs zahiri şirk üzrə olduğu halda ölmüşdür və bunun halını Allaha həvalə edirlər. Və buna görə də, bu gün bu mübarək dəvətin alimlərindən bir dəstə vardır ki, bu hal üzrə ölən şəxsə şirk əhkamlarını tətbiq etməyi görürlər. Amma başqa alimlər – və onlardan da Şeyx Muhəmməd İbn Saleh əl-Useymin Allah onu qorusun – belə görürlər ki, nə qədər ki, bu şəxsə hüccət çatmayıb və bu şəxslərin ətrafında onları azdıran pis alimlər mövcuddur, o şəxsin üzərində İslam əhkamları qalmaqdadır və həmçinin ölümdən sonra da, ona namaz qılınar və miras qoyar.... və sair. Ola bilsin ki, birinci rəy insanları çəkindirmək və onlara bu əməlləri inkar etmək yolu üzrədir və ya zikr etdiyimiz kimi hər iki tərəfə də, əməl etmək baxımındandır. Allah daha doğrusunu bilir.

üzrlüdür. Bu da "Minhəcu əhli əl-haqq" kitabının sahibinin Şeyx Abdul Lətif əli-Şeyxdən zikr etdiyi sözündən başa düşülür. Və həmçinin şeyxülislamın Fətəvada 22-ci cild, 19-cu səhifədə ibadətlərin qəzasından danışdıqda onun sözündən başa düşülür ki, üz döndərən (muirid) üzrsüzdür. Amma Qasiminin 5-ci cild, 1309-cu səhifədə İbn Qeyyimdən bidət əhlinin yollarından danışarkən dediyi sözünü nəql edir: "**İkinci qism: Sual verməyə, hidayəti tələb etməyə və haqqı öyrənməyə qadir olan, lakin bunu dünyasıyla, vəzifəsiylə, özü və məişəti ilə məşğul olduğuna görə tərk edən şəxs, beləsi əzaba haqlıdır və gücü miqdarında Allah təqvasından özünə vacib olan şeyi tərk etdiyinə görə günahkardır...**" Bununla belə onu **təkfir etməmişdir.** Çünki bu şəxs dünyası onu haqqı öyrənməkdən məşğul etmiş, lakin bütövlüklə onu dindən məşğul etməmişdir. Lakin o, başqa yollarla məşğuldur, o, şəriətdən nəyinsə üzərindədir, ondan bütövlüklə üz döndərməmişdir.

## Hüccət Qaldırmağın Necəliyi, Sifəti Və Hücəti Qaldıran Şəxsin Kim Olması

Bil ki, hüccəti hüccət qaldırmağı yaxşı bacaran şəxs qaldırmalıdır, dini işlərdən cahil, elmsiz olan və haqdan da azmış insanların şübhələrinə yaxşı cavab verə bilməyən şəxs qaldırmamalıdır. Çünki belə olduqda onları öz batillərindən yapışmalarını daha da artıran və hidayətə aparmağa yox, zəlalətə salmağa səbəb olar. Şeyx Suleyman İbn Səhman deyir: "Mənə görsənən budur ki, - Allah daha doğru bilir – hüccəti yalnız hüccət qaldırmağı yaxşı bacaran şəxs qaldırmalıdır, hüccət qaldırmağı yaxşı bacarmayan şəxs - dinin əhkamlarını, alimlərin bu məsələdə nə dediklərini bilməyən savadsız cahillər kimisi - mənim bildiyimə görə hüccət qaldırmamalıdır." Kəlamın sonu. (Minhəcu əhli əl-haqq).

Hüccət qaldıranın əmir və ya onu əvəz edən şəxsin olması gərəkmir, hüccəti yalnız elmdə, dəlillərdə mahir, bacarıqli olan və məsələdəki şübhələrə güclü cavabı olan hər bir kəsin qaldırması vacib və yaxud da, hala baxılaraq müstəhəb olur. Bəzi alimlərin "hüccət qaldıran şəxsin əmir və ya onu əvəz edən şəxs olmalıdır" demələrindən muradları hökm verməyə aiddir. Çünki əgər hüccət qaldırar və bu hüccətin tələblərinə uyğun hökm verərsə, onda bu hökmü yerinə yetirmək, həyata keçirmək lazım olar. Amma rəiyyətdən olan tək-tək insanların hüccət qaldırmasına gəldikdə isə, əgər onlar hüccət qaldırar və üzərinə hüccət qaldırılan şəxsi təkfir edərlərsə, bu şəxs barəsində ölüdürülmək olan riddə hökmünü həyata keçirməzlər və belə olduqda da, bunun əksi olan özbaşınalıq, anarxiya və xaos yaradarlar. Bəzən də, bu cür hüccət qaldıranlar ya xəta edən, yaxud da, cahil olurlar və başqasını gərəksiz yerə, təkfiri vacib etməyən şeylərlə təkfir edirlər.

Hüccət qaldırdıqda onu axıra qədər qaldırmaq və cahil müxalif kəsdən şübhələri tam kəsmək, Kitab və Sünnə nasları və məşhur imamların təfsiri ilə dəlillər gətirmək lazımdır. Hüccət qaldırmağın sifəti, necəliyi isə Əbu Muhəmməd İbn Həzmin dediyi kimi "Ona (yəni, müxalifə) dəlillər çatsın və bu dəlillərə də müqavimət göstərəcək heç bir şeyi qalmasın." ("Əhkam", 1-ci cild, səh.67)

Amma o ki qaldı, Şeyx Muhəmməd İbn AbdulVahhabın bəzi qardaşlarına dediyi söz "Sizin, şeyxdən "kim filan, filan şeyləri inkar edər və özünə də hüccət qalxmış olarsa" sözünü gətirməyinizə gəldikdə isə, siz bu tağutlara və onların tabeçilərinə hüccət qalxıb-qalxmamasında şəkk edirsiniz. Bu isə çox təəccüblüdür. Siz bunda necə şəkk edirsiniz ki, artıq mən bunu sizə dəfələrlə izah etmişəm ki, hüccət qalxmayan kəs İslamda yeni olan və uzaq yerlərdə yaşayan kəslərdir və yaxud da bu müxalifliyin

misal olaraq sarf və atf [80] kimi gizli məsələlərdə olmasındadır. Beləsi öyrədilənədək təkfir olunmaz. Amma o ki qaldı Allah təalənin Öz kitabında izah etdiyi və möhkəmləndirdiyi dinin üsullarına gəlincə isə, bunda Allahın hüccəti Qurandır. Kimə Quran çatmışsa, artıq ona hüccət çatmışdır. Lakin problem bundadır ki, siz hüccət qaldırmaqla hüccəti başa düşmək arasında fərq qoymursunuz. Müsəlmanlardan olan kafirlərin və münafiqlərin çoxu onlara hüccət qaldırılması ilə yanaşı, Allahın hüccətini başa düşməmişlər. Necə ki, Allah təalə deyir:

أَمْ تَحْسَبُ أَنَّ أَكْثَرَهُمْ يَسْمَعُونَ أَوْ يَعْقِلُونَ ۚ إِنْ هُمْ إِلَّا كَالْأَنْعَامِ ۖ بَلْ هُمْ أَضَلُّ سَبِيلًا

***Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər, hətta, (haqq) yoldan onlar daha çox uzaqlaşmışlar.***[81]

Hüccət qalxması bir növdür, onun çatması başqa bir növdür və artıq onlara hüccət qalxmışdır. Onların bunu başa düşməyi də, başqa bir növdür. Hətta onu başa düşməsələr belə onları təkfir etdi..." sözünün sonuna qədər.

Belə cavab verilir ki, şeyxin təkfir etdiyi bu tağutlara şeyx özü öz risalələrində zikr etdiyi kimi, dəfələrlə məktublar göndərmiş, onlara ayələri və alimlərin sözlərini açıqlamışdır. Və onların burada başa düşməmək iddiaları qəbul olunmazdır. Və həmçinin Şueyb peyğəmbərin muradını başa düşməklə yanaşı kafirlər dedilər ki, يَا شُعَيْبُ مَا نَفْقَهُ كَثِيرًا مِمَّا تَقُولُ ***("Ey Şueyb! Dediklərinin çoxunu anlamırıq".)***[82]. Onlar sadəcə onu qəbul etməmiş və ya qəlblərinin xarablığına, fasidliyinə görə onda olan xeyir onlara bəyan olmamışdır. Həmçinin başa saldığımız hər bir kəs nəfsinin xarablığına görə onu qəbul etmirsə və dəvətimizdə olan xeyirlə

[80] Sarf və atf sehrin növlərindən olub, sarf ərlə arvadın arasını ayırmaq, atf isə onları bir-birinə sevdirməkdir (tərc).
[81] Furqan surəsi 44.
[82] Hud surəsi 91.

qənaətlənmirsə, hətta onu başa düşmədiyini iddia etsə belə, artıq ona hüccət çatmışdır. Amma o ki qaldı hüccətin yalnız ayələrin çatması ilə qalxmasına, bu aydın deyil. Bu yalnız, bəsit cahillikdə belə ola bilər, belə ki, özündə heç bir şübhə yoxdur və ayələr, həmçinin onların təfsiri o kəsə çatdıqda, heç bir çətinlik olmadan onu başa düşür. Amma mürəkkəb cahillik olduqda isə, belə ki, özündə çoxlu şübhələr olarsa necə iddia oluna bilər ki, ayələrin çatması ilə hüccət qalxır. Allah təalənin **وَابْتَغُوا إِلَيْهِ الْوَسِيلَةَ** - ***Ona (yaxınlaşmaq üçün) vasitə axtarın.***[83] ayəsini azdırıcı, pis alimlərin təfsir etdiyi kimi şirk olan vəsilələr kimi başa düşən şəxsə bu ayənin sadəcə çatması ilə necə hüccət qalxa bilər?! Biz Quranı əcəmiyə (qeyri ərəbə) təbliğ edir, o isə bunu başa düşmür, belə olduğu halda ona hüccət qalxmışdırmı, yoxsa bunun təfsiri onun üçün tərcümə edilməlidirmi?! Həmçinin fəhmlərə çaşqınlıq qarışdıqdan sonra, nasları doğru olmayan tərzdə başa düşməyə başladılar. Allah təalənin barələrində fəhmi, başa düşməyi inkar etdiyi kafirlərdən murad, sözün mənasını başa düşməmələri deyil, çünki onlar ərəb idilər. Artıq onlardan çoxu peyğəmbərin (sallAllahu aleyhi və səlləm) dəvətinin mənasını başa düşmüş və buna görə də, bu dəvətlə müharibə etmiş və onlardan çoxu da "lə iləhə illəllah"dan nə qəsd olunduğunu başa düşürdülər. Lakin Quran onlardan qəlbin fiqhini, anlayışını inkar etmişdir **لَهُمْ قُلُوبٌ لَا يَفْقَهُونَ بِهِ** - ***Onların qəlbləri var, onunla anlamazlar.***[84]. Onların qəlbləri xarab olaraq haqqı qəbul etmir və onda olan xeyiri anlamırdı, bizim danışdığımız isə bu deyil. İnsanlardan bir çoxuna açıq-aydın şəkildə hüccət qaldırırsan, onu qəbul etmir və başa düşməməyi iddia edirlər. Onlar bu sinifdəndirlər və müşriklər isə açıq-aydın Quranın möcüzəliyini deməklə yanaşı onu inkar edirlər. Bu isə ona iman gətirir, lakin onu pis, azdırıcı alimlərin ona dediyi

---

[83] Maidə surəsi 35.
[84] Əraf surəsi 179.

kimi xəta üzrə başa düşmüşdür. Əvvəldə onların şübhələrindən danışdığımız kimi. Beləlri barəsində necə deyilə bilər ki, ona, ayələrin sadəcə çatması ilə artıq hüccət qalxmışdır? Artıq biz sənə Əbu Muhəmməd İbn Həzmdən hüccətin necəliyi barəsində nəql etdik və şeyxülislam İbn Teymiyyə 3-cü cild, 231-ci səhifədə deyir: "Bəzən insan dəlilləri eşitməmiş olur və ya eşidib, lakin özündə bu dəlillər sabit olmayıb və ya hətta xətakar olsa belə, özündə bu dəlilləri təvil etməyi vacib edən başqa bir etirazlar meydana gəlmiş olur." Həmçinin 27-ci cild, 346-cı səhifədə deyir: "O sözlər ki, onu deyən kəs təkfir olunur, bəzən olur ki, bu şeylərdə insana haqqı bilməyi vacib edən naslar çatmamış, bəzən ona bu naslar çatmış, lakin bu naslar onda sabit olmamış və ya onu başa düşməmiş, fəhm etməmiş olur. Bəzən də olur ki, elə bir şübhələr onun qarşısına çıxır ki, Allah təalə bu şübhələrə görə onu üzrlü bilir...." Və sonra açıqlayır ki, bu da həm nəzəri, həm də elmi məsələlərdə olur.

Bil ki, cahilliyin üzrlü olması məsələsi əhkam məsələlərindən olub, nə əqidə və nə də ki, dəvət məsələlərindən deyildir. Və bizə yaxın olan insanlar bilirlər ki, bizim dəvətimiz xalis tövhidədir və bu məsələdə çox yazmaq da istəmirdik. Lakin avam insanları dəvət etməkdə və Allahın hüccətini, dinini yaymaqda bəzi tənbəllərin aranı qarışdırmaları və bir çox fəsadlara aparıb çıxaran belə bir məsələ ilə təşviş salmaları, bizə bu rəddiyyəni yazmağı vacib etdi. Bununla da yanaşı biz, bir çox şeyləri tərk edərək gətirmədik. Burada başqa bir problem də vardır ki, onu da başqa yerdə geniş bir şəkildə yazmışıq – bildiyimizə görə ki, həmin məsələdə də, insanlar arasında təşviş salınıb – Allahdan istəyirik ki, düz yolda olan şəxsə doğrunun bəyan olması üçün bütün bunları yaymaqda bizə yardım etsin. İndi isə bu bəhsin sonunda sənə bu vaxtlarda mənə çatan müasir Sünnə alimlərinin fətvalarını nəql edirəm.

## Şeyx Abdul Aziz İbn Bəz

Şeyx sufilərin kafir olub-olmamasını deyən və ya onların müsəlmanlardan olub, şirk əməllərə düşmələrini deyən kəs barəsində və həmçinin də, şirk əməl edən hər bir kəsə, hətta Allahdan başqasına and içən olsa belə, müşrik adını verən və o kəsə sənin yerin Cəhənnəmdir və s. şeylər deyən kəs barəsində soruşuldu və şeyx dedi:

"Sufilərin kafir olub-olmamasını demək və ya filan insan Cəhənnəmlikdir və ya Cənnətlikdir sözləri təhlükəli məsələlərdəndir. Bu şeylərdə mütləq və ümumi olaraq hamısına aid edərək danışmaq və ya xüsusi olaraq cəzmlə qəti demək icazəli deyildir. Çünki bunda təfsilat vardır. Sufilər bir neçə qism və bir neçə növ üzrə müxtəlifdirlər. Və vacib olan budur ki, hər hansı bir şəxsə yalnız onun əməlinə baxdıqdan və işini fikirləşdikdən, bildikdən sonra hökm verilsin. Kim şirk əməl edərsə, ona şirk əməllə hökm verilir. Sufilərə də, hökm verməzdən əvvəl, onların əməllərini fikirləşmək labüddür. Filan tayfa, filan şeyxin tabeçiləri, onlar belə əməl edirlər, elə əməl edirlər. Əgər sən bildikdə ki, bu onların əməlləridir və onlar, misal olaraq deyirlər ki, kim bizim şeyximizə tabe olarsa, nə əməl edirsə etsin Cənnətə daxil olar... Bu böyük bir şər və böyük bir fəsaddır. Əgər kim iddia edərsə ki, müəyyən bir şəxsə tabe olanlar Cənnətə daxil olacaq və Cəhənnəmdən qurtulacaqlar, bu küfr və zəlalətdir. Və yaxud da, iddia edərsə ki, onun şeyxi Allahdan başqa olaraq ibadət olunur, dua olunur, ondan yardım istənilir və o, kainatda idarəçiliyə malikdir, istədiyini edir – necə ki, bunu bəzi sufilər edirlər – bu mürtədlik və küfrdür, bundan Allaha sığınırıq. Amma o ki, qaldı kimdəsə bəzi bidətlərin olmasına, onların yaxşı gördüyü, şəriətdə gəlməyən səhər və axşam deyilən xüsusi zikrlər və dualar, bu şeylər barəsində deyilir ki, bunlar bidətdir və onun sahibinə kafir deyilmir. Həmçinin də, övliyalarla təvəssül etmək də iki qismdir:

Birincisi, filan insanın hörməti ilə, haqqı ilə təvəssül etmək, bu küfr yox, bidətdir. İkinci qism təvəssül isə övliyaya "Ey filankəs ağa, mənə yardım et" və ya "Xəstəmə şəfa ver" deyərək dua etmək, bu böyük şirkdir. Onlar həmçinin bunu da, təvəssül adlandırırlar və bu isə cahiliyyə əməllərindəndir. Amma birinci isə bidət və şirkə aparan vəsilələrdəndir. (Şeyxə deyildi ki, onların "Biz onlara ona görə dua edirik ki, onlar saleh övliyalardır və hər bir şey isə Allahın əlindədir, bunlar isə vasitələrdir). Şeyx dedi: Bu əvvəlki müşriklərin əməllərindəndir. Onların "Ya Bədəvi, yardım et! Ya Hüseyn, səndən kömək diləyirik" sözləri Əbu Cəhlin əməllərinin cinsindəndir və ya ona bənzərdir. Çünki onlar deyirdilər ki, **مَا نَعْبُدُهُمْ إِلَّا لِيُقَرِّبُونَا إِلَى اللَّهِ زُلْفَىٰ** - *"Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik"*[85]. Bu cür dua etmək Allaha küfr etmək və ortaq tutmaqdır. **Lakin alimlər bu şəxs barəsində təkfir olunurmu, yoxsa ona hüccət qaldırılana və bəyan olunana qədər gözlənilir deyə ixtilaf etmişlər**: Birinci tərəfə görə kim bunu deyərsə, bu kəs böyük küfrlə kafir olur, çünki bu, zahir olan, dəlilləri gizli olmayan şirkdir[86]. İkinci tərəf isə deyir ki, bu kəslər bəzən cahilliyə düşür və onlarda da, onları azdıran pis alimlər mövcuddur.[87] Buna görə də labüddür ki, iş onlara bəyan olunsun və açıqlansın. Allah təalə deyir:

**وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا**

---

[85] Zumər surəsi 3.

[86] Bu belədir, lakin cahilliyin artmasına görə bunun dəlilləri hamıya bəlli olmamışdır. Bununla bəzi şübhələr baş verir ki, bunu da, onlar bu şeyin şirk olmamasına dəlillərdən hesab edirlər. Bu birinci tərəfi əsaslandırmışlar ki, bu, hamıya zahir olan işlərdəndir, dəlilləri gizli deyildir. Lakin axır zamanlarda olduğu kimi bunların cahillik və ya təlbis (məsələnin kimlərsə tərəfindən başqa cür göstərilməsi) səbəbi ilə dəlillərin zühur etmədiyi və gizli qaldığı bir halda baş verməsi də, nəzərə alınmalıdır. Yalnız Allahın rəhm etdiyi şəxsdən başqa.

[87] Bu isə insanların və ölkələrin çoxunun halıdır. Və bunları hüccət qalxmamış təkfir etmək olmaz. Bu da kitabda sənə zikr etdiklərimizin məzhəbidir. Birinci tərəfə Sanani getmiş və alimlərin artıq ona müxalif olmasını zikr etdik və rəvayət olunmuşdur ki, o da bu rəydən dönmüşdür. Allah daha doğru bilir.

***Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik!.***[88]

Əgər iş onlara bəyan olunarsa və onlara deyərsə ki, bu iş icazəli deyil, Allah belə deyib, rəsul belə deyib, dəlilləri onlara açıqlanarsa, sonra da, onlar öz hallarında israr edərsə, bu halda kafir olarlar. Hər bir halda əməlin özü küfr və böyük şirkdir. Lakin əməl sahibi isə nəzər nöqtəsindədir, kafir olurmu, yoxsa deyilir ki, onun işi Allaha həvalə olunur. Bəzən də insan fətra əhlindən[89]olur, çünki iş ona bəyan olunmayıb, belə olduqda onun hökmü fətra əhlinin hökmü olur, onun işi Allaha qalır. Çünki bu, pis alimlərin ona məsələni başqa formada göstərməsi səbəbi ilə olmuşdur. Lakin Allahdan başqasına, peyğəmbərə, kəbəyə and içmək isə kiçik şirkdir və buna böyük şirk deyilmir. Yalnız o haldan başqa ki, Allahdan başqasına and içən insanın müəyyən şəxs barəsində - and içdiyi şəxs barəsində - onun kainatı idarə etdiyini, qeybi bildiyini və buna bənzər şeyləri etiqad etdiyi bilinərsə, bu böyük küfrdür.... Qayda budur ki, Allahdan başqasına and içmək kiçik küfrdür. Məkkədə və Mədinədə İslamın əvvəllərində insanlar atalarına and içirdilər, bundan sonra peyğəmbər (sallAllahu aleyhi və səlləm) bunu onlara nəhy etdi və dedi: *"Atalarınıza and içməyin".* Xülasə budur ki, nə qədər ki, and içən şəxs and içdiyi kəs barəsində onun Allahdan çox təzimə haqlı olduğunu və Allahdan başqa olaraq dua olunduğunu və ya kainatı idarə etdiyini və buna bənzər şeyləri etiqad etmir, bu kiçik küfr və kiçik şirkdir. Əgər bunları etiqad edərsə, bunun işi başqadır. Və həmçinin filankəs Cəhənnəmdədir və ya Cənnətdədir demək də icazəli deyildir. Çünki Əhli Sünnə vəl-Cəməa deyir ki, peyğəmbərin şahidlik etdiyi və ya Quranda gələndən başqa heç bir kəs üçün nə Cənnətlik və nə də, Cəhənnəmlik olduğuna şahidlik etmirik... Bu Əhli Sünnə vəl-

---

[88] İsra surəsi 15.

[89] Fətra əhli peyğəmbərlər arasında olan boşluq vaxtlarda yaşayan, özünə də, risalə çatmayan insanlara deyilir. (Tərc.)

Cəməanın etiqadıdır. Şeyxə deyildi: "Əgər şirk üzrə ölərsə, bəs onda necə?" Şeyx dedi: Onun halını Allah bilir. Onun zahiri şirkdir, əgər bilsək ki, onun ruhu bu hal üzrə çıxıb, deyilir ki, ruhu küfr üzrə çıxdı. Ruhunun nə hal üzərində çıxdığını biz bilmirik, ola bilsin ki, ölümdən qabaq tövbə edib, ola bilsin ki, onun üçün xeyir, əməlindən qayıtmaq, tövbə, peşmançılıq hasil olub. Hasil olan budur ki, onun əməli böyük küfrdür. Lakin onun Cəhənnəmlik və ya Cənnətlik olduğunu demirik, əksinə deyirik ki, onun işinin aqibəti Allahadır, ona pislikmi yazılıb, yoxsa bundan başqa bir şeymi. Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) şahidlik etdiyi və ya Quranda gələn kəsdən başqa heç bir müəyyən kəsə nə Cənnətlə, nə də, Cəhənnəmlə şahidlik olunmur. Misal olaraq **تَبَّتْ يَدَا أَبِي لَهَبٍ وَتَبَّ** – ***“Əbu Ləhəbin əlləri qurusun, qurudu da!”***[90] Quran Əbu Ləhəbə Cəhənnəmlə şahidlik etdi və peyğəmbər (sallAllahu aleyhi və səlləm) on nəfərə Cənnətlə şahidlik etmişdir. Bundan başqa isə muhsin üçün xeyir ümid edir, günahkar üçün qorxuruq. Muhsinin zahiri xeyirdir və ona xeyir umuruq və kimin zahiri şər olarsa, onun üçün şərdən qorxuruq. Kimin də, zahiri şirkdir, deyirik ki, onun zahiri şirkdir və ona cənazə namazı qılmırıq, müsəlmanlarla birgə basdırmırıq. Lakin demirik ki, o Cəhənnəmdədir. Lakin zahiri şirkdir və buna görə də onunla şirk əhlinin müamiləsini edirik. Ona namaz qılmır, onun üçün dua etmirik[91]. Amma o ki qaldı yəqin olaraq deyək ki, o Cəhənnəm əhlindəndir, yox, onun üçün Cəhənnəmlə şahidlik etmirik. Çünki Əhli Sünnə müəyyən şəxsə Cəhənnəmlə yalnız dəlillə şahidlik edirlər. Lakin bəzi sələflər *"Ona vacib oldu"* hədisinə görə demişlər ki, əgər ona xeyirli insanlar Cənnətlə şahidlik edərsə, cənnət əhlindən, və əgər Cəhənnəmlə şahidlik edərlərsə, Cəhənnəm əhlindəndir. Lakin Əhli Sünnə vəl-Cəməaya görə üstün, öndə olan budur ki, heç bir kəsə nə

---

[90] Məsəd surəsi 1.

[91] 79-cu həşiyəyə bax.

Cəhənnəmlə, nə də Cənnətlə şahidlik edilməz, yalnız Cənnətlik və ya Cəhənnəmlik olması barəsində dəlil gələn kəsdən başqa. Bu məsələdə doğru olan budur. Allah daha doğru bilir, müvəffəqiyyət Ondandır. Kəlamın sonu. (Səsyazmadan).

## Şeyx Muhəmməd Nasir Əd-Din Əl-Əlbəni

"Kim dörd məzhəbdən birinə tabe olarsa müşrikdir" deyərək şeyxə iftira atan şəxsə rədd olaraq deyir:

"Bu gün müsəlmanlardan çoxu Əhli Sünnədən olan müsəlmanların arasında yaşayır və bununla da yanaşı İslamın əsası olan tövhidin mənasını başa düşməmişlər. O tövhid ki, İslamı iddia edən kəs etiqadları, əməlləri, Rəbbi ilə görüşdükdə bütün xeyirləri gətirdikdə, o olmazsa heç bir şey fayda verməz. Çünki Allah təalə deyir:

لَئِنْ أَشْرَكْتَ لَيَحْبَطَنَّ عَمَلُكَ وَلَتَكُونَنَّ مِنَ الْخَاسِرِينَ

***Əgər şərik qoşsan əməlin puç olacaq və axirətdə mütləq ziyana uğrayanlardan olacaqsan.***[92]

Bu gün müsəlman toplumlarından çoxu müsəlmanların arasında yaşayır, oruc tutur, namaz qılır və bununla da yanaşı dediyimiz kimi İslamın əsası olan tövhidi başa düşməmişlər. Onlara dəvət çatıbmı? Mən deyirəm ki, onlara dəvət çatmayıb. Vacib olan budur ki, bu kəslərə dəvət öz elm aldıqları şeyxlərindən çatmalıdır. Lakin mən demirəm ki, bu kəslərə (yəni şeyxlərə) "Bir şeyi itirən onu verə bilməz" misalı tətbiq olunur. Kim tövhidi öyrənməyə ehtiyac olan kəslərə onu öyrətdi? Və tövhidi tanıyan və ona iman gətirən alim kimdir? Bu şeyxlər iki qismdir, bunu açıq-aydın deyirəm: Bir qism, tövhidi həqiqi formada bilir, lakin öz nəfsi ilə qənaətlənir və insanları və onların etdikləri etiqadları ya qorxaraq, ya dünyaya, şan-şöhrətə və ya tutduğu yerə, vəzifəyə

---

[92] Zumər surəsi 65.

olan hərisliyə, ya da buna bənzər şeylərə görə tərk edir. Onlardan eləsi də vardır ki, Allah təalənin bu ayəsi onlar barəsində doğru olur:

وَلَـكِنَّ أَكْثَرَ النَّاسِ لاَ يَعْلَمُونَ

***Lakin insanların çoxu bilmir.***[93]

Bu kəslər barəsində deyilir ki, bir şeyi itirən onu verə bilməz. Və bu gün şirk eşitdiyimiz bu müsəlmanların çoxu, yalnız Allaha ibadət üçün bina olunmuş məscidə girir, hansı ki, Allah təalə deyir:

وَأَنَّ الْمَسَاجِدَ لِلَّهِ فَلَا تَدْعُوا مَعَ اللَّهِ أَحَدًا

***Şübhəsiz ki, məscidlər Allahındır. Allahdan başqa heç kəsə dua etməyin!***[94]

Bu kəs məscidə ayağını sürüyə-sürüyə girir və deyir: Ya Bəz! (Yəqin ki, bu hansısa pirlərdən birinin basdırıldığı pirdir). Sən Bəzin məscidinə gedib Bəzəmi ibadət edirsən, yoxsa Bəzin Xaliqinə, Rəbbinəmi ibadət edirsən? Bu kəs yazıqdır, bilmir, cahildir."Ya Bəz, mənə yağış yağdır" deyən də, onu öyrədəndə bilmirlər ki, bu, Allah təbərakə və təaləyə yox, Bəzə ibadətdir. Bunların hamısı bu həqiqətlərdən cahildirlər və bilmirlər ki, Allaha dua etmək Ona ibadət, Allahdan başqasına da, dua etmək ona ibadət etmək, onu Allaha şərik qoşmaq sayılır. Bu həqiqətləri müsəlmanların çoxu bilmir, çünki tövhid dəvətinin üzərindən uzun-uzadı zamanlar keçmiş, ona şirklər, qəbirpərəstlik daxil olmuş və hətta bu bakteriyalar və mikroblar tövhidin üzərini bürümüş, qapamışdır. Bunun səbəbilə də insanların çoxu elə bir xəstəliyə düçar olmuşlar ki, bu xəstəlik həqiqi bir ölümdür. Çünki insanın bu dünyada yaşamasında nə fayda vardır ki, o yaşayır və özü də bilmədən Allahdan başqsına ibadət edir. Fəqət bununla da iş bitmir, qəbir olan məscidə girir, qəbirin yanına gəlir və Allahdan istədiyi şeyləri qəbirdən istəyir. Bütün bunlara dəlalət edən

---

[93] Əraf surəsi 179.

[94] Cin surəsi 18.

şeylərlə yanaşı deyirəm ki, biz bu müsəlmanları təkfir edə bilmərik, çünki onlara hüccət qalxmamışdır. Çünki kifayət qədər dəvətçilər yoxdur ki, üstünlük və hökm öz əllərində olsun – misal olaraq Suriyada, o ki qaldı başqa dövlətlərdə olsun – və bu müsəlman toplumlarına şirk olmayan, xalis tövhidi çatdırsınlar. Bu yerlərdə üstünlük, ağalıq və hökm əllərində olan dəvətçilər yox, yalnız çox az olan, yalnız xüsusi məclislərdə təmasda olduqları fərdlərdən başqa heç bir kəsə təsir edə bilməyəcək zəif, itmiş səslər mövcuddur. Lakin bu da, ümumi deyildir. Bu bizim əqidəmizdir, əgər bizimlə namaz qılan, oruc tutan bu kimsələrdən biri küfrə düşərsə, **biz onu təkfir etmirik**. Lakin biz bunu bildikdə, ona aydınlaşdırırıq ki, bu küfrdür, Allaha şərik qoşmaqdır, bu şeylərdən çəkin." Kəlamın sonu. (Səsyazmadan).

## Şeyx Muhəmməd Saleh Əl-Useymin

Qasım şəhəri, Uneyzə məntəqəsində caminin imamı, həcc idarəetmə komitəsinin muftisi şeyximiz Muhəmməd Saleh Əl-Useymindən yazılı halda mənə çatmışdır ki, şeyx "Əməli və etiqadi məsələlərdə, xüsusən də şirk məsələsində şəriətə müxalif olan cahilin hökmü barədə alimlərin dedikləri və Şeyx Muhəmməd İbn Abdul Vahhabın övladlarının bəzən cahilliyin üzrlü, bəzən də, üzrsüz olmasını dedikləri sözlər" barədə soruşulduqda şeyx deyir:

"Doğru olan budur ki, kimə hüccət qalxmayıbsa, dünya hökmündə o kəs üzrlüdür. Amma Axirətdə isə onun işi Allaha qalır. Rəylərdən haqqa ən yaxını budur ki, Qiyamət günü Allahın istədiyi kimi imtahan olunacaqlar, sonra da, nəticə nə olacaqsa oraya da, yönəldiləcəklər. Amma alimlərin bu məsələdə sözlərinin müxtəlifliyi isə, səhlənkarlığa aiddir. Kim haqqı tələb etməkdə səhlənkarlıq edibsə, o kəs müqəssirdir, üzr ondan qalxır və kim əgər səhlənkarlıq etməyibsə, o, üzrlü olur. Allah daha doğru bilir". Kəlamın sonu.

Bu demək istədiyimiz son sözdür. Müvəffəqiyyət Allhdandır. Ey Allahım, Sən nöqsanlardan uzaqsan və həmd Sənədir. Şahidlik edirik ki, Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. Səndən bağışlanma diləyir və Sənə tövbə edirik...

## Tərcüməçidən Son Söz

Allahın adı ilə. Həmd Allaha layiqdir. Allahın salavatı və salamı peyğəmbəri Muhəmmədin üzərinə olsun.

Bundan sonra:

Bununla da, bu müxtəsər risalənin sonuna çatdıq. Burada müəllifin gətirmədiyi bəzi müasir alimlərdən cahilliyin üzrlü olmasına aid nəqllər gətirəcəyik ki, elmsiz olaraq müsəlmanların cümhurunu təkfir etməyə tələsənlər bunlardan xəbərdar olsun və həmçinin bunları bilib, özlərini isə bilməyən kimi aparan fitnəkarlara qulaq verməsinlər. Belə ki, bəzi fitnə yayanlar iddia edərək elmdə və dində yeni, yaxud zəif olan bəzi sələfi qardaşlarımıza məsələni belə göstərirlər ki, bu əsrdə və ya indiki vaxtda cahilliyi üzrlü görən az sayda alimlər vardır. Lakin onlar bilmirlər ki, iş tam əksinədir. Yəqin unudublar ki, yaxud da, özlərini unudan kimi aparırlar ki, Allah təbərakə və təalə bizə ixtilafa düşdükdə məhz Qurana və səhih Sünnəyə qayıtmağı əmr edib, azlığa və ya çoxluğa baxmağa yox. Allah təalə deyir:

فَإِنْ تَنَازَعْتُمْ فِي شَيْءٍ فَرُدُّوهُ إِلَى اللَّهِ وَالرَّسُولِ إِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ ذَلِكَ خَيْرٌ وَأَحْسَنُ تَأْوِيلًا

***Əgər bir şeydə mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, onu Allaha və rəsuluna qaytarın. Bu sizin üçün daha xeyirli və nəticə etibarı ilə daha yaxşıdır.***[95]

Və artıq müəllif, risalənin özündə bu məsələyə aid dəlilləri və bu dəlillər üzərinə də, sələfin fəhmini gətirmişdir.

---

[95] Nisə surəsi 59.

Və həmçinin diqqət ediləsi məsələlərdən biri də elm əhlinin məzhəbində olmaq, onlara müxalif olmamaqdır. Muhəddis, üsulçu, fəqih Şeyximiz Muhəmməd Ali Ədəm ***"Əgər bilmirsinizsə, zikr əhlindən soruşun"***[96] ayəsini təfsirində deyir: "Elm tələbələrinə kor-koranə təqlid etmək haramdır, çünki artıq Allah təalə onların bəsirətini açmışdır. Lakin ölkə əhlinə gəldikdə isə, Allah təalənin bu ayəsinə görə elm əhlinin məzhəbinə tabe olmaları onlara vacib olur." Artıq İmam Baxarinin "Səhih"ində gəlmişdir ki, *"İş öz əhlindən başqasına verildikdə artıq Qiyaməti gözlə"* və həmçinin *"Alimlərimizin haqqını tanımayan mənim ümmətimdən deyil"*[97].

Və hamıya məlumdur ki, Azərbaycanda bu mübarək dəvəti yayan, dəvətin üzərində duran Sələfi alimlərdən elm almış, Mədinə İslam Universitetini bitirmiş Sələfi elm tələbələridir. Və ona görə də, məsələlərdə onlara qayıdılmalı, onlarla məsləhətləşilməli, fətvalar onlara yönləndirilməli, fətvaları da, məhz onlar cavablandırmalıdırlar. Sələflər deyərdilər: "Elm sizin dininizdir, elə isə baxın dininizi kimdən götürürsünüz". Həmçinin, elm əhli yanında tanınmayan, məchul insanlardan elm almaq bu yolda ən təhlükəli zərərlərdən sayılır. Çox şahidi olmuşuq ki, nə qədər sağlam əqidəli insanlar olub ki, istər daxildə, istərsə də, başqa yerlərdə olan bir çox "dəvətçilərə" qulaq verdiklərinə görə doğru mənhəcdən azmışlar. Buna görə də, öz nəfsinə nəsihət edən hər bir sadiq iman sahibi olan kəs dünyasına zərər gəlməsindən qorunduğu kimi, öz dinini və mənhəcini də, qorumalıdır. Bunun da ən başlıca yolu sağlam əqidəli elm əhlindən elm almaqdır. Artıq Allah rəsulu (sallallahu aleyhi və səlləm) bizə bidət əhli barədə xəbər verərək onlardan çəkindirmişdir. Bu hədislərdən birini xatırlatmaq yerinə düşər:

---

[96] Nəhl surəsi 43.
[97] İmam Əhməd və Tabarani rəvayət edib, Şeyx Əlbəni həsən deyib.

İbn Məsud (radiyAllahu anhu) deyir: Peyğəmbər (sallallahu aleyhi və səlləm) dedi: *"Axır zamanda yaşları az olan, səfeh bir qövm çıxacaqdır. İnsanların ən xeyirli sözünü deyəcəklər, ox ovu dəlib keçdiyi kimi, onlar da İslamdan çıxacaqlar".* Muslim Zəkat kitabında rəvayət etmişdir.

Ömər ibn Xattab (radiyAllahu anhu) demişdir: "Rəy əhlindən çəkinin, həqiqətən, onlar Sünnənin düşmənləridirlər. Mən onlara hədisləri əzbərlətdirirəm, onlar isə rəy deyirlər və bununla da, azırlar və azdırırlar".

Əyyub əs-Sixtiyəni (rahiməhullah) deyir: "Hava əhli hamısı xəvaricdirlər. Xəvariclər adda ixtilaf edib, qılınc üzərində isə icma ediblər".

Həsən əl-Basri (rahiməhullah) deyir: "Hava əhli yəhudi və nəsranilərin yerindədirlər". Yəni öz üzərində olduqları şeylərdən yapışıb, sünnələri tərk etdiklərinə görə, təkfir mənasında yox.

Ömər İbn Abdul Aziz (rahiməhullah) deyir: "Əgər hər hansı bir qövmü öz dini işlərini hamılıqda yox, xəlvətdə danışan görsən, bil ki, onlar zəlalət təsis edirlər".

Həsən əl-Basri (rahiməhullah) deyir: **"Hava əhli ilə oturmayın, onlarla mücadələ etməyin və onlardan heç birinə qulaq asmayın".** Sələflərin bidət əhlini məzəmmət etməsində və onlardan çəkindirməsində başqa nə çox əsərlər vardır. Bu barədə, yəni, Sələfi mənhəcin həqiqətində və Sələflərin bidət əhlindən çəkindirməsində oxucularımıza inşəAllah xüsusi bir risalə təqdim edəcəyik. Yardım yalnız Allahdandır. Onun azdırdığını hidayət edən, hidayət etdiyini isə azdıran olmaz.

Xülasə budur ki, bu məsələ təhlükəli məsələlərdən olduğu üçün hər bir kəsin buna girməsi icazəli deyildir. Xüsusən də, bunun üzərində öz sələfi qardaşlarını haqdan azmaqda ittiham etmək və bundan daha da təhlükəlisi kafir olmayan hər kəsi küfrdə ittiham etmək kimi məfsədələr durursa.

İndi müəllifin zikr etdiyi kimi risalənin həcmini ixtisar edərək gətirmədiyi müasir alimlərdən nəqlləri sənə təqdim edirik, müvəffəqiyyət yalnız Allahdandır.

## <u>Səudiyyə Ərəbistanı Məmləkətinin Daimi Fətvalar Komitəsi</u>

**Sual:** Qəbirlərə, tağutlara ibadət yerlərində cahilliyin üzrlü olma məsələsi, bu əməllərin sahibi cahilliyə görə üzrlüdürmü?

**Ləcnənin verdiyi cavab:**

Qəbirlərə, tağutlara ibadət şirkdir. **Özündən bu əməllər baş verən insana bunun hökmü bəyan olunmalıdır**. Əgər qəbul etməzsə, bu halda müşrikdir, şirki üzrə ölərsə, yeri Cəhənnəmdə əbədi qalar. **Hökm ona bəyan olunduqdan sonra üzrlü olmaz**. Və həmçinin kim, Allahdan başqası üçün qurban kəsərsə, o da belədir". Kəlamın sonu.

Ləcnənin fətvasından açıq aydın bilindi ki, hətta Ləcnə də, bu fətvasında qəbirlərə cahilliklə ibadət edənlərə birbaşa kafir hökmünü vermir və o kəsə hüccət qaldırmağı şərt bilir, əgər hüccətdən sonra bu halda ölərsə, onda ona müşrik deyilər.

## Səudiyyə Ərəbistanı Məmləkətinin Baş Müftisi Və Böyük Alimlər Heyətinin Sədri Olmuş İmam Abdul Aziz İbn Abdullah İbn Bəz

(hicri 1420-ci ildə vəfat edib)

**Sual:** Əgər görsəm ki, bir nəfər qəbirə dua edir, ondan kömək diləyir və şirkə düşüb, bu kəsi Allaha dəvət etmək və ona bəyan etmək istədikdə onu müsəlman çağırım, yoxsa müşrik?

**Cavab:** **"**Onu başqa bir şeylə çağır, nə kafir demə, nə müsəlman. De ki, ey, Allahın qulu, sənin bu əməlin şirkdir, ibadət deyil. Bu, cahiliyyə müşriklərinin, Qureyşin və onlara oxşarların əməlidir.

**Çünki onu təkfir etməyə maneə vardır**, <u>bu cür etsən (onu dindən) qaçırarsan</u>. Onu ən birinci dəvət et. Çünki müəyyəni təkfir etmək əmələ şirk deməklə eyni deyildir. Əməl edən müşrik olmur. Necə ki, alimlər bu cür deyiblər , **bəzən təkfir etməyə maneələr olur, cahillik kimi və bəsirətin olmaması kimi**. Ona müşrik deməkdə onu (dindən) qaçırmaq var. Onu öz adı ilə çağır. Sonra ona bəyan et ki, bu şirkdir".

**Sual:** Müəyyəni təkfir etməkdə racih olan nədir?

**Cavab:** Əgər ona hüccət və onun küfrünü göstərən dəlillər qalxıbsa, ona doğru yol açıqlanıbsa, sonra da israr edirsə, bu halda o, kafirdir. Lakin bəzi alimlər belə görür ki, şirk baş verən insan bəzən azdırılmış, çaşdırılmış və ya cahil olur, həqiqəti bilmir, belə olduqda, **hətta ona bəyan olunana**, bunların küfr və azğınlıq olduğunu, həmçinin bu əməllərin əvvəlki müşriklərin əməllərindən olması ona göstərilənə qədər o, təkfir olunmur. Əgər bəyandan sonra israr edərsə, müəyyənin küfrü ilə onun küfrünə hökm verilir." Kəlamın sonu.

***("əl-Fəvaid əl-İlmiyyə minəd-durusu əlBəziyyə" kitabından 2/273-274. ər-Risalə mətbəəsi. Hicri 1430 cu il.)***

Şeyx (rahimənullah) bu iki cavabında açıq-aydın bildirdir ki, şirkə düşən kəsi təkfir etməyə maneələrdən cahillik və elmin, bəsirətin olmamasıdır. Həmçinin, o kəsi hüccət qaldırılmamış və bu əməllər ona bəyan olunmamış təkfir etmək olmaz. Və bu da Əhli Sünnə vəl-Cəməanın qaydalarındandır. Şeyxdən başqa bir görüş də, nəql olunur ki, orada şeyx, cahilliyi üzr görmür. Necə ki, müəllif bunu ondan nəql etmişdir. Lakin burada diqqət yetirilməsi lazım olan bir neçə məqam vardır, birincisi şeyx ixtilafı zikr etmiş və hər iki görüşü də elm əhlinə, alimlərə nisbət edərək demişdir: **"Lakin <u>alimlər</u> bu şəxs barəsində təkfir olunurmu, yoxsa ona hüccət qaldırılana və bəyan olunana qədər gözlənilir deyə ixtilaf etmişlər".** Daha üzr görən tərəfi azğınlıqda, bidətdə, müxtəlif tənlər edərək, bəzilərinin etdikləri kimi məsxərəyə qoymamışdır,

əksinə hər iki tərəfə ehtiramla yanaşmışdır. Bu da, Əhli Sünnə vəl-Cəməanın mənhəcindəndir ki, əgər ixtilaf Əhli Sünnəyə nisbət olunan ixtilafdırsa, belə ki, Əhli Sünnə ilə bidət əhlindən olan müxtəlif firqələrin arasında olan ixtilaf deyilsə, bu halda heç bir tərəf qarşı tərəfi bidətdə, azmaqda və s. ittiham etmir, əksinə bir-birlərinə ehtiram və qardaşlıqla yanaşırlar və bura kimi sələfi mənhəcidir. İkinci məsələ isə bundan ibarətdir ki, şeyx bu görüşündə özündən əvvəlki İslam imamlarının – imam Şafi, Şeyxülİslam İbn Teymiyyə, İbn Qeyyim və başqaları və həmçinin imam Muhəmməd İbn Abdul Vahhab və onun məktəbini keçmiş adları yuxarıda keçən övladları və tələbələrinin görüşlərinə müvafiq olmuşdur. Bu sonunculardan bəzi nəqllər edərək məsələni başqa formada göstərməyə gəlincə isə, artıq müəllif bütün bunlara gözəl tərzdə cavab vermiş və aydınlıq gətirmişdir. Bunu fikirləş. Müvəffəqiyyət Allahdandır.

## Alləmə, Təfsirçi, Fəqih, Üsulçu Abdur Rahman İbn Nasir əs-Sədi (hicri 1376-ci ildə vəfat edib)

**"əl-Fətəva əs-Sədiyyə" kitabında (səh.578-584) etiqad və tovhiddə üzr görənlə üzr görməyən tərəf arasında dialoq apararaq, üzr görməyənlərin suallarına, gətirdiyi dəlillərə və iddialara cavab verərək, üzr görənlərin sözünün haqq olduğunu bildirərək deyir:**

“Sən, Kitabdan, Sünnədən və icmadan Allahdan başqasına dua etməyin, kömək istəməyin Cəhənnəmdə əbədi saxlayan şirk və küfr olmasına dəlillər gətirdin. Bunda heç bir şəkk-şübhə yoxdur. Və həmçinin yəhudi, nəsrani və ümumiyyətlə peyğəmbərə iman gətirməyən və onu təsdiqləməyən bütün kafirlərlərin cahilləri ilə Muhəmmədə (sallalllahu aleyhi və səlləm) iman gətirən, onun dediklərinin hamısını təsdiqləyən, ona itaətə sarılan, sonra isə

əməlin şirk olduğunu bilmədən, hiss etmədən, əksinə o əməli dua etdiyi şəxs üçün təzim olduğunu və əməlin də, şəriətdə əmr olunmuş olduğunu hesab edərək Allahdan başqasına duanın və şirkin baş verdiyi kəslə arasını eyni tutdun.

Sənin bununla o birinin arasını eyni tutmağın açıq-aşkar xətadır. Bu ikisi arasında fərq qoymağa Kitab, Sünnə və səhabələrin və xeyirdə onlara tabe olanların (tabiinlərin) icması dəlalət edir. Yəhudi və nəsranilərin cahillərinin və bütün kafir siniflərinin hamısının küfrü dindən zəruri bilinən məsələlərdəndir. Bu inkarı mümkün olmayan bir işdir.

Amma rəsula iman gətirən, onun dediklərinin hər birini təsdiq edən və dininə sarılan kəsdən cahilliklə və ya təqlidlə və ya təvillə etiqadda, yaxud sözdə, yaxud əməldə xəta baş verən kəsə gəldikdə isə, Allah təalə buyurur:

**ربنا لا تؤاخذنا إن نسينا أو أخطأنا**

***Ey Rəbbimiz unutduqda və ya xata etdikdə bizi cəzalandırma. (Bəqərə surəsi 286).***

Peyğəmbərin (sallAlllahu aleyhi və səlləm) ümmətindən xəta, unutqanlıq və məcbur olunaraq edilən şeylər bağışlanmışdır, bu istər sözdə, istərsə də, etiqadda olsun, hətta küfr olsa belə belədir.

Bu halda deyilir ki, kim belə etiqad edərsə və ya bu əməli edərsə, kafirdir. Lakin bəzən əməlin küfr və şirk olması barəsində onun elminin olmamasına görə bəzi şəxslərdə onların təkfirinə əngəl olan maneə baş verir və bu maneənin varlığı bizə vacib edir ki, müəyyənə kafir adını verməkdən dayanaq. Lakin biz, o sözün küfr olmasında heç bir şəkk etmirik. Səhabələr və tabiinlər də, bidət əhli ilə bunun üzərində əməl ediblər. Onların zamanlarında baş verən bidətlər, misal olaraq Xəvariclərin, Mötəzilələrin, Qədərilərin və bunlara bənzəyənlərin bidətləri kimi bidətlər Kitab və Sünnə naslarını rədd etməyi, yalan saymağı və təhrif etməyi özündə şamil edirdi ki, bu da, küfrdür. Lakin onlarda təvil olduğuna görə, bunları müəyyən olaraq təkfir etməkdən imtina

etmişlər. Və Xəvariclərin şəfaət naslarını təkzib etmələri ilə, böyük günah əhlinin İslamına və imanına dəlalət edən nasları yalan saymaları ilə, səhabələrin və müsəlmanların qanlarını halal saymaları ilə və həmçinin, Mötəzilələrin böyük günah əhli üçün olan şəfaəti təkzib etmələri, qədəri inkar etmələri, Allah təalənin sifətlərini inkar etmələri ilə və başqa dedikləri sözlərlə Allahdan başqasına dua etməyi və ondan kömək istəməyi icazəli bilən arasında heç bir fərq yoxdur.

Artıq şeyxülislam İbn Teymiyyə öz kitablarında - "ər-Raddu aləl-Bəkriy" və "ər-Raddu aləl-Əxnəiy" və başqa kitablarında bəzi şeyxlərdən bu kimi şeylərin baş verməsini zikr etdikdə açıq-aydın bildirmişdir ki, cahilliyin çoxalmasına və peyğəmbərlik əsərləri barəsində elmin azalmasına görə inkar edənin kafir olduğu hüccət qalxana qədər onların təkfiri mümkün deyildir. Onun sözü məşhur və hamıya bəllidir. **Bundan bizə aydın oldu ki, kimdən inadkarlıq olmadan cahillik, təqlid və ya təvillə (yozumla) bu şeylər baş verərsə, müəyyən olaraq onun təkfirinə hökm verilməz.** Hətta ondan baş verən bu işlər küfr olsa belə, əvvəldə zikr etdiyimiz maneəyə görə".

Şeyxin dedikləri açıq-aydındır və sonra deyir:

"Əgər deyilsə ki, ***"Ey Rəbbimiz unutduqda və ya xata etdikdə bizi cəzalandırma." (Bəqərə surəsi, 286)*** ayəsində və başqa şəri naslarda zikr olunan "xəta" əməllərdə (furuda) olan xətadır, əqidədə (üsulda) olan xəta deyildir. Bu söz dəlilsiz deyilmiş bir sözdür. Allah və rəsulu bu ümməti əfv etmək məqamında əqidə ilə əməlin arasında heç bir fərq qoymamışdır. Sələflərin bidət əhlini təkfir etməmələrini zikr etdik, bu bidət əhli elə məhz dinin üsullarındakı məsələləri təvil etmişlər. Xüsusən də, Xaliqin sifətlərini inkar edən Mötəzilələr və başqaları. Həqiqətən tövhid Allah üçün ən kamil sifətləri isbat etmək, başqa heç kimə yox, tək Ona ibadət etmək üzərində durmaqdadır. Necə ki, birinci qismdə cahilliklə, təvillə və ya təqlidlə Allahın sifətlərini inkar edən

müəyyən şəxsi hüccət qalxana qədər təkfir etmirik, bundan imtina edirik, eləcə də, ikinci qismdə də, cahilliklə, təvillə və ya təqlidlə ibadətlərdən bəzilərini məxluqata tərəf yönəldənin təkfirindən də imtina edirik. Bundakı maneə o birisindəki maneə kimidir. Hər iki işi rəsul gətirmiş və ümmətinə çatdırmışdır".

Və burada şeyx (Allah ona rəhmət etsin), əvvəllərdə keçdiyi kimi, təkfir məsələsində etiqadi məsələlərlə əməli məsələlərin arasında fərq qoymağı inkar etdi və bildirdi ki, bu, dəlilsiz deyilmiş bir sözdür. Və müəllif artıq şeyxlislam İbn Teymiyyədən nəql etmişdir ki, bu, bidətçi kəlam əhlinin qaydalarındandır. Və həmçinin bidirdi ki, ad və sifətlər tovhidində şirkə və ya küfrə düşənlə ibadət tovhidində şirkə və ya küfrə düşənin arasında heç bir fərq yoxdur, belə ki, hər ikisinə hüccətin qaldırılması labüddür.

Və sonra yenə qarşı tərəfin etirazlarını gətirərək deyir:

"Sən deyirsən ki, dirilişi inkar edənin təkfirində dayanılmaz, necə ki, Allah və rəsulu bu kəsi təkfir etmiş və inad edənlə etməyənin arasında heç bir fərq də qoymamışdır.

Biz də deyirik: Mövzu eynidir. Lakin sifət və tövhid məsələlərində təvil hasil olmuş və bu, rəsulu hər bir şeydə təsdiqləyənlər arasında yayılmışdır. Dirilişi inkar etmək məsələsinə müxalif olaraq, buna çox az halda rast gəlinir. Bununla yanaşı əgər (elm əhlindən) uzaq yerlərdə yaşayan və ya İslamda yeni olan kəsdə bunun olması fərz olunarsa, bu kəsə bu əməlin hökmü öyrədilər, bundan sonra onun küfrünə hökm verilər". Müxtəsər olaraq şeyxin sözü sona çatdı.

Və burada isə şeyx, imanın şərtlərindən olan dirilişi inkar etmək məsələsində cahilliyə az hallarda rast gəlindiyini bildirməklə yanaşı, bunda da cahilliyi kafir adını verməyə maneə olduğunu bildirdi.

Görəsən elm və fəzilətində heç bir şəkk-şübhə olmayan bu dahi alim də bu etiqadına görə bu həddədi təkfirçi firqəsində murciə sayılırmı?

## Şeyx Alləmə, Fəqih Muhəmməd İbn Saleh əl-Useymin

“Şərhu əl-Qavaidi əl-Muslə” kitabında müsəlmanın kafir və ya fasiq olmasını vacib edən müxalifliyindən danışdıqda bəyan edir ki, o kəsə hüccət qalxmayınca, bu müxalifliyinə görə nə kafir və nə də ki, fasiq olmaz. Və deyir:

“Ən mühüm şərtlərdən: kafir və ya fasiq omasını vacib edən müxalifliyini bilməlidir, elm üzərə olmalıdır. Bu da Allah təalənin bu sözünə görədir:

وَمَنْ يُشَاقِقِ الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُ الْهُدَىٰ وَيَتَّبِعْ غَيْرَ سَبِيلِ الْمُؤْمِنِينَ نُوَلِّهِ مَا تَوَلَّىٰ وَنُصْلِهِ جَهَنَّمَ ۖ وَسَاءَتْ مَصِيرًا

**Kimə haqq bəyan olduqdan sonra, rəsuldan üz döndərib, mömünlərdən başqasının yoluna yönələrsə, onu öz tutduğu yola yönəldər və Cəhənnəmə salarıq. Ora necə də pis bir yerdir[98].**

Və həmçinin

وَمَا كَانَ اللَّهُ لِيُضِلَّ قَوْمًا بَعْدَ إِذْ هَدَاهُمْ حَتَّىٰ يُبَيِّنَ لَهُمْ مَا يَتَّقُونَ ۚ إِنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ
إِنَّ اللَّهَ لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ ۖ يُحْيِي وَيُمِيتُ ۚ وَمَا لَكُمْ مِنْ دُونِ اللَّهِ مِنْ وَلِيٍّ وَلَا نَصِيرٍ

**Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları (haqq yolundan) sapdırmaz! Həqiqətən, Allah hər şeyi (olduğu kimi, layiqincə) biləndir!**

**Həqiqətən, göylərin və yerin hökmü (mülkü) Allaha məxsusdur. Dirildən də, öldürən də Odur. Sizin Allahdan başqa havadarınız və köməyə çatanınız yoxdur!** [99]

**Şərh:**

Bu mövzuda başqa ayələr vardır, bunlardan:

وَمَا كُنَّا مُعَذِّبِينَ حَتَّىٰ نَبْعَثَ رَسُولًا

**Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik![100]**

---

[98] Nisə surəsi 115.

[99] Tövbə surəsi 155-116.

**لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ**

**Daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.[101].**

**Bu, (peyğəmbərləri göndərmək) ona görədir ki, Rəbbin məmləkətlərin əhalisini, onlar qafil ola-ola (özlərinə peyğəmbər gəlmədiyi üçün dini vəzifələrini bilməyib icra etmədikləri halda) zülmlə məhv etməyi özünə rəva bilməz! [102]**

Yalnız üzərinə hüccət qalxan kəs kafir və ya fasiq olar, amma hüccət qalxmayan şəxs isə, nə kafir olmaz və nə də fasiq.

Lakin İslam dini üzərində olmayanlar isə (necə ki, dəvət çatmayan qövmlər kimi, bunlar küfr içində yaşadıqları yerə tabe olurlar), bunlara müsəlman demirik, kafir deyirik və bunlarla kafir müamiləsi edirik, axirətdə isə onların hokmü Allaha qalır.

Amma İslama nisbət olan və İslam ölkəsində yaşayan, lakin cahilliklə küfr əməl edən kəs isə, bununla müsəlman müamiləsi edirik, bu kəs hətta küfr əməl etsə belə, çünki o, İslama nisbət olunur, kafir edən əməli və ya fasiq edən əməli isə cahilliklə edib.

**Misal olaraq:** bir insan siqaret çəkən, saqqal qırxan bir qövmün içində yaşayır və heç vaxt da eşitməyib ki, siqaret çəkmək, saqqal qırxmaq haramdır. Bunun barəsində onun fasiq olmasını demirik, çünki ona hüccət qalxmamışdır.

**Başqa bir misal:** bir insan qəbirpərəst bir qövmün arasında yaşayır (yəni peyğəmbərlərin, salehlərin qəbirlərinə gəlir və onlardan öz ehtiyaclarını istəyirlər) və heç vaxt da bu əməlin şəriət tərəfindən haram olduğunu bilməyib. Bunun da həmçinin, küfrünə hökm vermirik, çünki o, müsəlmandır və etdiyi əməlin şəriətnən icazəli olduğunu etiqad edir.

---

100 Isra surəsi 15.

101 Nisə surəsi 165.

102 Ənam surəsi 131.

**Bütün bunlarla aydın olur ki, kafirlər və ya küfr edənlər iki qismə bölünür:**

**<u>Birinci qism</u>:** küfr edir, lakin bu əməlin İslamdan olduğunu etiqad edərək yox, əksinə Nəsranilərin və ya başqalarının dinindən olduğunu etiqad edərək edir, bu, zahirdə də, batində də kafirdir.

**<u>Ikinci qism:</u>** <u>təkfir olunacaq əməl edir, lakin bu əməlin küfr olmadığını etiqad edərək edir. Və bu kəs zahirdə də, batində də İslama nisbətdir, lakin zənn edir ki, bu əməl onu İslam dinindən çıxarmır. Bu kafir olmur.</u>

**Buna misal:** bir insan ölkə alimlərinin hamısının namazı tərk edənin kafir olmadığını deyən bir yerdə namaz qılmır. Və bunun heç ağlına belə gəlmir ki, namazı tərk edən kafirdir. Biz bunun barəsində "o, kafirdir" demirik. Çünki ona hüccət qalxmayıb".

Və sonra deyir:

**"Bununla bilindi ki, sözlə onu deyən, əməllə də onu edən arasında fərq vardır. Hər küfr və ya fisq sözü və ya əməli dən kəsin kafir və ya fasiq olmasına hökm verilmir.**

Şeyxülislam İbn Teymiyyə "Məcmuu əl-Fətəvada" (35/165) deyir:

"Bunun əsli ondan ibarətdir ki, bir söz Kitab, Sünnə və icma ilə küfr olur və deyilir ki, o, söz olaraq küfrdür, şəri dəlillərin göstərdiyi kimi o sözə küfr adı verilir. İman Allah və rəsulundan götürülmüş əhkamlardandır. Yoxsa insanların öz zənləri və havaları ilə hökm verdiyi şeylərdən deyildir. Və hər bir bu (küfr) sözü deyən şəxs barəsində onun kafir olmasına hökm vermək vacib deyildir, hətta onun haqqında təkfirin şərtlərinin cəm olub və maneələrinin aradan qalxmasına kimi. Misal olaraq, İslamda yeni olan və ya (alimlərdən) uzaq yerlərdə yaşayan şəxsin içkinin, ribanın halal olmasını deməsi və ya bir sözü eşidib, amma onun Quran ayəsi və ya peyğəmbərin hədislərindən olmasını etiqad etməyərək inkar etməsi, necə ki, bəzi Sələflər bəzi şeyləri inkar

edib, sonra bilib ki, o, peyğəmbərin (sallAllahu aleyhi və səlləm) sözüdür.

Sonar deyir: belələrinə risali hüccət qalxana qədər təkfir olunmazlar, necə ki, Allah təalə deyir: ***Daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.***[103]**.** Artıq Allah təalə bu ümmətdən unutqanlığı və xətanı əfv etmişdir." Kəlamın sonu.

**Bununla bilindi ki,** deyilən söz, edilən fel bəzən küfr və ya fisq olur, lakin təkfirin və təfsiqin (fasiq hökmü verməyin-t) şərtlərinin onda cəm olmaması və ya maneələrdən hansınınsa mövcud olmasına görə onu deyən və edən şəxsin kafir və ya fasiq olması bundan gərəkmir, lazım olmur.

Lakin kimə haqq bəyan olar və bəzi məzhəbçilərin təəssübkeşliyi kimi etdiyi etiqada tabe olaraq və ya tabe oluduğu kəsləri təzim etməsinə görə - misal olaraq bəzilərinin əmrlər, başçılar, məliklər və s. nə deyirsə, odur deyənlər kimi - və ya dünyanı hər şeydən üstün tutmasına görə öz müxalifliyi üzərində israrlı olar və nəyəsə nail olmaq üçün haqqa müxaliflik edərsə, bu halda o müxalifliyin küfrdən və fasiqlikdən tələb etdiyi şey onun barəsində haqlı olar".

**"Şərhu əl-Qavaidi əl-Muslə" kitabı (364-cü səhifədən sonadək) -** sonra seyx təkfirə maneə olan cahillikddən başqa səbəbləri gətirir və təkfir məsələsində əqidə ilə əməlin arasında fərq qoyanlara rədd verərərək şeyxülislam İbn teymiyyədən bir neçə nasları nəql edir və bildirir ki, bu bölgüyə heç bir dəlil yoxdur. Artıq müəllif buna geniş açıqlama verdi və bəyan etdi ki, şeyxülislam bu bölgünü inkar etmiş və bunun kəlam əhlinin bölgüsü olduğunu bildirmişdir.

---

[103] Nisə surəsi 165.

Və həmçinin şeyx ibn Useymin bildirdi ki, şirkə və ya küfrə düşmüş şəxs hüccət qaldırılanadək kafir adlanmaz və o, müsəlman müamiləsi ilə müamilə olunar.

Lakin heç də bəzilərinin başa düşdüyü kimi təkfir qapısı hamıya bağlı deyildir. Sadəcə bu təhlükəli, əzəmətli və böyük bir məsələ olduğundan, bunun qaytarılan yeri də elm əhli olan alimlər və böyük elm tələbələri olmalıdır. Və necə ki, müəllif, İmam İbn Həzmdən hüccət qaldırmağın vəsfini və imam İbn Səhməndən isə hüccəti kimin qaldırmasını nəql etmişdir. Belə ki, bunlar bildirmişlər ki, hüccəti onu gözəl qaldırmağı bacaran, ayətlərin təfsirini, hədislərin şərhini, elm əhlinin məsələdəki sözlərini bilən və müxalifin şübhələrinə tam cavab verməyə qadir olan kəs qaldırmalıdır və müxalif kəsdən də şübhələr aradan qaldırılmalı və onda bu dəlillərə müqavimət göstərəcək heç bir şey qalmamalıdır.

## Səudiyyə Ərəbistanı Krallığında Daimi Fətvalar Komitəsinin Sədr Müavini Olmuş Və Böyük Alimlər Heyətinin Üzvü Olmuş, Alləmə, Şeyx, Fəqih Abdur Razzaq əl-Afifi (rahiməhullah) (hicri 1415-ci ildə vəfat edib)

**Sual 74:** Lə iləhə illəllah şəhadətinin şərtlərindən olan elm mucməl olan elmdirmi - belə ki, qulun ibadətə Allahdan başqa heç bir kəsin haqlı olmamasını bilməsi kimi - yoxsa təfsilatlı elmdir, belə ki, qulun qurban kəsməyin, nəzir verməyin və s. ibadət növlərinin olduğunu bilməsi kimi?

**Cavab:** "Şərt olan elm mucməl elmdir, təfsilatlı elm deyil. Qulun filosof olması lazım deyil. Buna da dəlil Muazın Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) səcdə etməsi və zətu ənvat (silahlarını ağacdan təbərrük üçün asanların) hədisidir. İbadətlərin

təfsilatlarından cahil olmaq - hər hansı bir şəxsə İslamla hökm verməyə maneə deyil"

**Sual 75:** Şeyx Sananin "Təthiru əl-Etiqad" kitabında ölülərə etiqad edən və onlardan kömək istəyən qəbirpərəstlər (quburilər) barəsində "Onlar əsli kafirdirlər" deməsi və bəzi alimlərin; "Siyənətu əl-İnsan" kitabının müəllifi şeyx Bəşir əs-Səhsəvai kimi alimlərin ona etiraz edərək "Onlar sonradan dindən çıxanlardır" məsələsi haqda şeyxdən soruşdum.

Cavab: "**Onlara əgər hüccət qaldırımış olarsa, dindən çıxmış sayılırlar. Yox, əgər qaldırılmamışsa, onda cahilliklərinə görə üzrlüdürlər, necə ki, zətu ənvat hədisindəkilər kimi. Kim İslama nisbət olunarsa, sonra ondan küfr əməllər baş verərsə və ona hüccət qalxarsa, o mürtəddir, qılıncla öldürülər".**

**Sual 76:** Əsli kafir gözümüzün qabağında şəhadət kəlməsini deyərsə və biz də o kəsin bunun mənası bilib-bilməməsini bəlməriksə...

**Cavab:** Ona zahirinə görə İslamla hökm verilir, əgər cahil olduğu bilinərsə, öyrədilər. Əgər düz yola yönələrsə, əlhəmdulilləh, yoxsa mürtəd olar, əsli kafir yox".

**Sual 77:** Namazı tərk edənin küfrünə hökm vermək üçün hüccət qaldırmaq lazımdırmı?

**Cavab:** Hüccətə ehtiyac var. Əgər bundan qabaq ölərsə, kafir müamiləsi olunar.[104]

**Sual 79:** Dinlə, rəsulla, yaxud Quranla istehza edən və onu söyənin hökmü nədir? Cahil olsa belə, kafir olurmu?

**Cavab:** Bu da başqa küfr növləri kimidir. Bu kəs elmlənməli və ədəbləşdirilməlidir. Əgər bilər, lakin öyrədildikdən və bəyandan

---

[104] Namaz məsələsinin bizim danışdığımız mövzu ilə əlaqəsi yoxdur. Lakin şeyx hətta bunda da hüccət qaldırmağı şərt gördüyünə görə, bunu gətirməyi məqsədə uyğun hesab etdim. Belə ki, şeyx bunda da hüccət qaldırmağın şərt olduğunu bildirdi və məhz bu halda öldükdə isə, şeyx öz görüşünə görə namaz qılmayanı kafir gördüyü üçün onunla kafir müamiləsi ilə müamilə olunduğunu dedi, hökümdən qabaq isə yox.

sonra inad edərsə, kafir olar. Hətta lap "cahilliyə görə üzrlü deyil" deyilsə belə, bunun mənası o deyil ki, o kafir olar. Bunun mənası budur ki, o, elmlənməli və ədəbləşdirilməlidir.

**Sual 80:** Quran məxluqdur deyənin hökmü nədir?

**Cavab:** Bu böyük küfrdür, lakin bunu deyən elmləndirilməlidir, o kəs həmən təkfir olunmur, yalnız hüccət qaldırıldıqdan sonra bunu bilər, lakin israr edərsə onda təkfir olunar".

**Sual 82:** Bir şəxsin şəhadətinə hökm vermək üçün şəhadətin bir tərəfi kifayət edirmi?

**Cavab:** "Muhəmmədun rasulullah" şəhadəti "Lə iləhə illəllah" şəhadətini gərəkdirir, əksi isə belə deyil.[105] **Bununla yanaşı İslamdan hər hansı bir şüarı izhar etmək, onunla müsəlman müamiləsi etmək üçün kifayətdir.**

**Sual 86:** Tövhidin əslində cahillik üzr sayılırmı? Çünki bəzi Sünnə əhlindən zikr olunur ki, tövhidin əslində cahillik üzr sayılmır.

**Cavab:** Həqiqətən Allaha, onun rəsullarına, kitablarına, mələklərinə, Axirət gününə, qədərə imanın və ona bağlı üsul və furular səhih təbliğə və bu dəvətin haqdan nəyə dəlalət etdiyini bilməyə bağlıdır. Bu da insanların bir-birindən elmlərinin üstünlüyü ilə, ağıllarının güclülüyündəki fərqi ilə və həmçinin alimlərin, İslama dəvət edənlərin çoxluğu (və azlığı) ilə və bununla yanaşı haqqı öyrənməyə və haqqı batildən ayırd edə bilməyə və ona əməl etməyə müyəssər olmaqla və yaxud İslam diyarından və İslama dəvət edən dəvətçilərdən uzaq olması ilə müxtəlif olur. Bunun kimi neçə-neçə maneələr vardır ki, onlarla Allahın şəriətini öyrənmək və onun həqiqətini bilmək və ya onda dərinə getmək çox çətin olur.

---

[105] "Muhəmmədun rasulullah" şəhadətini deyən, deməli "Lə iləhə illəllah" şəhadətini qəbul edib, lakin əksi belə olmaya da bilər.

Və belə olduğu təqdirdə insanlara hökm verdikdə bu kimi şeyləri nəzərə almaq vacib olur! Və bəzən isə bəzi insanlara Allaha, rəsuluna və Allahdan gətirdiklərinə mücməl olaraq iman gətirmək vacib olur. Bu da insana bunlardan başqasının çatmamış olduğu və ya bütün qüvvəsini haqqı öyrənməyə sərf edib, ona müyəssər olmadığı vaxtda olur. Necə ki, bu barədə Əbu Hureyranın Peygəmbərdən (sallAllahu aleyhi və səlləm) rəvayət etdiyi hədisdə deyildiyi kimi: *''Muhamməddin nəfsi əlində olan Allaha and olsun ki, bu ümmətdən heç kim, istər yəhudi olsun, istərsədə nəsrani, məni eşidib və mənə göndəriləna iman etmədən ölərsə, yalnız Cəhənnəm əhlindən olar*''. Hədisi Muslim rəvayət etmişdir. Və o vaxt ki, Əbu Səid əl-Xudri Peygəmbərdən belə rəvayət etdi:"*Allahın çoxlu mal bəxş etdiyi bir kişi ölümü yetişdiyi zaman övladlarını yanına çağıraraq onlardan soruşur: Mən sizin üçün necə ata olmuşam? Onlar: "Çox xeyirli ata olmusan" deyirlər. O da belə deyir: Mən heç bir xeyir əməl etməmişəm. Əgər mən ölsəm məni yandırarsınız, sonra külümü yığıb küləkli bir gündə səpərsiniz. Onlar da o dediyi kimi etdilər.Allah təalə onu cəm edir və ona deyir: "Bunu etməyə səni vadar edən nə oldu?" O da cavabında "Sənə olan qorxum" dedi. Belə olduqda Allah təalə onu Rəhmətinə qovuşdurdu*"... Hədisi Buxari və Müslüm rəvayət etmişlər... ***( Şeyx Abdur Razzaq Afifinin 'Fətəva və rasəil' kitabından)***

Şeyxdən nəql etdiyimiz bütün bu cavablarda şeyx, Əhli Sünnənin etiqadına uyğun olaraq etiqadi məsələlərlə əməli məsələlərin arasında fərq qoymayıb, bütün məsələlərdə, hətta ən incə məsələlərdən olan Allahı söymək halında belə cahilliyi üzrlü görüb, böyük şirkə və küfrə düşən şəxsə kafir adını vermək üçün hüccət qaldırmağın şərt olduğunu bildirmişdi.

## Yəmənin Muhəddisi, Alləmə, Şeyx Muqbil İbn Hədi əl-Vadii (rahiməhullah) (hicri 1422-ci ildə vəfat edib)

## (Tövhiddə cahillik üzrlüdür)

**Sual:** Cahilliyin üzrlü olub-olmaması məsələsi barəsində qardaşlar bir-birləri ilə az qala dava etsinlər, bir-birlərini bidətçi çıxarır, bir-birlərini fasiqləşdirirlər.

**Şeyx cavab verir:** Əhli Sünnə özü bu məsələdə, tövhiddə cahilliyin üzrlü olub-olmaması məsələsində ixtilaf etmişlər. Allah təalənin bu – ***"Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməri k!"*** [106]sözlərinə əsasən, zahir olan budur ki, bu məsələdə cahillik üzrdür. İsa peyğəmbərin həvariləri ona "***Rəbbin bizə göydən bir süfrə endirə bilərmi***" dedikdə, İsa peyğəmbər onlara demədi ki, siz artıq kafir oldunuz, əksinə dedi ki, "***Əgər mömin-sinizsə, Allahdan qorxun"***[107] . Həmçinin Musa peyğəmbərin əshabı ondan ilah istədikdə onları təkfir etmədi, əksinə dedi: "***Onlar dedilər: Ey Musa! Onların məbudları olduğu kimi bizim üçün də bir ilah düzəlt. Musa dedi: Həqiqətən, siz cahil bir tayfasınız"***[108]**.**

Səhih Buxaridə bir çox səhabələrin rəvayət etdiyi hədisdə gəlmişdir ki, *"Bir kişi öz oğlanlarına dedi: Mən sizin üçün necə ata olmuşam? Onlar: Çox yaxşı ata olmusan. Ata: Elə isə mən öldükdə, məni yandırın, sonra külümü səpin. Allaha and olsun ki, əgər Allah məni qaytarmağa qüdrəti çatarsa, mənə elə bir əzab verər ki, aləmlərdən heç bir kəsə elə bir əzab verməyib. O öldükdə, oğlanları onun vəsiyyətini yerinə yetirdilər. Sonra Allah dənizə əmr etdi ki, içində olan külü cəm etsin və quruya əmr etdi ki, onda olan külü cəm etsin. Və Allah onu dirildib dedi: Etdiyin bu şeyə səni nə vadar etdi? O dedi: Səndən qorxmağım, ey Rəbbim. Allah dedi: Artıq səni bağışladım."* Bu insan da İsa peyğəmbərin həvariləri kmi Allahın qüdrətində şəkk etmişdir.

Bu dəlillər göstərir ki, cahillik üzrlüdür. **Cahilliyi üzr görməyənlərdə heç bir açıq-aydın dəlil yoxdur**. Bu hədisdən

---

[106] İsra surəsi 15.

[107] Maidə surəsi 112.

[108] Əraf surəsi 138.

sonra İmam Əhmədin Musnəddə rəvayət etdiyi Əbu Hureyrənin və Əsvad İbn Sərinin peyğəmbərdən (sallAllahu aleyhi və səlləm) rəvayət etdikləri hədis: *"Dörd sinif var ki, qiyamət günü imtahan olunacaqlar: heç nə eşitməyən kar, ağılsız, əldən düşmüş qoca və fətra zamanında ölən. Arasatda Cəhənnəmdən bir baş çıxaraq, onlara deyəcək: Girin oda. Kim onlardan oda girərsə, onunçün salamatlıq, kim də girməzsə, Allah ona deyəcək: Siz indi mənə asi oldunuz, deməli Mənim peyğəmbərlərimə bundan daha betər asisiniz".*

Mən sizə Şeyx Şinqitinin ***"Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməriк!"[109]*** ayəsinə, eləcə də, ***"Allah bir qövmü hidayət etdikdən sonra, çəkinmələri lazım olan şeyləri onlara bəyan etmədikcə onları hidayətdən azdırmaz"[110]*** ayəsinə verdiyi təfsiri oxumağı nəsihət edirəm. **Və beləliklə, bu məsələ Əhli Sünnə arasında ixtilaflıdır, müxalif olana heç bir hökm verilmir, lakin racih (üstün) görüş budur ki, cahillik üzrlüdür.** ***(Ğaratu əl-Əşrita kitabı, 2/447-448)*** Şeyxin dediklərinə diqqətlə nəzər yetir, Allah təalə bizi insanların ixtilaf etdikləri şeylərdə daim doğruya müvəffəq etsin.

## Şeyxlərin Şeyxi,[111] Alləmə, Əqidə Alimi, Şeyx Muhəmməd Əmən əl-Cəmii (rahiməhullah) (hicri 1416-cı ildə vəfat edib)

Mədinə İslam Universitetində və Peyğəmbər (sallAllahu aleyhi və səlləm) məscidində dərs demiş böyük alim "Əqidədə şirkə düşən müsəlmanlar cahilliyə görə üzrlüdürlər".

---

109 Isra surəsi 15.

110 Tövbə surəsi 115.

111 Tələbələrindən alləmə Rabii ibn Hədi əl-Mədxali, alləmə Zeyd ibn Hədi əl-Mədxali, fəzilətli şeyx Əli Nasir əl-Fəqihi, fəzilətli şeyx Saleh əs-Suheymi və başqaları.

Şeyx deyir: "Bu insanlar hər bir tərəfdən Qureyşin kafirlərindən pis halda deyillər. Çünki Qureyşin kafirləri Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) iman gətirməmişdirlər, bunlar isə Peyğəmbərə (sallAllahu aleyhi və səlləm) və Qurana mücməl olaraq iman gətiriblər, ölümdən sonra dirilişə iman gətiriblər, Allah zikr olunduqda xatırlayırlar, qorxurlar, çəkinirlər, Cənnətə və Cəhənnəmə iman gətiriblər. Bütün bunlar ona görədir ki, insaflı olaq. Dəvət baxımından isə bunlar Qureyşin kafirlərindən daha pis bir haldadırlar, lakin bunlar cahillik ediblər."

Həmçinin şeyx deyir: "Demək istəyirəm ki, sifətləri inkar etmək, təhrif etmək və Allahın Öz Nəfsi üçün və rəsulunun (sallAllahu aleyhi və səlləm) da, Onun üçün isbat etdiyini inkara gətirib çıxaran təvil etmək, inkar edənin üzrlü olmayacağı küfrə aparıb çıxarır. Bu da ya cahillik, ya da şübhə səbəbilə olur. Şübhə bundan ibarətdir ki, elm tələbəsi öz şeyxlərini əşari əqidəsini müdafiə edən görür. Bu cür şeyxlərin mövcud olması tələbə üçün şübhədir. Çünki o, bu şeyxlərdən nümunə götürür. Bu da elə bir məqamdır ki, bundan saysız-hesabsız danışmaq olar. Biz də burada çoxsaylı üzrlərdən cahillik və şübhələr üzrü ilə kifayətlənək. **İstər etiqadda olsun, istərsə də ibadətlərdə olsun, təkfirdə tələsməməyimiz lazımdır.** Yaxşı, təmiz niyyətli müsəlmanlar var, lakin Allahdan başqasına ibadət edirlər. İbadət tərəfində də təmiz niyyətli müsəlmanlar vardır ki, bu cür əməlləri ibadət yox, salehlərə olan məhəbbət, salehlərlə təvəssül adlandırırlar. Gözəl, təmiz müsəlmanlar vardır ki, uzun-uzadı məsafə qət edərək qəbirə, pirə gəlir, Kəbənin təvafı kimi onu təvaf edirlər. Həmçinin bəzi alimlər var ki, Hüseyn məscidində qəbirin yanında dərs deyir, çöllü (bədəvi) insan da gəlib ondan bu əməlin şəri hökmünü soruşur və o da fətva verir ki, sizin etdiyiniz bu əməl saleh kəslərə olan sevgidir, ibadət deyil. **Belə olduqda bu əmmaməli şeyxə sual verən bu çöllü cahil insan necə kafir görülə oluna bilər**, şeyx də ona cavab verir ki, bu təvaf, atdığınız bu mallar, pullar ibadət yox,

salehlərə olan məhəbbətdir. **Belə olduqda bu çöllü insanların çoxusu məzurdurlar, üzrlüdürlər.** Bu kəslərdə şübhə var, Hüseyn məscidində qəbrin yanında bu əmmaməli şeyxin olması onlar üçün şübhədir. Və onun bu fətvanı verməsi özü-özlüyündə var olan elə bir şübhədir ki, bu çöllü insanı təkfir etməyə maneədir."

Həmçinin şeyx deyir:

"Bu əməllər kəlam əhli alimlərdə lap çoxdur. Qəbirləri, pirləri təvaf edən kəsləri bu şeylərə yalnız cahillik və hidayət yolunun onlara bəyan olmaması salmışdır. Belə olduğu təqdirdə, onlarla asta və səbrlə davranmaq lazımdır ki, onlara hidayət bəyan olsun. Bundan sonra onlara açıq aydın böyük küfrlə hökm verilir, bundan qabaq isə onların küfrü böyük olmayan (dindən çıxarmayan) küfrdür. **Onların əməli küfrdür, lakin onlar kafir deyillər.** Neçə-neçə küfr sözü deyənlər var, lakin kafir deyillər. şeyxülislam da məsələni bu cür başa düşüb (Məcmuu Fətəva, 12/180). Bu imamın mənhəcini dərindən öyrəndikdən sonra mən də bu fikirlə qane oldum. Bilərək ki, cümhur üsul məsələlərində cahilliyi üzr görmür, cahillikdə üzrü yalnız furu məsələlərində görür.[112] Cümhur həmişə fəhm və doğruluq üzrə dəlil olmur. Nasları fəhm etmək və onları tətbiq etmək ən mühüm şeydir. Buna görə də şeyxülislam kəlam əhlindən olan alimlərlə mübahisədə daima bu ayəni təkrar edir

**ومن يشاقق الرسول من بعد ما تبين له الهدى ويتبع غير سبيل المؤمنين نوله ما تولى ونصله جهنم وساءت مصيرا**

***Kimə haqq bəyan olduqdan sonra, rəsuldan üz döndərib, mömünlərdən başqasının yoluna yönələrsə, onu öz tutduğu yola yönəldər və Cəhənnəmə salarıq. Ora necə də pis bir yerdir[113].***

Bu ayədə dəlil yeri **من بعد ما تبين له الهدى** ***"haqq bəyan olduqdan sonra"*** hissəsidir. Bu məsələnin xüsusən də, bu vaxtlarda elm

---

[112] Yəni ümumiyyətlə bütün Islam alimlərinin cümhuru – kəlam əhli və qeyriləri də daxil olmaqla, amma Əhli Sünnənin cümhuru isə bunun əksi üzərindədir, necə ki, buna kitabın gedişində şahid oldun.

[113] Nisə surəsi 115.

tələbələrinə məlum olması vacibdir. Çünki indi dünya bizə çox açılmışdır. Bizə də vacib olur ki, onlarla, xüsusən də (bu şeylərə düşmüş) elm tələbələri ilə necə müamilə edəcəyimizi bilək. Amma (bu şeylərə düşmüş) qeyri elm tələbələri qarşısında bizə vacib olan onları öyrətmək və onları öyrətməkdə, onların hidayətində sadiq olmağımızdır. (Bu şeylərə düşmüş) elm tələbələri ilə asta davranmaq lazımdır, onlar alim olmalarını iddia etsələr belə, onlar cahildirlər. Necə ki, şeyxülislam kəlam əhlinin alimləri ilə mübahisə etdikdə onlara deyərdi "Əgər mən sizin yerinizdə olmuş olsaydım, özümə kafir hökmü verərdim, lakin siz cahilsiniz". Bu da onlara qarşı rəhmət və şəfqətdir. Dəvətçiyə də vacibdir ki, elmsizliyə görə cahillik girdabına düşmüş Allahın qullarına qarşı özündə rəhmət və şəfqət olsun..."

***("Vasitiyyə əqidəsinin şərhindən")***

Və həmçinin "Şərhu əl-Usuli əs-Sələsəti" kitabında (şeyx Muhəmməd İbn Abdul Vahhabın "Üç əsas" kitabının şərhində) deyir:

"Şeyx Muhəmməd İbn Abdul Vahhab deyir: Allah təalə bütün rəsulları müjdələyən və qorxudan olaraq göndərib, dəlil də Allah təalənin bu ayəsidir:

رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

**"Biz peyğəmbərləri (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın"**[114]

**Şərh:** Allah təalə bütün rəsulları müjdələyən və qorxudan olaraq göndərib. Burada rəsulların vəziləfələrinin bəyanı vardır, belə ki, onların vəzifələri möminləri müjdələmək və asiləri qorxutmaqdır. Buna dəlil bu ayədir:

رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللَّهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ

[114] Nisa surəsi 165.

**Biz rəsulları (möminlərə) müjdə gətirən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün rəsullardan sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.**

Onlar deməsinlər ki, bizə nə rəsullar göndərilməyib və nə də ki, kitablar endirilməyib. Amma rəsullar göndərildikdən, kitablar nazil edildikdən və rəsullar və onun tabeçiləri tərəfindən bəyan, açıqlama gəldikdən sonra insanlar üçün Allaha qarşı heç bir hüccət, bəhanə qalmır.

Burada bir az dayanaq. Yer əzərində Allahın hüccəti Onun kitabı və rəsulun (sallallahu aleyhi və səlləm) sünnətidir, belə olduqda, rəsulların göndərilməsi və kitabların endirilməsi ilə yanaşı heç bir bəyan olmazsa və ya bəzi insanlarla bu hüccətin arasında maneə olmuş olarsa, Allahın kitabını fəhm etməklə və ya başqa sözlə desək, Allah rəsulunun gətirdiklərini fəhm etməklə onların arasında şübhələr olmuş olarsa, onlar bu hallarda üzrlü bilinirlərmi? Allah təalə deyir:

وَأَنْزَلْنَا إِلَيْكَ الذِّكْرَ لِتُبَيِّنَ لِلنَّاسِ مَا نُزِّلَ إِلَيْهِمْ

**“Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən”[115].**

“İzah edəsən”, bəyanın olması labüddür. Peyğəmbər (sallallahu aleyhi və səlləm) artıq çox gözəl şəkildə bəyan etmişdir. Lakin bəzən şübhələr və azğınlıqlar hasil olur ki, o da insanlarla bu bəyanı fəhm etməyin arasında maneəyə çevrilir. Necə ki, müsəlmanlar arasında Abbasilər dövlətinin vaxtından bu günə kimi yayılmış kəlam elmi kimi, ad və sifətlər mövzusunda insanlardan çoxuna iş qaranlıq qalmışdır. Sonra da sufilik və vahdətul vucud (əqidəsi) müsəlmanların arasına daxil olmuşdur. İnsanlardan çoxuna ibadət mövzusunda da işlər qarışdırılmış, qaranlıq qalmışdır, onlara başqa cür göstərilmişdir. Və beləliklə də

115 Nəhl surəsi 44

qarışıqlıq və Allahın haqı ilə rəsulun və saleh bəndələrin haqqı arasında fərq qoymamaq hasil olmuş, insanlardan çoxu şübhələrin çoxalması səbəbilə **ibadətdə, ad və sifətlərdə və əhkamlarda** haqdan inhiraf etmiş, azmışlar. Hətta Allah rəsulunun (sallallahu aleyhi və səlləm) gətirdiklərindən elmsiz, cahil qalmışlar.

Belə olduqda onlara haqq bəyan olanadək üzrlüdürlərmi? Yoxsa sadəcə rəsulların göndərilməsi və kitabarın endirilməsi kifayət edirmi, hətta insanlardan çoxu ilə rəsulun (sallallahu aleyhi və səlləm) gətirdiklərinin arasında bu qədər şübhələr hasil olsa belə?

Allahın adilliyinə layiq olan və müsəlmanların təhqiqçi alimlərinin başa düşdüyü budur ki, kimdə bu şeylərdən nə isə baş vermiş olarsa, o, üzrlüdür.

Amma kimə haqq və doğru yol bəyan olduqdan sanra, bunlardan üz döndərərək möminlərdən qeyrisinin yoluna tabe olarsa, haqq ona bəyan olduqdan sonra inadkarlıq və təəssübkeşlik etməklə öz adətlərində və təqlidlərində qalarsa, bu kəslər üzrlü deyildirlər. Lakin onlara doğru yol, hidayət bəyan olmazdan öncə onlar üzrlüdürlər, belə hesab edirlər ki, özlərinin olduqları bu şirk, zəlalət və ad və sifətləri inkar etmək hidayətin özüdür.

Mühüm olan bu məsələni öyrənmək üçün şeyxülislam İbn Teymiyyənin kitablarına və şeyx İbn Useyminin “əl-Qavaid ə-Muslə” kitabına müraciət edin. Bu məsələndən sonra və şeyxülislamın kitablarına müraciət etdikdən sonra, bu məzhəbin doğru olduğunu biləcəksiniz. Və bu inşəAllah haqq olan məzhəbdir, yoldur. İnsanlar dinin usulunda və furusunda (etiqad və əməldə) nə qədər ki, onlara hidayət yolu bəyan olmayıb və nə qədər ki, onlara bu yol bəyan olduqdan sonra, möminlərdən qeyrisinin yoluna tabe olmayıblar, bu şeylərdə eyni dərəcədə olaraq üzrlüdürlər. Allah daha doğru bilir. Həmçinin bu mənaların hamısını “əs-Sifətul əl-İləhiyyə” kitabımda, beşinci fəsildə qeyd etmişəm. Zikr olunan mənbələri oradan götürə bilərsiniz”.

**“Şərhu əl-Usuli əs-Sələsəti” kitabından.**

Alləmə Muhəmməd Əmən əl-Cəminin (rahiməhullah) sözlərindən artıq sənə aydın oldu ki, müsəlman, dinin əqidə, əməl və əhkam məsələlərində cahilliyinə, ona ərz olunmuş şübhələrə və həmçinin hüccəti fəhm edə bilməməsinə görə üzrlüdür, düşdüyü müxalifliyinə görə ona kafir və ya müşrik adı verilməz, hətta ona hüccət qaldırılana və o da, bu hüccəti başa düşənədək. Və bildirdi ki, Şeyxülİslam İbn Teymiyyənin məzhəbi də və haqq olan yol da, məhz budur.

Allahdan istəyirik ki, bizi haqq üzərində sabit saxlasın.

## Alləmə, Şeyx, Muhəddis Rabi İbn Hədi İbn Umeyr əl-Mədxali (Mədinə İslam Universitetinin Hədis Fakultəsinin Sabiq Dekanı)

"Cahilliyin üzrlü olub-olmaması məsələsinin arxasınca insanlardan ancaq fitnə əhli düşüb qaçır və bununla da sələfiləri parçalamaq, onları bir-birinə vurmaq istəyirlər.

Mən Mədinə şəhərində olduqda Riyad əs-Səid mənə zəng etdi ki, burada, Taifdə əlliyə yaxın cavan, şeyx Əlbənini təkfir edirlər. Nə üçün? Çünki şeyx quburiləri təkfir etmir, onları cahilliyə görə üzrlü bilir. Yaxşı! Onlar İbn Teymiyyəni, İbn Qeyyimi və sələflərin çoxunu təkfir edirlərmi? Bu alimlərdə açıq-aydın dəlillər var, bu dəlillərdən:

**وما كنا معذبين حتى نبعث رسولا**

***Biz, peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik!***[116]

**ومن يشاقق الرسول من بعد ما تبين له الهدى ويتبع غير سبيل المؤمنين نوله ما تولى ونصله جهنم وساءت مصيرا**

***<u>Kimə haqq, hidayət yolu bəyan olduqdan sonra</u>, rəsuldan üz döndərib, möminlərdən başqasının yoluna yönələrsə, onu öz***

[116] Isra surəsi 15.

***tutduğu yola yönəldər və Cəhənnəmə salarıq. Ora necə də pis bir yerdir***[117].

**وما كان الله ليضل قوما بعد إذ هداهم حتى يبين لهم ما يتقون**

***Allah bir qövmü hidayət etdikdən sonra, çəkinmələri lazım olan şeyləri <u>onlara bəyan etmədikcə</u> onları hidayətdən azdırmaz.***[118]

Və bunlardan başqa neçə-neçə dəlillər göstərir ki, müsəlman küfrə düşdükdə ona kafir hökmü verilmir. Misal olaraq, insan cahilliyə görə küfrə düşdükdə, hətta ona hüccəti bəyan etmədikcə və ona hüccət qaldırmadıqca onu təkfir etmirik. Hüccətdən sonra inad edərsə, bu halda təkfir edirik.

<u>Bu da Nəcd diyarından olan bir çox alimlərin sözüdür</u>. Onlardan bəzilərinin sözləri bəzən ziddiyyətli olur, bəzən hüccət qaldırmağı şərt görür, bəzən isə deyir ki, cahillik üzrlü deyil. Bəzi insanlar da üzr görməyənlərin sözlərini götürürlər və hüccət qaldırmağın şərt olmasında açıq-aydın olan dəlilləri tərk edirlər. **Müsəlman küfr əmələ düşdükdə, ona hüccət qalxmamış təkfir olunmaz**. Artıq sizə üzr görənlərdən İmam Şafini zikr etdim.

Hörmətli şeyxlərdən birini tanıyırdım, cahilliyi üzrlü görmürdü, o da bu fikri daşıyırdı. Lakin o, fitnə salmaz, münaqişə, mübahisə, cədəl etməzdi və üzr görənləri də təhqir edib, aşağı görməzdi. Biz onunla qırx ilə yaxın dost olaraq yaşadıq. Bu yaxın vaxtlarda vəfat etdi. Bir dəfə məclislərdən birində idim, bir nəfər üzrün olmamasından danışırdı. Mən də ona bu dəlilləri zikr etdim və ona dedim ki, Nəcd alimləri bir-birilərini tanıyırdılar, onlardan bəziləri cahilliyi üzr görür, bəziləri isə görmürdü. Lakin onlar qardaş idilər, onların arasında heç bir ixtilaf, mübahisə və başqa şeylər də yox idi. Şeyx susdu və mübahisə etmədi, çünki fitnə istəmirdi.

---

[117] Nisə surəsi 115.
[118] Tövbə surəsi 115.

Biz bilirik ki, bu ixtilaf Nəcddə və başqa yerlərdə alimlər arasında olub. Lakin onların arasında heç bir mübahisə, bir-birlərini aşağı görmək, azmaqda ittiham etmək, hərb və fitnə olmayıb. Bu şeylər yalnız, Həddədilərin[119] yoludur. Bunu, azğın, hiyləgər Həddədilər Əhli Sünnənin arasını bir-birinə vurmaq və fitnə salmaq üçün yayırlar. Onlar gizlənmiş təkfirçilərdir! Onlarda təkfirdən başqa da bir çox bəlalar var, öz xəbis mənhəclərini və xarab məqsədlərini gizlətmək üçün ən murdar təqiyyələrdən istifadə edirlər.

Bu təkfir mənhəcində olanlardan bir cavan daim özü ilə cahilliyin üzrlü olmaması barəsində olan bir kitab gəzdirir, Riyad, Taif, Məkkə, Mədinəyə gedirdi. Bizim yanımızda dərs alırdı, hiss etdik ki, bu da bu cür (fitnəkarlıqla) bu fikri gəzdirir. Dəfələrlə onunla münaqişə etdim və ona İbn Teymiyyənin mənhəcini, Sələflərin mənhəcini və dəlilləri bəyan etdim, o isə mübahisədə davam edirdi. Ona dedim: Sənin imamın kimdir? Dedi ki, filankəs, filankəs. Allaha and olsun ki, o kəslərin sözlərini araşdırdım və gördüm ki, onların bu mövzuda olan sözləri bir-birini vurur, bəzən cahilliyi üzr görür, bəzən isə görmür. Mənə dedi ki, mən filankəsləyəm. Mən də ona dedim ki, bu da filankəs, başladım ona o şeyxin sözlərini saymağa ki, bax, bu-bu yerlərdə cahilliyi üzr görür və hüccət qaldırmağı şərt görür. Sonra dedi: Yox, mən İbn Qeyyimləyəm. Dedim ki, sən artıq İbn Qeyyimi çoxdan inkar etmisən. İbn Qeyyim hüccət qaldırmağı şərt görür. Çaşıb qaldı, lakin öz zəlalətində israr edirdi. İnad etdi, sonra bu dövlətdən qovuldu, daha sonra yenə qayıtdı. Onunla münaqişə edərkən ona dedim: Təsəvvür et ki, adalardan birində insanlar yaşayır, özlərinə də heç vaxt sələfi dəvətçilər gəlməyib. Misal olaraq, onların yanına təbliğ camaatından kimlərsə gəlib və onlara İslamı öyrədərək,

[119] Müasir azğın, təkfirçi firqəsi.

deyiblər ki, İslam budur. Bu öyrətdikləri isə İslamda isə xurafat, bidət, hulul (Allahın məxluqata qarışması - sufi əqidəsi- tərc.), zəlalət və s... doludur. Onlara deyiblər ki, İslam budur. Onlar da bunu qəbul edib, Allaha İslam adlandırılan o dinlə ibadət edirlər. İndi sən onları təkfir edirsən, yoxsa onlara başa salır, onlara hüccət qaldırırsan? Dedi ki, onlar kafirdirlər, onlara hüccət qaldırmaq şərt deyil. Ona dedim: Sən qayıt Əlcəzairə, sən indi oradakı qiyamçılardan, üsyançılardan (təkfirçi xavariclər orada qiyam qaldırmışdırlar-tərc.) daha betər təkfirçisən. Get onların yanına, bu yerlərdə sənə yer yoxdur.

**İbn Teymiyyənin, İbn Qeyyimin bu məsələdəki mənhəci açıq-aydın dəlillər, bürhanlar üzərində bina olunub və bu da inşəAllah Sələfin mənhəcidir. Kim bundan başqasını götürər, bundan başqası ilə qane olar və susarsa, bizim onda işimiz yoxdur. Amma gedib fitnə qaynadar, başqalarını azmış sayar və təkfir edərsə, Allaha and olsun ki, onun barəsində susmaq yoxdur. Mən cavanlara bu məsələni tərk etməyi nəsihət edirəm. Ona görə bunu nəsihət edirəm ki, bu məsələ müsəlmanların arasında fitnə və şər səpmək üçün vasitələrdəndir.**

Yaxşı! İmam Muhəmməd İbn Abdul Vahhabdan bu günə kimi nə qədər vaxt keçib, o alimlərin arasında bu məsələdə heç bir mübarizə olmayıb. Onlardan kimisi ictihad edib və bu rəyi seçib, susub və gedib bunu öz kitablarında sadəcə yazıb, yayıb. Və kimisi də buna müxalif olub. Onların hamısı qardaş idi, aralarında heç bir ixtilaf, mübahisə olmayıb və kimsə kimisə azmaqda ittiham etməyib, təkfir etməyib. Lakin bu kəslər isə təkfir edirlər!

Baxın! Necə də bu məsələ ilə İslam imamlarını təkfir etməyə keçid etdilər! Bu da sənə onların məqsədlərinin axmaqlığını, daxillərində olanların xəbisliyini göstərir.

**Mən Sələfi cavanlara bu məsələyə girməməyi nəsihət edirəm. Allah sizə bərəkət versin. <u>Doğru olan məzhəb hüccət qaldırmağı şərt görməkdir. Əgər kiməsə bu üstün (racih) görünməzsə, ona</u>**

**<u>vacibdir ki, sussun və başqalarına ehtiram göstərsin, onları azğınlıqda ittiham etməsin. Çünki haqq onlardadır, Allahın kitabı, peyğəmbərin (sallAllahu aleyhi va səlləm) Sünnəsi və Sələflərin mənhəci onlardadır.</u> Kimsə təkfir etmək istəyərsə, onda Sələfləri təkfir edir! İbn Teymiyyəni və İbn Abdul Vahhabı təkfir edir. İmam Muhəmməd İbn Abdul Vahhab deyir: "Biz qəbirlərin ətrafında təvaf edənləri və ona ibadət edənləri, hətta onlara hüccət qaldıranadək təkfir etmirik. Çünki onlara öyrədən, bəyan edən olmayıb.**" Kəlamın sonu.

***(“Fətəva fil Aqidə val Mənhəc” (İkinci dərs))***

Şeyxmiz alləmə Rabi Əl-Mədxali (Allah onun həyatını Özünə itaətdə uzatsın) dəlilləri zikr etməklə bildirdi ki, müsəlman müxalifliyindən elmsizliklə şirkə və ya küfrə düşərsə, ona hüccət qaldırmamış ona kafir adı verilərək İslam dinindən çıxarılmaz. Və bildirdi ki, İmam Şafinin, şeyxülislam İbn Teymiyyənin, İbn Qeyyimin, Muhəmməd İbn Abdul Vahhabın da bu məsələdə görüşləri bu olmuş və Sələfin də mənhəci məhz bunun üzərində bina olmuşdur. Bu məsələni götürərək, bunda dərinə gedərək insanları fitnəyə salmaq isə, təkfirçi həddədi firqəsinin yoludur ki, bununla da Sələfilərin arasına təfriqə və hərc-mərclik salmaq istəyirlər. Və  şeyx, bu məsələnin təhlükəli olduğunu bilərək dedi ki, “Mən Sələfi cavanlara bu məsələyə girməməyi nəsihət edirəm”.

## <u>Alləmə, Fəqih Saleh İbn Fovzən İbn Abdullah əl-Fovzan (Böyük Alimlər Heyətinin Və Daimi Fətvalar Komitəsinin Üzvü)</u>

Hafiz İbn Qeyyimin "Nuniyyə" kitabına verdiyi şərhində (3/1043) deyir:

"İbn Qeyyim (rahiməhullah) burada Əhli Sünnə vəl-Cəməanın təkfir etdiyi bu kəsləri bir neçə qismə böldü:

***Birinci qism:*** Haqqı bilən, lakin ona inadkarlıq və üsyankarlıqla qarşı çıxanlardır. Bunların küfründə heç bir şəkk-şübhə yoxdur, haqqı bilib, lakin öz batillərindən əl çəkməyən Cəhmilər, Rafizilərin həddi aşmışları və Sufilərin həddi aşmışları kimi. Çünki belə olarsa, idarəçiliklərindən, insanların onları tərif etmələrindən və əldə etdikləri şeylərdən nələrsə onların əllərindən çıxar. Bu kəslərin küfründə heç bir şəkk yoxdur və bunlara heç bir üzr yoxdur, çünki onlar haqqı bilib, lakin onu qəbul etməmişdirlər.

***İkinci qism:*** **Bunlar da bu sözləri deyirlər, lakin bunlar haqqı bilmirlər** və haqqı öyrənməyə də gücləri çatır, əgər axtarsalar, haqqı bilərlər. **Fəqət, səhlənkarlıq etmiş və haqqı axtarmamışdırlar**, lakin dediyimiz kimi bunlar haqqı axtarmağa qadirdirlər. **Bu kəslər isə şəkk yoxdur ki, fasiqdirlər**.

Lakin elm əhli bunların təkfirində ixtilaf etmişdir. Beləki, bəziləri bunların kafir olduqlarını, bəziləri isə olmadıqlarını söyləmişlər. Kafir görənlər demişdir ki, bunlar haqqı axtarmağa qadirdirlər və bunlar bilgi, mərifət əhlidirlər. Buna baxmayaraq isə, haqqı axtarmamışdırlar. Bunlar əgər istəsələr haqqı bilərlər və buna qadirdirlər. Lakin kafir görməyənlər isə deyirlər ki, bunlar haqqı bilmirlər. İmam İbn Qeyyim bu kəslərində dayanaraq, onları təkfir etməmişdir.

***Üçüncü qism:*** Elə insanlardır ki, haqqı bilmirlər və özləri də, onu axtarmağa və ona çatmağa qadir deyillər. Bunlar iki qismdir:

Bir qism insanlar zəlalət əhlindən yaxşı olduqlarını zənn etdikləri kəslərə təqlid etmişlər. Bunlar cahillərdir, elə bir kəslərə təqlid etmişlər ki, bilmirlər ki, onlar zəlalət əhlidirlər.

Digər qism isə haqqı bilmir, lakin onu axtarmaq istəmişlər, amma ona müvəffəq olmamışlar. İstədiklərinə çatmamışlar, belə ki, işlərə öz qapısından yaxınlaşmamışlar. Bu kəslər şəkk yoxdur ki, öz əməllərində azmışlar, lakin bunlara fasiq deyilməz. Bunlardan kim haqqı axtarar və ona çatarsa, ona iki əcr və kim də axtarar və ona çatmazsa, ona bir əcr vardır!

Bu, elə bir təfsilatdır ki, bu məsələdə bu təfsilatın olması labüddür. Və bu, İbn Qeyyimin bu mühüm beytlərdə zikr etdiyinin qısaca mənasıdır".

Və sonra şeyx (Allah onu qorusun) İbn Qeyyimin indi zikr edəcəyimiz bu sözü üzərinə deyir (3/1048):

İbn Qeyyim deyir (bu misraları o, şerlə deyir):

"İnadkarlar açıq-aşkar küfr əhlidir, cahillər isə iki növdür.
(Birinci növ) elm və hidayət səbəblərinə qadirdirlər, bu səbəblər bunlar üçün asandır və imkanları da vardır.
Lakin cəhalət diyarını özlərinə qərar tumuşlar və korlar kimi təqlidi özlərinə asan hesab etmişlər.
Haqqa çatmaq üçün də, qadir olduqlarını bu iş barəsində səhlənkarlıq edərək sərf etməmişlər.
Bu kəslərin fasiq olmasında şəkk yoxdur, **küfrlərində isə <u>bizdə</u> iki görüş vardır.**
Mən isə bunların hökmündə dayanmışam, onları nə küfrlə, nə də ki, imanla vəsf etmirəm".

Şeyx (Allah onu qorusun deyir) deyir:

"Bunlar cahildirlər, onlarda haqqı tələb etməyə qüdrətləri var, amma ondan üz döndərərək onu tələb etməmişlər. Bunların fasiq olmalarında şəkk yoxdur və **<u>təkfirlərində də iki görüş vardır</u>**. İbn Qeyyim (rahiməhullah) təkfir etməmişdir, dayanmışdır".

Mən deyirəm: Burada şeyx, İbn Qeyyim kimi bəyan etdi və bildirdi ki, <u>Əhli Sünnə bu kəslərin təkfiri barəsində ixtilaf etmişdir</u>: Kimisi bunları təkfir etmiş, kimisi də, sadəcə fasiq olduqlarını söyləmişdir və bu ikincilər barəsində müəllif artıq kitabda geniş danışdı, və bildirdi ki, bu görüş cumhur imamların ittifaqının görüşüdür və dəlillərini zikr etmişdir. Və şeyx də burada İmam İbn Qeyyim kimi açıq-aydın bildirdi ki, bu, Əhli Sünnənin görüşüdür. Daha bəzi özlərini elmli göstərən, əslində isə elmsiz olub kənardan elmə soxulanlar kimi bu kəslərin kafir olmasında icma olduğu iddiası irəli sürmədi və bu heç elm əhlinə yaraşmaz da! Yəqin bu

sözünə görə şeyx, həddədi təkfirçi firqəsində başqa elm əhlindən olan məzlum qardaşları kimi murciyədir!!! Yardım yalnız Allahdandır.

Və sonra şeyx davam edir:

"Bu kəslər haqqı tələb etməkdə səhlənkarlıq etmiş və korlar kimi başqalarına təqlid etmişlər. O kəslər kimi ki, başqaları tərəfindən yola yönəldilirlər. Bunlar kor deyillər, lakin bu, onlara oxşadıqlarına görə çəkilmiş bir misaldır".

Sonra şeyx əl-Fovzən öz rəyini bəyan edir ki:

"Bu bəzi insanlar deyirlər ki, qəbirlərə ibadət edənlər (öyrənməyə qadir olan bilgi əhli) cahilliklərinə görə üzrlüdürlər. Və deyirik ki, **onlar, əgər istəsələr haqqa çatmağa qadirdirlər. Onlar necə üzrlü bilinərlər ki, onlarda Quran, Sünnə və elm əhlinin sözləri vardır. Lakin onlar özlərini tərpədib haqqı tələb etməmiş, haqqı öyrənməyə qüdrətləri olduqları halda öz olduqları vəziyyətlərində qalmışdırlar**. Bunlar üzrlü deyillər, çünki elm əhlində belə bir qayda var: **Kimə hüccət çatmışdırsa** və özü də əgər istəsə bu hüccəti fəhm etməyə qadirdir, lakin səhlənkarlıq edərək bu hüccəti tərk edib, bu kəs təkfir olunur. Bu kəslər düşdükləri şirkə və qəbirlərə ibadətə görə üzrlü bilinməzlər".

Bax, ey mənim insaflı qardaşım! Şeyx açıq-aydın bildirdi ki, qəbirə ibadət edənlərdən kimdə Quran, Sünnə, alimlərin sözü olmuş olarsa və özünə də artıq hüccət çatmış olarsa, bu şəxs təkfir olunur.

Sonra şeyx axırıncı beytə şərh verərək deyir: İbn Qeyyim deyir:

**"Mən isə bunlarda dayanmışam, onları nə küfrlə, nə də ki, imanla vəsf etmirəm".**

Şeyx deyir: "Bu, İbn Qeyyimin bu kəslər barəsində olan rəyidir**. İbn Qeyyim onları kafir adlandırmayıb, təkfirində dayanmışdır.** Lakin fasiq olduqlarını isə deyir. Bu ona görədir ki, bizə qalan ancaq zahirdir, amma batini isə Allahdan başqa heç kəs bilmir".

Sonra ibn Qeyyim bundan sonrakı beytdə deyir: "**Allahdır onların batinlərində olanları bilən, bizə qalan isə zahirdir**".

Sonra alləmə Saleh əl-Fovzən deyir (3/1049): "Onlar fasiqdirlər, bunda heç bir şəkk yoxdur və cəzanı özlərinə vacib ediblər. Lakin söz onların İslamdan küfrə çıxarılmasından gedir. **<u>İxtilaf yeri burasıdır".</u>**

Bütün bu sələfi nəqllər azgın təkfirçi həddədi firqəsini şimşək kimi yandırıb-yaxır. Və mən bu yola dəvət edənlərə deyirəm ki, sələfi imam İbn Qeyyim bu hallarda olanlara hökm verməkdə dayanmışdır! Bəs siz kimsiniz!? Özünüzü tanıyın! Müsəlmanları, xüsusən də Sünnə və Hədis Əhlindən olan Sələfi Tovhid Əhlini haqsız yerə təkfir edir və ya onları bidətdə ittiham edirsiniz. Sizin şərlərinizdən Allaha sığınır və bu mübarək sələfi dəvətini və bu yola tabe olanları da Allaha sığındırırıq. Əmin.

Əgər alləmə Saleh əl-Fəvzən (Allah onu qorusun) deyirsə ki:

"**Bu, İbn Qeyyimin bu kəslər barəsində olan rəyidir ki, bu da onları təkfir etməyib dayanmaqdır. Lakin fasiq olduqlarını deyir**".

Və sonra deyir: "**Onlar fasiqdirlər, bunda heç bir şəkk yoxdur və cəzanı özlərinə vacib ediblər. Lakin söz onların islamdan küfrə çıxarılmasından gedir. <u>İxtilaf yeri burasıdır".</u>**

Şeyx burada İbn Qeyyimin məsələdə dayandığını deyir və məsələdə ixtilaf olduğunu bildirir. Görəsən bu firqə şeyxin bu sözünü götürərək ən azından tövhid əhli barəsində dillərini tutacaqlarmı??? Kaş ki, bu belə olardı və lakin ...

Nə üçün bəziləri zülm edərək, öz havalarına tabe olaraq Əhli Sünnəyə etdikləri bu savaşda nəcd alimi olan bu şeyxin sözünü götürmürlər? Hansısa Əhməd əl-Həzimi, Nasir əl-Ömər, Adil ali-Həmdən, Abdul Həmid əl-Cuhəni, Səfər əl-Hivali, və sairləri kimi təkfirçi "şeyxlərinizin" sözünü və mənhəcini götürərək və bundan daha da pisi bəzilərinin etdiyi kimi internet şəbəkələrində məchul təkfirçi saytlarından qidalanaraq məsələdə icma olduğunu iddia

edir, insanları azdırır və diyarı ifsad edirlər?! Bundan Allaha sığınırıq!

Və həmçinin şeyx Saleh əl-Fovzan şeyx Rabi ibn Hədi əl-Mədxalinin "Mənhəcu əl-Ənbiyə fi əd-Dəavati ilə Allah" (Peyğəmbərlərin Allaha dəvət mənhəci) kitabında haşiyədə alləmə Rabinin bu sözünə qeyd edərək deyir:

Şeyx Rabi deyir:

"Bu ölkədə yaşayan müsəlmanlar - az bir qismindən başqa - başqalarının İslamı və tövhidi başa düşmələrindən insanların ən uzaq olanlarıdır. Bunların etiqadları qonşu ölkələrdəki bütpərəstlərin etiqadına çox güclü təsir edir. Bütpərəstlərə məxsus nə qədər ibadətgahlar vardır ki, onunla üzbəüz müsəlmanlara məxsus ucaldılmış qəbirlər, əklillər olan, ətir yandıraraq tüstüsü göyə qaldırılan, ipək geyindirilmiş məşhədlər vardır. Müsəlmanlar da bu qəbirlərin ətrafında xuşulu halda, zəlil vəziyyətdə və təzim edərək dayanır və övliyalar barəsində etiqad edirlər ki, onlar qeybi bilir və kainatı idarə edirlər".

Şeyx Saleh əl-Fovzan haşiyədə əlavə edərək deyir:

**"Bu şeyləri edən kəslərə müsəlman adı aid edilməz, yalnız bunları cahillikdən dolayı edən və özünə də hüccət qalxmamış kəslərdən başqa".**

Yəni, bu əməlləri cahillikdən edən və özünə də, hüccət qalxmamış kəslərə müsəlman adı verilər.

**Həmçinin Şeyx Saleh əl-Fovzan "ət-Təkfiru beynə əl-ifrati və ət-təfrit" kitabında deyir:**

"Bu məsələnin dəqiqləşdirilməsinə dəlalət edir. Əsl budur ki, müsəlman İslamda hesab olunur, ta ki, İslamdan çıxaran məlum amillərdən birini etdiyi tam təsdiqini tapana qədər. Bu əməllərin ən şiddətlisi Allaha şərik qoşmaq, Allahdan başqasına dua etmək, kömək istəmək və İslamı pozan digər bu kimi amillərdir. Hansı ki, alimlər bunları qeyd etmişlər. şeyxülislam Muhəmməd İbn Abdul Vahhab (rahiməlhullah) bu amilləri "İslamı pozan şeylərdə"

toplamış və onları kiçik risalədə cəm etmişdir. Onun qeyd etdiyi əməllər ən çox baş verən əməllərdir. İslamdan çıxaran amillərdən biri baş verdikdə və onu edən **üzrlü hesab olunmazsa**, onun mürtəd olduğuna hökm edilər. **Belə insana hökmü verən rəbbani və elmdə püxtələşmiş alimlər olmalıdır**. İnsanların kafir olduğuna dair hökmü elm iddiasında olanlar, yaxud elmdə yeni olanlar, yaxud cahillər, ya da, heç bir elm və düşüncə olmadan kor-koranə danışanlar verməli deyillər. Bu çox təhlükəli məsələdir. Bunun qərarı alimlərə, dində fəqih olanlara aiddir.

Kimsə İslamdan çıxaran amillərdən birini edərsə, o zaman ona bəyan edilir, etdiyi iş izah edilir, sonra tövbə etməsi tələb olunur. Ona hökm verməkdə tələsmək olmaz. **Onun təkfirinə mane olan üzrü ola bilər. Üzrlərin birincisi – cahil olmaqdır.** İnsan bu əməlin İslamdan çıxaran əməllərdən olması barədə cahil ola bilər. Bu ona açıqlanır və izah edilir".

**Sual:** Küfrlə vəsf etməklə hər hansı bir insanın kafir olmasını söyləmək və ya onun kafir olmasına etiqad etmək arasında bir fəqr vardırmı?

**Cavab:** **"**Allahdan qeyrisinə dua etmək, (Ondan qeyrisindən) kömək istəmək, dini məsxərəyə qoymaq, (dini) söymək – kimi əməllər alimlərin yekdil rəyinə əsasən heç bir şəkksiz – küfrdür! Lakin bu cür əməlləri edən **fərdi insana** gəldikdə isə, baxmaq lazımdır. Əgər o **cahildirsə və ya təvil edibsə, yaxud təqlid edibsə, ona izah edənə qədər küfr hökmü verilmir.** Çünki onun bu haqda bir **şübhəsi və ya cahilliyi** ola bilər. **Hüccət qaldırmadan ona küfr hökmü verməyə tələsmək olmaz.** Ona hüccət çatdıqdan sonra isə yenə də, öz yoluna davam edərsə, bundan sonra onun küfrünə hökm verilər. Çünki bundan sonra artıq onun üzrü qalmamışdır".

## Şeyx Abdul Aziz ər-Racihi

**Sual:** Əgər bir insan tövhidi pozan bir əməl edərsə, onu müəyyən olaraq təkfir etmək caizdirmi? Məsələn, o Allahdan qeyrisinə dua edərsə, yaxud Ondan qeyrisindən kömək diləyərsə. Düşünərək ki, dua ilə yaxınlaşdığı adam Allah yanında yüksək məqama sahibdir və ona şəfaətçi olacaq.

**Cavab:** O kəsə hüccət qaldırmayana kimi onu təkfir etmək olmaz. Vəziyyətə baxılır, ona bəyan edilir. Əgər başa salındıqdan sonra da, inad edərsə, onun küfrünə hökm edilir. Lakin bundan əvvəl ola bilər ki, o cahil idi və ya təvil etmişdi. Ola bilər çaşıb deyib. Necə ki, öz heyvanını itirən həmin adam kimi. O miniyini tapdıqda demişdir: "Allahım. Mən Sənin rəbbinəm, Sən mənim qulum!" Şiddətli sevincindən dolayı, Allaha belə xitab edir. Beləcə, ola bilər dil xətası etsin. Və ya yozumlu düşünə bilər, yaxud ola bilsin ki, cahildir. Onun halını araşdırmaq və ona izah etmək lazımdır. Və ona bəyan edildikdən sonra da, öz əməlində inad edərsə, o zaman onun küfrünə hökm edilər.

## Alləmə, Şeyx Ubeyd İbn Abdullah əl-Cəbiri

**Sual:** Bu iki sual cahilliyin üzrlü olması məsələsinə aiddir. Yəni, bu məsələdə yanız bir görüşmü var, yoxsa bu məsələ alimlər arasında ixtilaflıdır? Kim İslamı pozan amillərdən birinə düşərsə, cahilliyinə görə üzrlü bilinir, yoxsa yox?

**Cavab:** "Bir görüş yox, çox görüş var, burada alimlər arasında böyük ixtilaf var. Dəlillərdən, həmçinin bizdən əvvəlki elm əhlinin və imamların sözlərindən fəhm etdiyimiz xülasə budur ki, insan cahilliyə görə üzrlüdür. Bəli! Özü kimilərə qapalı qalan şeylərdə, **hətta əqidədə belə, cahillik üzrlüdür.**

**Əqidədə cahilliyin üzrlü olmasına** Buxaridə gələn hədis dəlildir: "***Ölüm ayağında övladlarına onu yandırmalarını, külünü üyütmələrini və sonra da səpmələrini əmr etdi. Sonra dedi: "Allaha***

***and olsun ki, əgər Allah məni qaytarmağa qüdrəti çatarsa, mənə elə bir əzab verər ki, aləmlərdən heç bir kəsə elə bir əzab verməyib"*.** Bu insan mömin idi, Allahdan qorxurdu, lakin hətta bu halda da dirildiləcəyindən cahil idi. Zənn edirdi ki, bu yolla o, Allahın əzabından qurtaracaq. Qissənin davamı ***"Allah onu diriltdi və ona dedi: Etdiyin bu şeyə səni nə vadar etdi? Dedi: Səndən qorxmağım, ey Rəbbim. Allah dedi: Artıq səni bağışladım. Və onu Cənnətə saldı"*.** Bu kəs İlahi qüdrətin birindən cahil idi, Allah onu üzrlü bildi.

Və dəlillərdən, Uca Allah buyurur:

**ومن يشاقق الرسول من بعد ما تبين له الهدى ويتبع غير سبيل المؤمنين نوله ما تولى ونصله جهنم وساءت مصيرا**

***Kimə haqq, hidayət yolu bəyan olduqdan sonra, rəsuldan üz döndərib, möminlərdən başqasının yoluna yönələrsə, onu öz tutduğu yola yönəldər və Cəhənnəmə salarıq. Ora necə də pis bir yerdir**[120].*

Bu ayədən dəlil yeri burasıdır ki, Allah təalə bu ayədə cəzanı **haqq çatmaqla** rəsuldan üz döndərib, möminlərdən başqasının yoluna yönəlməyə bağladı. **Yəni, dedi ki, özünə "haqq çatdıqdan sonra", bundan başa düşülən budur ki, kim cahillik səbəbi ilə rəsuldan üz döndərib, möminlərdən başqasının yoluna yönələrsə, ona heç bir şey yoxdur, o üzrlüdür.**

İkinci ayə:

**إِنَّ الَّذِينَ ارْتَدُّوا عَلَى أَدْبَارِهِمْ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدَى الشَّيْطَانُ سَوَّلَ لَهُمْ وَأَمْلَى لَهُمْ**

***Hidayət yolu özlərinə bəyan olduqdan sonra haqdan dönüb geriyə üz tutanlara şeytan bu günah işləri onlara gözəl göstərdi və onları aldatdı,onlara uzun ömür vəd etdi.***[121]

İnsanlar bu məsələdə iki qismdir: Bir qism o kəslərdir ki, onlara hidayət bəyan olub, bunlar şeytana tabe olublar, ***"... şeytan bu***

---

120 Nisə surəsi 115.
121 Muhəmməd surəsi 25.

***günah işləri onlara gözəl göstərdi və onları aldatdı,onlara uzun ömür vəd etdi".***

İkinci qism isə o kəslərdir ki, onlara hidayət bəyan olmayıb, bunlar barəsində ***"şeytan günah işləri onlara gözəl göstərdi". -*** deyilmir.

Bu məsələdə dəlillər çoxdur, artıq bu barədə alləmə, imam, fəqih, müctəhid Muhəmməd İbn Saleh əl-Useymin öz mübarək və gözəl kitabı olan "əl-Qavaidu əl-Muslə" kitabında yetərincə danışmışdır. Və o, özündən heç bir şey gətirməmişdir, gətirdiyi hər bir şey Qurana və Sünnəyə söykənən dəlillərdir. Mən də sizə bu kitaba müraciət etməyi nəsihət edirəm.

**Əhkamlarda cahilliyin üzrlü olmasına** isə misal, namazını pis qılan insanın hədisi... Buxaridə gələn qissədə bir səhabə gələrək üç dəfə namaz qılır və peyğəmbərə salam verir, peyğəmbər onun salamını alır və deyir: ***"Qayıt yenidən namaz qıl, sən namaz qılmadın". Kişiyə başa saldı ki, onun namazı səhih deyil. O dedi: "Səni haqla peyğəmbər göndərənə and olsun ki, bundan yaxşı namaz qılmağı bacarmıram, mənə öyrət və peyğəmbər də ona öyrətdi".*** Bu hədisdə dəlil yeri budur ki, peyğəmbər (sallAllahu aleyhi və səlləm) ona əvvəlki keçən namazların qəzasını qılmağı əmr etmədi. Belə görünür ki, o şəxs hər dəfə təklikdə namaz qıldıqda, toyuq dimdiyi kimi tez-tez əyilib-qalxaraq namaz qılırdı.

O ki qaldı alimləri məsxərə qoymaq, bu yalnız "Həddədilər"in (təkfirçilərin) xəstəliklərindəndir. Çünki onların gözlərində yalnız özləri kimisi hörmətlidir. Bunlar insanların həddi aşmışlarıdır". Kəlamın sonu.

Gördüyün kimi, bu böyük şeyx də, bildirdi ki, müsəlman istər əqidədə, istərsə də əməl və əhkam məsələlərində olsun, cahilliyinə görə üzrlüdür. Bunun barəsində isə artıq yuxarıda uzun-uzadı təfsilatlı şəkildə danışıldı ki, Quran və Sünnə, həmçinin səhabələr, tabiinlər və böyük İslam imamları və alimləri bidətçi kəlam əhlinə müxalif olaraq, üzr görməkdə əqidə ilə əməlin arasında heç bir fərq

qoymayaraq hər iki məsələdə də, müsəlmanlardan şəriətə müxalif olan şəxslərdə cahili üzrlü bilmişdirlər. Bu da, Allahın rəhmətinin genişliyindəndir ki, qul yalnız ona dəlil çatdıqdan sonra mükəlləfiyyətlik daşıyır və Allah təalə də, yalnız hüccət çatdıqdan və bəyan olduqdan sonra cəza verir.

## Alləmə Şeyx Saleh ibn Abdul Aziz əliş-Şeyx (Səudiyyə Ərəbistanı Krallığında İslam Dini İşləri Naziri)

**Alləmə şeyx Saleh ibn Abdul Aziz əliş-Şeyx** elm əhlindən birinin "Təqriru Əimməti əd-Dəavati fi Məsəili əl-imən" adlı doktura (elmlər namizədi) risaləsini münaqişə etdikdə, şeyx Muhəmməd ibn Abdul Vahhabın bəzi övladlarının və şeyx Həməd ibn Nasirin dedikləri sözə qarşı sərt davranmışdır. **Belə ki, onlar böyük küfr olan söz və ya əməl edən müsəlman barəsində demişlər ki, bu kəsə hüccət qalxana qədər nə küfrünə və nə də ki, müsəlman olmasına da hökm vermirik.** Və şeyx bildirmişdir ki, bunların bu sözləri Nəcd diyarının başqa dəvət imamlarının sözlərinə uyğun deyildir. Doktur "əd-Durarus-səniyyə" kitabından 10/136-138) şeyx Muhəmməd ibn Abdul Vahhabın bəzi övladlarından və şeyx Həməd ibn Nasirdən nəql edir ki, onlar deyirlər: "**Bu şəxsə hüccət qalxmadığına görə onun küfrünə hökm verməsək də, "Əgər kafir deyilsə, onda müsəlmandır"-da deyilmir. Əksinə deyirik ki, bunun əməli kafirlərin əməlidir. Bu şəxsə müəyyən olaraq hökm vermək isə ona hüccətin çatmasına bağlıdır".**

Şeyx Saleh etiraz edərək deyir: **Yaxşı, şeyx Həməd ibn Nasir bunu və buna bənzər sözlər deyir. Lakin mümkün deyilmi ki, şeyx bu məsələdə xəta etsin? Mümkün deyilmi ki, o, dəvət alimlərindən bir alim olsa da, lakin görsənmirmi ki, bu sözdə nəsə var? Yəni, necə deyə bilər ki, biz "kafir deyilsə,**

**müsəlmandır"-da demirik. Müsəlman deyilsə, onda bəs nədir? Yəni küfrlə İslamın arasında bir mərtəbəmi var?**

Doktor: Ən azından, hökm gizli qalır.

**Şeyx Saleh: Yaxşı, müsəlmanlarda əsl olan İslam adının qalması deyilmi və küfr də, öz şərtləri və qaydaları ilə baş vermirmi? Yoxsa, müsəlman açıq-aşkar küfr əməl edən kimi hüccətdən qabaq İslam adı ondan götürülürmü? Xeyr! Müsəlmanlarda əsl olan İslam adının qalmasıdır, çünki müsəlmandan İslam və iman adı götürülməz, hətta ona kafir edən hüccət qalxmayınca. Və** (onu İslamdan çıxaran) **bu hüccət də, onu imana daxil edən hüccətin (dəlilin) aydın olması kimi aydın olmalıdır.** (Necə ki, hədisdə gəmişdir:) **"O "lə iləhə illəllah" dedikdən sonramı onu öldürdün?" - bu** (şəhadəti demək) **açıq-aydın olan bir şüardır. Və həmçinin ondan İslam adının götürülməsi üçün, labüddür ki, şüar, hüccət açıq-aydın olsun. Şeyx Həməd ibn Nasir (rahiməhullah) bu cür desə də belə, bu sözün düzəlişə ehtiyacı vardır. Çünki bu söz - "Kim zahiri küfr əməl edərsə nə müsəlman adlanmır və nə də ki, kafir adlanmır" - sözü digər dəvət imamlarının sözü ilə uyğunlaşmır, bu səhvdir. Bu, mənə görə doğru deyildir, əksinə bu sözdə düzəlişə və dəqiqləşdirməyə ehtiyac vardır".**

Və sonda şeyx deyir: **"Şeyx Həməd bizə sevimli olan birisidir, lakin necə deyərlər, haqq bizə ondan daha da sevimlidir. Yəni, imanla küfrün arasında heç bir mərtəbə yoxdur, əsl olan da İslam adının qalmasıdır, küfr hökmü isə şərtlər və qaydalar cəm olduqda və maneələr aradan qalxdıqda həyata keçir".**

## Fəzilətli Şeyx Abdullah əl-Buxari (Mədinə İslam Universitetinin Hədis Fakultəsində Dərs Deyir)

**Sual:** Şeyx, bizdə, yəni Tunisdə bəzi cavanlar insanları cahilliyin üzrlü olması məsələsi ilə imtahan etməklə məşğuldurlar. Bu məsələ ilə bağlı onlara nə nəsihət edərsiniz?

**Şeyx Abdullah əl-Buxari:** Bu promlem təkcə Tunisdə deyil, başqa yerlərdə də mövcuddur. Mühüm olan budur ki, bil ki, şirk və küfr məsələlərini – istər böyük olsun, istərsə də kiçik – alimlər öz kitablarında, yazılarında, şərhlərində və dərslərində, bəyan etmişdirlər ki, bunlar şirkdir. Burada heç bir ixtilaf etməmişlər. Bəzi Əhli Sünnə alimləri arasında ixtilaf düşmüşdür. Diqqətli ol! Özlərini müsəlman cəmiyyətlərini təkfir etmək üçün bu məsələyə soxan bidət əhlindən olan alimlərdən danışmıram. Mən yalnız Əhli Sünnə alimləri arasında olan ixtilafdan danışıram. Üzr görməkdə Əhli Sünnə alimləri arasında ixtilaf baş vermişdir. Yoxsa, onlar əməlin şirk olub-olmaması barəsində ixtilaf etməmişlər. Bax, burada diqqətli ol! Burası çox incə bir yerdir. Təvaf etmək, ölüyə dua etmək, ölüdən kömək diləmək, bütün bunların hər biri böyük şirkdir. İstər cahilliyi üzr görən olsun, istər üzr görməyən olsun, bunların hamısı ittifaq etmişdir ki, bu əməllər şirkdir. İxtilafı yalnız bunda ediblər ki, o şəxsə həmin hökm verilirmi, yoxsa ona bəyan olunana qədər üzrlüdür, bəyandan sonra hökm verilir. Belə olduğu təqdirdə, elə isə bu qırğın nəyə görədir? **Bu Əhli Sünnənin sözüdür,** o biri Əhli Sünnənin bəzisinin sözüdür. **Haqq üzr görənlərin sözüdür.** Nəyə görə insanları imtahan edirlər?

Qafqaz ölkələrin birindən bir nəfər Yanıma gəlmişdir. Deyəsən bunu sizə danışmışam, bu şeylər tez-tez təkrarlanır. Və o, insanları təkfir etmək məsələsi canına işləmiş, bu məsələdə dərinə getmiş biri idi. Danışdığı ancaq bu şirkdir, o şirkdir, təkfir nə ilə olur və s. başqa şeylər. Bir neçə dəfə münaqişə etdim və dedim: Qardaşım! Zənn et ki, mən şübhə sahibiyəm, sən isə haqq sahibi. Mənə indi səndən istədiyim şeydə haqqı öyrət. Zənn et ki, sən hidayət üzrəsən, mən isə şübhə əhliyəm. Mənə cavab ver. Təbii ki, özündə heç bir cavab yoxdur. Dedim: Neçə ildir Allah səni bu doğru

olduğunu zənn etdiyin mənhəcə hidayət edib? Dedi: Dörd ildir. Onun yaşı iyirmi üç-iyirmi beş arasında olardı. Dedim: Bu hidayətdən qabaq özünü nə zənn edirdin, kafir, yoxsa müsəlman? Dedi: Müsəlman. Dedim: Yaxşı! Zənn edirsən ki, guya hidayət olunmusan, indi əvvəlki vaxtlarını nə hesab edirsən? Müsəlmanlardan, yoxsa kafirlərdən idin? Susdu! Cavab verə bilmədi. Miskin, yazıq! Dedim: Ata-anan barəsində nə etiqad edirsən? Susdu! Onların müsəlman olduğunu etiqad etmir. Haqdan sonra zəlalətdən başqa nə ola bilər?

Kommunistlərin və ya keçmiş Sovetlər İttifaqının olduğu bəzi dövlətlərdə, insanlar "Mən müsəlmanam" dediklərinə görə öldürülürdülər! İnsan "Mən müsəlmanam" dediyinə görə öldürülür! Heç ola bilsin ki, İslamdan, onun adından başqa heç nə bilmir və öldürülənədək öz İslamından bərk yapışır. Bu həqiqətdir. Bu uzun illər boyu bu kəs İslamını qoruyub saxlayıb, indi sən gəlmisən bütün hərisliyinlə onu İslamdan çıxarmaq istəyirsən, hansı ki, ona görə ölümə belə səbr edirdi. Nədir bu hərislik? Onu İslamdan çıxarmaqmı vacibdir, yoxsa onu İslamı üzərində islah etmək? Əgər sən xeyirə çağıransansa, başqaları üçün xeyir istəyənsənsə, onda sən nəyə can atmalısan? İnsanları islah etməyə, yoxsa onları zülmətə doğru aparmağa? Yoxsa onları Cəhənnəmin lap dibinə atmağa? Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) dəvəti bu cürmü olub? Ona dedim: Ey oğlum! Peyğəmbərin (sallAllahu aleyhi və səlləm) dəvəti - necə ki, İmam İbn Qeyyim və başqaları deyir- iki hissədən ibarət idi:

Birincisi, İslama daxil olmaları üçün kafirləri dəvət etmək. Buna görə də Muazı və başqalarını (dəvətə) göndərdi və dedi: "Sən, əhli kitabdan olan bir qövmün yanına gedirsən, ən birinci dəvət edəcəyin şey, Allaha ibadət etmək olsun", kafirləri İslama girmələri üçün dəvət etmək.

İkincisi, möminləri dində sabit qalmaları üçün dəvət etmək. Möminləri dindən çıxmağa dəvət etmək yox! İki iş arasında nə

qədər fərq var. Kimsə dini öyrənər, ona sarılar, onun əhlindən olar, sonra dində bidət edər və bu məqamda ona düşdüyü şeyi bəyan etmək vacib olur. Əgər israr edərsə, onda hava əhlinə itlaq olunur, onlardan sayılır. Bu başqa məsələdir.

**Siz öz nəfsinizi bu kimi şeylərlə məşğul etməyin, səhih elmi öyrənin. Əgər elm öyrənsəniz, onda artıq danışmayacaq, səhih elmlə qane olacaq, kimin üzrlü və kimin üzrsüz olduğunu biləcəksiniz.**

## Fəzilətli Şeyx Əhməd İbn Ömər Bəzmul (Məkkə Ummu əl-Qura Universitetinin Kitab və Sünnə Qismində Dərs Deyir)

Cahilliyin üzrlü olub-olmaması məsələsi... Sünnə alimlərinin çoxu... Sözümə diqqətlə fikir ver! Qətiyyətlə deyirəm. Sünnə alimlərinin və sələfin çoxu cahilliyin üzrlü olduğu görüşündədirlər. Bəzi sələfi alimlər belə görürlər ki, müsəlmanlardan bir kimsə dəvətdən sonra, İslama girməsindən sonra küfrə və ya şirkə düşərsə, kafirdir. Yaxşı, bu alimlərin digər alimlərə baxışı necədir? Qardaşlıq münasibəti! Onlar bir-birlərini bidətçi və ya zəlalət əhli saymırlar. Bu bir rəydir, o biri başqa bir rəy, bununla da iş bitdi və bura kimi sələfin mənhəcidir.

O kəslər ki, gizlindədirlər, onlar cahilliyi üzrlü görənlərə tən edir, onlara murciyə adını, əsrin murciyəsi adını atırlar. “Kafirə kafir deməyən özü kafirdir” – qaydasına görə onlara kafir deyirlər. Onların sözlərinə görə şeyx Rabii kafirdir, İbn Teymiyyə kafirdir, İbn Qeyyim əl-Cəvziyyə kafirdir, şeyxülislam Muhəmməd İbn Abdul Vahhab kafirdir. **("Nəsaih və Təvcihət lil-Mutəsaddirinə lid-Dəavati" dərsindən..)**

## Sudanlı Şeyx Nizər İbn Həşim əl-Abbas

**“Cahilliyin üzrlü olması və cahilə hüccət qaldırılması məsələsi”** Allah təalə deyir:

**وَأَنَّ الْمَسَاجِدَ لِلَّهِ فَلَا تَدْعُوا مَعَ اللَّهِ أَحَداً**

***Məscidlər Allaha məxsusdur, elə isə Allahla yanaşı <u>heç kəsi çağırmayın!</u>*** [122] Yəni kim olur olsun. Qeyri müəyyənlik qadağan və inkar məqamında gəldikdə ümumilik ifadə edir. Necə ki, müəllif (Muhəmməd İbn Abdul Vahhab) deyir: "Kim bu ibadətlərdən hər hansı birini Allahdan qeyrisinə yönəldərsə, o kafirdir, müşrikdir". Yəni kim bu ibadətlərdən, istər qəlbi, istər ləfzi, istərsə də əməli olsun, hər hansı birini Allahdan qeyrisinə yönəldərsə, o, kafirdir, müşrikdir. Bundan Allaha sığınırıq. Allahdan başqası yəni, Allahdan başqa ibadət olunan batil hər bir şey, daş, ağac, insan, peyğəmbər, mələk. Bu ümumi deyilən sözdür. Necə ki, Allah təalə deyir:

**وَأَنَّ الْمَسَاجِدَ لِلَّهِ فَلَا تَدْعُوا مَعَ اللَّهِ أَحَداً**

***Məscidlər Allaha məxsusdur, elə isə Allahla yanaşı heç kəsi çağırmayın!***

Həmçinin deyir:

**إِنَّ اللّهَ لاَ يَغْفِرُ أَن يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَن يَشَاءُ وَمَن يُشْرِكْ بِاللّهِ فَقَدِ افْتَرَى إِثْماً عَظِيماً**

***Allah Ona şərik qoşulmasını əsla bağışlamaz, bundan aşağısını isə istədiyi kəslərə bağışlayar. Kim Allaha şərik qoşarsa, artıq böyük bir iftira atmışdır.*** [123]

Bu ümumi ləfz olub, Quran, Sünnə və alimlərin kəlamında bilinən bir ümumilikdir. **Cümlələrdəki ümumilik isə həvəsləndirmək və qorxutmaq baxımdan işlədilir.** Və buna görə də labüddür ki, elm öyrənən tələbə ləfzlərdəki ümumiliklərin arasını ayırd etsin. Belə deyilir ki, kim Allahın sifətini inkar edərsə, müşrikdir, kafirdir, kim Allahın adlarını inkar edərsə, müşrikdir,

---

[122] Cin surəsi 18.
[123] Nisə surəsi 48.

kafirdir, kim Allahdan başqasına dua edərsə, müşrikdir, kafirdir. Necə ki, alimlər deyirlər: "Cəhmilər kafirdir, kim desə Quran məxluqdur, o kafirdir". Bunlar ümumi nisbət etmə olub, küfr ləfzi nisbət olunanın üzərinə küfrün həyata keçməsini, onun kafir olmasını bildirmir. Alimlər deyirlər ki, cəhmilər kafirdir, lakin onlardan yalnız üzərinə hüccət qalxanı təkfir edirlər. Həmçinin də burada Allahdan başqasına dua etmək şirkdir, Allahdan başqasından ibadət olan qorxu ilə qorxmaq şirkdir, Allahdan başqasına qurban kəsmək şirkdir. Kim bu ibadətləri Allahdan başqasına yönəldərsə, artıq şirkə düşmüşdür. **Lakin bu şeyləri edən hər bir kəs ona hüccət qalxana qədər və o kəsdən şübhə aradan qaldırılana qədər kafir olmaz.** Belə olduqda kim bu ibadətlərdən hər hansı bir şeyi Allahdan başqasına yönəldərsə, o kafirdir, müşrikdir. Bu ümumi deyilən sözdür, lakin bunu edən hər hansı bir kəsə hüccət qalxana və təkfirin şərtləri, qaydaları onda cəm olana və maneələri aradan qalxana qədər müəyyən olaraq kafirdir, müşrikdir deyilməz. Elmləndirilər, lakin inadkarlıq edərsə, bundan sonra kafir olar. **Bu hökmü də müsəlmanların qazilərdən və əmr sahiblərindən olan hakimləri, yaxud qazinin təyin etdiyi və rabbani alimlərdən olan imamlar verir.** Elə buna görə də şeyximiz Muhəmməd Əmən əl-Cəmii bu ləfzin üzərində deyir ki, "**Hüccət qaldırıldıqdan və şübhə aradan götürüldükdən sonra...". **Beləliklə də, bu söz ümumi deyilir.

Ey qardaşlar, tövhidə olan məhəbbətimiz, tövhidə olan qeyrətimiz, tövhidin əksi olan şirkə düşən kəslərə qarşı qısqanclığımız və aləmlərin Rəbbi Allahın haqqı olan tövhidə olan məhəbbətimiz bizi şəri dəlillərə qarşı çıxmağa və doğru İslam mənhəcinə müxalif olmağa aparmasın ki, bu şirklərdən hər hansı birinə düşən kəsə "Qanı halal müşrikdir, kafirdir, kəsdiyi yeyilməz, qəbri ziyarət olunmaz, cənazə qılınmaz" - deməyək. Əksinə bu məsələ ibadətdir və dəlil üzrə olmalıdır. Təkfir olunan insan şəriətin təkfir etdiyi, dəlilin təkfir etdiyi kəsdir. **Şəri**

**dəlillərlə və ümmətin sələfinin və alimlərinin ittifaqı ilə bilinmişdir ki, küfr əməl sahibinə küfr vəsfi yalnız ona hüccət qalxdıqdan sonra verilir.**

Həmçinin onun halına baxılır: Bu əməli təvil səbəbi ilə edibmi, yoxsa onda olan şübhəyə görəmi edib, yaxud onu bu əmələ öz havası və ya inadımı vadar edib. Eləcə də, bundan başqa ona küfr adı verməyimizə maneə olan bir çox üzrlər və maneələr vardır.

İş heç də bəzilərinin dediyi kimi deyil, buna heç dəlil də yoxdur. Belə ki, deyirlər ki, kim şirkə düşərsə, ona "Müşrikdir!" deyilir, sonra bu adı ondan qaldırmaq üçün ona hüccət qaldırılır. Bunu alimlərdən heç kim deməyib. Çünki hüccətin ən əsas hədəfi bundan ibarətdir ki, bu şəxs kafirdir, yoxsa kafir deyil?! Beləliklə, kimsə barəsində kafirdir, müşrikdir sözü yalnız alimlər vasitəsi ilə, həmçinin şəri qaydalar tətbiq edildikdən və o şəxsin halına baxdıqdan sonra deyilir. Halına baxılır ki, təkfirinə maneələr varmı, onu üzrlü edəcək şeylər varmı, yoxsa yoxdur. Əgər elmləndirilər, sonra da inad və inkar edərsə tövbəyə çağırılar, əgər tövbə edərsə heç, əks halda müsəlmanların sultanı ona şəri hədd qaldırar. Beləliklə, müəllifin "Kim bu ibadətlərdən hər hansı birini Allahdan qeyrisinə yönəldərsə, o, kafirdir, müşrikdir" sözündən başa düşülür ki, nə vaxt kafir, müşrik olur? Ona hüccət qaldırıldıqdan sonra. Və bu da Əhli Sünnə alimləri arasında ittifaq olan bir məsələdir.

***("Üç əsasın şərhi", 9-cu kaset) -*** Və bütün bu nəqllərdən sonra artıq oxuculara bəyan oldu ki, məsələ heç də bəzilərinin iddia etdiyi kimi cahilliyin üzrlü olmaması üzərində icma deyildir. Əksinə o alimlər ki, onlar bəzi insanlarda cahilliyi üzrlü görməmələri ilə tanınmışlar, onların özlərindən sənə açıq-aydın nəqllər gətirdik ki, elmsizliklə şirkə və ya küfrə düşən müsəlmanın təkfirində hətta əməlin şirk və ya küfr olması, əməl sahibi bunun üzərində ölərsə Allahın bunları bağışlamayacağı və onun da, Cəhənnəmdən heç vaxt çıxmayacağı ona bəyan olunanadək

tələsmək olmaz. Ola bilsin ki, o insanı kafir görməyə maneələr vardır. Bu maneələrdən cahillik, xəta, təvil etmək, məcburiyyət və sair halları sadalamaq olar.

Allah taalədən istəyirik ki, bizi daim doğruya yönəltsin, haqq əhli ilə birlikdə canımızı alsın və onlarla birlikdə diriltsin, həqiqətən onlar nə gözəl dostlardır.

Ey Allahım, Sən paksan, nöqsanlardan uzaqsan, şahidlik edirəm ki, Səndən başqa ibadətə layiq haqq məbud yoxdur və Səndən bağışlanma diləyir və Sənə tövbə edirəm.

إِنْ أُرِيدُ إِلَّا الْإِصْلَاحَ مَا اسْتَطَعْتُ وَمَا تَوْفِيقِي إِلَّا بِاللَّهِ عَلَيْهِ تَوَكَّلْتُ وَإِلَيْهِ أُنِيبُ

***Mən ancaq bacardığım qədər islah etmək istəyirəm. Mənim müvəffəqiyyətim yalnız Allahın köməyilədir. Mən yalnız Ona təvəkkül edir və yalnız Ona üz tuturam. (Hud surəsi,88)***

Kitabı yoxlayıb, sona çatdım - yer üzünün ən xeyirli yeri olan Məkkə əl-Mukərramə şəhəri, hicri təqvimi ilə 1436/6/11 və miladi təqvimi ilə 31.03.2015-ci ildə zöhr vaxtı.

# MÜNDƏRICAT